SAİB TƏBRİZİ



# SEÇİLMİŞ ƏSƏRLƏRİ

"ÖNDƏR NƏŞRİYYAT"
BAKI-2004



*Bu kitab "Saib Təbrizi. Seçilmiş əsərləri" (Bakı, Yazıçı, 1980) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Azərbaycanca şeirlərin tərtibçisi, qəzəllərin, qəsidələrin, təkbeytlərin fars dilindən tərcüməçisi, ön sözün, çıxarışların və şərhlərin müəllifi: **Balaş Azəroğlu**

Redaktoru: **Məmməd Adilov**

**894.361'1 - dc 21**
**AZE**
**Saib Təbrizi. Seçilmiş əsərləri.** Bakı, "Öndər nəşriyyat", 2004, 256 səh.

Oxuculara təqdim edilən bu kitab qüdrətli Azərbaycan şairi Saib Təbrizinin (1601–1676) zəmanəmizə gəlib çatmış bədii irsinin yalnız bir hissəsini əhatə edir. Şair öz əsərlərini Azərbaycan və fars dillərində yazmış, xüsusən farsdilli poeziyanın sonrakı inkişafına güclü təsir göstərmiş, onun yeni məzmun qazanmasında, mövzu və obrazlar sisteminin zənginləşdirilməsində çox böyük rol oynamışdır. Saibin təsirinə qapılan çoxsaylı klassik ədiblər, orta əsr filoloqları və müasir alimlər şairin yaradıcılığını yüksək qiymətləndirmiş, onun böyük və qüdrətli ədib olduğunu etiraf etmişlər.

**ISBN 9952-416-02-3**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## SAİB ƏSƏRLƏRİNİN YENİ NƏŞRİ

YUNESKO tərəfindən yubileyi beynəlxalq miqyasda qeyd edilmiş qüdrətli Azərbaycan şairlərindən biri də Xaqani, Nizami, Nəsimi, xüsusən Füzuli ədəbi məktəbinin davamçısı Mirzə Məhəmmədəli Mirzə Əbdürrəhim oğlu Saib Təbrizidir.

Tədqiqatlar nəticəsində Saib Təbrizinin təqribən 300 min misra şeir yazdığı müəyyənləşdirilmişdir. 1975-ci ildə Hindistanın Lakhnau şəhərinin əlyazmalar xəzinəsindən şairin 230 min misradan artıq şeirinin köçürüldüyü əlyazma nüsxəsi tapılmışdır.

Saib Təbrizi bütün yaradıcılığı ərzində çoxsaylı qəsidələr, rübailər, qitələr, məsnəvilər və nəsr əsərləri yazsa da, Azərbaycan ədəbiyyatı tarixinə məhz müqtədir qəzəl ustası kimi daxil olmuşdur. Onun "Qəndəharnamə" məsnəvisi Azərbaycan ədəbiyyatında epik şeirin qiymətli nümunələrindən biri sayılır. Şairin müxtəlif mənbələrdə göstərilən "Mahmud və Ayaz" məsnəvisi isə dövrümüzə gəlib çatmamışdır. Saib Təbrizi həm də Azərbaycan ədəbiyyatı tarixi üçün qiymətli mənbələrdən sayılan "Səfinei-Saib" adlı cüngün tərtibçisidir.

Saib Təbrizinin yaradıcılığı Azərbaycanda, həmçinin İranda, Türkiyədə, Orta Asiya ellərində, Əfqanıstanda və Hindistanda farsdilli və türkdilli ədəbiyyatın inkişafına mühüm təsir göstərmişdir.

Azərbaycanda Saib Təbrizinin yaradıcılığına həmişə böyük maraq göstərilmiş, əsərlərinin üzü dəfələrlə köçürülmüşdür. Təsadüfi deyildir ki, Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda şairin peşəkar xəttatlar tərəfindən köçürülmüş divanının M-135, M-232, S-4 və S-12 şifrələri altında 4 mükəmməl nüsxəsi saxlanılır. Saib şeirlərinin ayrı-ayrı nümunələri çoxsaylı cünglərdə də qeydə alınmışdır.

Ötən əsrdə Azərbaycan alim və tədqiqatçıları Saib Təbrizinin yaradıcılığının öyrənilməsi və nəşri işinə də diqqət yetirmişlər. Müharibənin yenicə qurtardığı 1945-ci ildə Bakıda Saib Təbrizinin həyat və yaradıcılığına həsr edilmiş təntənəli ədəbi-bədii gecə keçirilmiş, böyük şair Səməd Vurğun burada giriş nitqi söyləmiş, şərqşünas, alim Həmid Araslı "Saib Təbrizinin həyat və yaradıcılığı" mövzusunda məruzə etmiş, bu tədbirin nəticəsi olaraq, şairin Leninqrad Dövlət Universitetinin Kitabxanasında tapılmış əlyazması əsasında Azərbaycan dilində 17 qəzəli, 1946-cı ildə Azərbaycanın İranla Mədəni Əlaqə Cəmiyyəti xətti ilə ilk dəfə (əski əlifbada) nəşr edilmişdir.



Sonrakı dövrdə Saib Təbrizi haqqında elmi işlərin yazılması və əsərlərinin nəşr edilməsi daha da genişləndirilmiş, bununla şairin adı Azərbaycan ədəbiyyatı tarixində özünə layiqli yer tutmuşdur. Xüsusən şair-alim Balaş Azəroğlunun Saib Təbrizinin sənət dünyası üzrə yazdığı doktorluq və Məsiağa Məhəmmədinin şairin farsdilli irsi əsasında yazdığı namizədlik dissertasiyaları, qüdrətli sənətkarın yaradıcılığının öyrənilməsində nəzərəçarpacaq addım olmuş, həmin tədqiqatların əsasında B.Azəroğlu 1980-ci ildə "Saib Təbrizinin sənət dünyası", M.Məhəmmədi isə 1994-cü ildə "Saib Təbrizi və farsdilli poeziyada hind üslubu" monoqrafiyalarını nəşr etdirmişlər.

Saib Təbrizinin anadilli və farsdilli yaradıcılığının böyük bir hissəsini özündə əhatə edən "Seçilmiş əsərləri" 1980-ci ildə "Yazıçı" nəşriyyatı tərəfindən buraxılmışdır. Kitabı Əlyazmalar İnstitutunda mühafizə edilən M-135 nüsxəsi əsasında nəşrə hazırlayan filologiya elmləri doktoru Balaş Azəroğlu ona ön söz yazmış, şairin anadilli şeirlərini 1946-cı il nəşri əsasında transfoneliterasiya etmiş, əlyazmadakı farsdilli şeirlərini isə Azərbaycan dilinə tərcümə etmişdir. Həmin kitab şair-alim, filologiya elmləri doktoru Söhrab Tahirin redaktəsilə nəşr olunmuşdur.

Respublika Prezidenti İlham Əliyev cənablarının xüsusi sərəncamına müvafiq təqdim edilən bu kitab 1980-ci il nəşri əsasında yeni redaktə ilə hazırlanmışdır.

*Məmməd ADİLOV*

# ÖN SÖZ

Məhəmmədəli Saib Təbrizi XVII əsrdə yaşamış, görkəmli Azərbaycan şairidir. Bu mütəfəkkir sənətkar hələ öz sağlığında İranda, Hindistanda, Əfqanıstanda və Türkiyədə məşhur olmuş və həmin xalqların ədəbiyyatına böyük təsir göstərmişdir.

Saib Təbrizi ilk gənclik illərini öz doğma şəhəri Təbrizdə keçirmiş, sonra müəyyən fasilələrlə yuxarıda adları çəkilən ölkələrə səfər etmiş, həmin yerlərdə yazıb-yaratmış və nəhayət, İsfahan şəhərinə qayıdıb, ömrünün axırına qədər orada yaşamışdır.

Tarixi həqiqətə görə, XVI əsrin sonu – XVII əsrin birinci yarısı Azərbaycan həyatında ən ağır və keşməkeşli bir dövr olmuşdur.

Səfəvi hökmdarlarından Şah Təhmasibin (1524-1576) dövründən başlayıb, I Şah Abbasın (1587-1629) hakimiyyəti boyu davam edən müharibələr, yarım əsrdən artıq bir müddəti (1576-1629) əhatə etmişdir. Bu illər ərzində ardı-arası kəsilməyən vuruşlar zamanı Azərbaycanın bir çox vilayət və şəhərləri dəfələrlə əldən-ələ keçmiş, xarabaya çevrilmiş, iqtisadiyyatı pozulmuşdur.

Ölkənin başqa şəhərlərindən daha artıq Təbriz şəhəri basqın və hücumlara məruz qalmışdı. Azərbaycan tarixçisi İskəndər Münşinin "Tarixi-aləmarayi-Abbasi" əsərində yazdığından aydın olur ki, bu müharibələr zamanı Təbriz hər iki tərəfdən dağıdılırdı. Osmanlı sultanları şəhəri işğal edərkən, uçurub xaraba qoyduqları binaların daşlarından sonralar özləri üçün yeni evlər, hamamlar, karvansaralar və qalalar inşa edirdilər. Şah qoşunları şəhəri geri alanda I Şah Abbasın əmri ilə osmanlıların tikdikləri bütün binalar dağıdılırdı. Çünki "Şah rumlulardan qalmış heç bir yadigarı görmək istəmirdi".

Beləliklə, əldən-ələ keçdikcə daha artıq xarabaya çevrilən Təbrizin əhalisi, Şah Abbasın əmri ilə dəstə-dəstə ölkənin daxilinə köçürülməyə başlayır. Köçürülənlərin böyük bir hissəsi İsfahanın yaxınlığında salınmış Abbasabada gətirilir. Məhəmmədəli Tərbiyət özünün "Danişməndani-Azərbaycan" təzkirəsində göstərir ki, sonralar burada yaşayan əhaliyə uzun müddət "Abbasabad təbrizliləri" deyirmişlər.

Bu zaman ölkənin mədəni həyatında da ağır günlər idi. Şəhərlərdəki tarixi abidələr dağıdılır, kitabxanalar qarət olunur, sənət əsərləri məhv edilirdi. Ədəbiyyat, elm və incəsənətin müxtəlif sahələrində çalışan şair, alim və sə-



nətkarların sağ qalanlarının bir qismi Türkiyəyə aparılır, bir qismi də Şah Abbasın fərmanı ilə İsfahana və İranın başqa şəhərlərinə köçürülürdü.

Bu dövrdə Azərbaycanda doğma dildə yaranan ədəbiyyatın əsas ideya, məzmun və təsvir vasitələri xalq ədəbiyyatından, aşıq poeziyasından qidalanmaqda idi. XVII əsr Azərbaycan ədəbiyyatının ideya və bədii xüsusiyyətlərini Məsihi, Qövsi Təbrizi, Saib Təbrizi kimi şairlərin şeirləri ilə yanaşı, Tufarqanlı Aşıq Abbas, Sarı Aşıq, Xəstə Qasım kimi aşıqların qoşma, bayatı və gəraylıları, "Aşıq Qərib", "Şah İsmayıl" kimi məhəbbət, "Koroğlu" kimi qəhrəmanlıq dastanları müəyyən edirdi.

Belə keşməkeşli həyatda və ziddiyyətli ədəbi mühitdə yetişmiş Saib Təbrizinin dünyagörüşü, ictimai-fəlsəfi fikirləri və ədəbiyyat aləmindəki axtarışları dövrün fikir toqquşmalarından, həm də ədəbi qaynaqlardan qidalanmaqda idi. Saib yaradıcılığında bəzən dərin, bəzən də ötəri izlər buraxmış bu təsirləri hərtərəfli öyrənmədən, şairin yaradıcılığını layiqincə qiymətləndirmək mümkün deyildir.

* * *

Məhəmmədəli Saib 1601-ci ildə Təbriz şəhərində anadan olmuşdur. Atası Mirzə Əbdürrəhim tacir, əmisi Şəmsəddin Sani isə gözəl dərzi idi. Saibin də ailəsi Şah Abbasın əmrilə Təbrizdən İsfahana göçürülmüşdü. Bəzi tədqiqatlardan və şairin öz əsərlərindən də məlum olur ki, ailəsi Təbrizdən İsfahana köçürülərkən Saib sənət aləminə öz səsi və nəfəsi ilə gəlmiş gənc bir şair olmuşdur.

Saib İsfahana köçəndən sonra dövrünün tanınmış alimlərindən olan Kaşi və Şəfainin yanında təhsilini davam etdirmişdir. Mükəmməl təhsil almış mütəfəkkir şair az sonra özü də elm və mərifət sahibi kimi tanınmağa başlayır.

Onun ilk səfəri Ərəbistana – Məkkə və Mədinə şəhərlərinə olmuş, oradan Türkiyəyə gedib, yenidən İsfahana qayıtmışdır. Bu səfər zamanı Saib o ölkələrin alim, şair və qabaqcıl fikir adamları ilə görüşmüşdür. Həmin görüşlər gənc Saibin yaradıcılığına müsbət təsir etdiyi kimi, onun şeirləri də bu ölkələrin ədəbiyyatına, xüsusilə türk ədəbiyyatına çox böyük təsir göstərmişdir. Məşhur türk alimi Müəllim Naci yazır ki, Saib Təbrizinin kitabından uzun müddət məktəblərdə dərslik kimi istifadə olunmuşdur.

Saib hələ səfərdə ikən saraya yaxın olan bəzi bədxahlar və məddah şairlər onu Şah Abbasın gözündən salmağa çalışmışlar. Belə ki, İsfahana qayıdan şair sarayın ona qarşı laqeydliyini və ədəbi mühitin qeyri-səmimiliyini hiss etmiş və yenidən İsfahanı tərk etmək qərarına gəlmişdir. Saib 1625-ci ildə Hindistana köçür. O öz narazılığını aşağıdakı beytlərdə belə əks etdirmişdir:

*Tez ol, saqi, gətir cami, qızıl rəngindədir hər yan,*
*Payız yarpaqları geysin əlinlə zərli atlasdan.*
*O qəflət əhli mümkünmü dura eşq əhlinə qarşı?*
*Oyadar xabi-qəflətdən həyatı, başlasa neysan.*
*Xəyalım gah bu dağda, gah o dağda məskən eylərdi,*
*Necə qızdırmadan xəstə dəyişər yastığın hər an.*
*Qiyamət qopsa dünyada, o insafsız xəbər tutmaz,*
*Ona təsir edərmi heç bu qəlbin etdiyi əfğan?..*
*Nə ləl vardı, nə də gövhər gedəndə İsfahandan sən,*
*Özünlə şeir apar, Saib, bəzənsin sözlə Hindistan.*

Qəzəldən göründüyü kimi, şair həm ictimai mühitdən, həm də şahdan narazıdır. Saib özünü "eşq əhli", yəni həqiqəti, sənəti sevən, hökmdarı isə "qəflət əhli" adlandırır. Qəzəlin axırıncı beytindən məlum olur ki, Saib Hindistana hər şeydən əvvəl incik qəlbini, bir də qiymətli şeirlərini aparır.

Saib İsfahandan Herata, oradan da Kabilə getmişdir. O zaman Kabil şəhərinin hökmdarı Mirzə Əhsənullah Nəvvab idi. Zəfər xan ləqəbi ilə məşhur olan bu şəxs bəzən "Əhsən" imzası ilə şeirlər də yazırdı. O, Saibi böyük hörmətlə qəbul edir və öz sarayında qonaq saxlayır.

Saib Kabildə yazdığı qəsidələrində dəfələrlə Zəfər xanın ədalətindən, səxavətindən söhbət açmışdır. Zəfər xan da öz qəzəllərində dönə-dönə Saib üslubunda şeirlər yazdığını iftixarla qeyd etmiş, onu özünün ustadı adlandırmışdır.

1630-cu ildə Zəfər xan Şah Cahanı təbrik etmək üçün Dəkənə gedərkən Saibi də özü ilə aparır. Şah Cahan böyük şairi hörmətlə qəbul edir, ona fəxri ad və ənam verir.

Saib Zəfər xanla Hanpurda olduqları vaxt atasının onun ardınca Əkbərabada gəldiyini eşidir və hökmdardan ona atası ilə birlikdə İsfahana qayıtmasına icazə verməsini xahiş edir. Şairin şəxsiyyətinə və sənətinə sonsuz hörmət bəsləyən Zəfər xan ondan ayrılmaq istəmir.

1633-cü ildə Zəfər xan Kəşmir hökmdarı təyin olunur. Bu zaman o istər-istəməz şairin vətənə qayıtmasına icazə verir.

Saib Hindistanda olarkən yazdığı şeirlərdə ona bəslənən sonsuz hörmət və qayğıdan söhbət açdığı kimi, qürbətin onun şair qəlbini sıxan əzablarından, vətən həsrətindən də ürək yanğısı ilə danışmışdır.

*Gözüm qalan deyildir mülkü malında Hindin,*
*Toz-torpağa bələndim mən ki yolunda Hindin.*
*Ey sürmələr diyarı,* fəryadıma haray ver,*
*Sümüyüm oldu sürmə qeylü qalında Hindin.*

Saib İrana qayıdandan sonra yenidən səfərə çıxır. Məşhəd, Qum, Qəzvin, Yəzd, Ərdəbil və Təbriz şəhərlərini gəzir. Bu zaman Təbrizdə olan türk səyyahı Övliya Çələbi Təbrizdə görüb tanış olduğu şairlər sırasında Saibin də adını çəkir.



Saib Təbrizi İsfahana qayıdandan sonra II Şah Abbas (1642-1666) tərəfindən hörmətlə qarşılanır və saraya dəvət olunub, məliküşşüəra təyin edilir.

Saib Təbrizi bu dövrdə özünün hikmətamiz və fəlsəfi şeirlərilə saray şairlərinin və saraydan kənardakı şairlərin yaradıcılığına istiqamət verir. Bütün İran tədqiqatçılarının dövrün mütərəqqi ədəbi cərəyanı kimi qiymətləndirdikləri "İsfahan səbki"nin bir ədəbi üslub kimi inkişaf etməsində Saibin çox böyük rolu olmuşdur.

Saib sarayda yaşadığı dövrdə lirik şeirlərlə yanaşı, qəsidələr də yazmışdır. Qəndəhar müharibəsinə həsr etdiyi poema isə onun sarayda yazdığı ən məşhur əsəri hesab edilir.

II Şah Abbasdan sonra oğlu Səfi mirzə Şah Süleyman (1666-1694) adı ilə taxta çıxır. Şah Abbas zamanı Saibin yüksək hörmətə çatdığını gözləri götürməyən bədxahlar Şah Süleymanın yanında şairi hörmətdən salmağa çalışırlar. Şah tərəfindən sənətinə etinasızlıq görən Saib sarayla əlaqəsini tamam kəsir. Ömrünün son illərini yaşayan qoca şair bu illərdə əsərlərini nizama salmaqla məşğul olur, müxtəlif divanlarda toplanmış şeirlərini mövzu üzrə seçərək ayrı-ayrı adlar altında tərtib edir. Gözəllərin vəsfinə həsr etdiyi məhəbbət lirikasına "Miratül-cəmal", ziynət və mədhdən bəhs edən şeirlərinə "Arayişi-nigar", təkbeyt, qitə, rübai və müxtəlif şeir parçaları toplanan müntəxəbatına "Vacibül-hifz" adlarını verir.

Zəngin ədəbi irs qoyub getmiş Saibin əsərlərinin sayı haqqında təzkirəçilərin və tədqiqatçıların verdiyi məlumatlarda şairin 300 min beytə qədər əsəri olduğu qeyd edilir.

Görkəmli Azərbaycan alimi Məhəmmədəli Tərbiyət "Danişməndani-Azərbaycan" əsərində Saibdən danışarkən onun 120 min beytlik divanını şəxsən gördüyünü qeyd edir. Bizim daha dəqiq hesab etdiyimiz Tərbiyətin bu məlumatına şairin hələlik əldə edilməmiş "Qəndəharnamə" poemasını və "Mahmud və Ayaz" adlı əsərini də əlavə etmək lazımdır.

Saib Təbrizi öz şeirlərilə yanaşı, istər sələflərindən, istərsə də müasirlərindən bəyənib seçdiyi 800 şairin şeirindən 25 min beytlik bir gülçin hazırlamışdır ki, bu kitab "Səfineyi-Saib" adı ilə məşhurdur.

Ömrünü şeirə, sənətə həsr etmiş, yarım əsrdən artıq yaradıcılıq yolu keçmiş Saib Təbrizi 1676-cı ildə İsfahan şəhərində vəfat etmişdir.

İsfahanda məşhur "Saib təkyəsi"ndə dəfn olunmuş bu böyük sənətkarın qəbri uzun illər gözdən-nəzərdən uzaqda qalmışdı. Son illər ədəbi ictimaiyyətin səyi nəticəsində şairin qəbri tapılıb, ölümünün 300 illiyi münasibətilə yenidən bina edilmişdir.

Təzkirəçilərin verdiyi məlumatdan aydın olur ki, Saib xoşxasiyyət, mülayim təbiətli, möhtərəm bir şəxs olmuş, lakin eyni zamanda məclislərdə hazırcavab, bədahətən şeir deyən, müşairəni sevən bir sənətkar kimi də şöhrət qazanmışdır.

Saib Təbrizinin ölümü ədəbiyyat aləmində böyük bir itki olmuş, onun müasirləri bu böyük ustadın vəfatına mərsiyələr yazmış, təzkirəçilər və ədəbiyyatşünaslar onun sənəti qarşısında öz heyranlıqlarını gizlədə bilməmişlər. Şair haqqında ilk sözü onun müasirləri söyləmişlər.

Məşhur təzkirəçi Nəsrabadi Saibin şeirlərinin şöhrətinin ölkələrə yayılmasını günəşin nurunun kainata yayılmasına oxşatmışdır. "Səfinə" əsərinin müəllifi Xoşqu Saib Təbrizidən danışarkən yazmışdır: "Allah-təala Rüstəmi-Zalı zor sahibi, Saibi söz sahibi yaratmışdır". Qulaməli Azad Saib Təbrizini şeirin dördüncü peyğəmbəri, məşhur çex alimi Yan Ripka isə Sədi və Hafizdən sonra Saibi şeirin ən böyük nümayəndəsi hesab etmişlər. Görkəmli rus şərqşünaslarından A.Krımski Saibi XVII əsr İran şairlərinin müəllimi, Y.E.Bertels isə XVII əsrin Hafizi adlandırmışlar. Hind alimi Şibli Neman onu İranın axırıncı böyük şairi kimi qiymətləndirmişdir. Azərbaycan alimi akademik Həmid Araslı Saib poeziyasını dahi Füzulinin şeirləri ilə müqayisə etmiş və Azərbaycanın bu iki sənətkarının yaradıcılığında yüksək sənətkarlıq cəhətindən bir yaxınlıq görmüşdür.

Adlarını çəkdiyimiz alim və təzkirəçilərdən başqa, İsmayıl Hikmət, Naci, Vəliqulu bəy Şamlu, H.Kəmali, Vəhid Dəstgirdi, Ə.Dehxuda, Dəstqeyb, Arif Şirazi, Məhəmməd Əfzəl Sərxoş, Mövlana Məhəmməd Möhsün Feyz, Cuya Təbrizi, E.Braun, Rio, Herman Ete Gibb, H.Bicari və b. Saib Təbrizi haqqında yüksək qiymətli fikirlər söyləmişlər.

* * *

Məhəmmədəli Saib Təbrizi iki dildə şeir yazan görkəmli Azərbaycan şairlərindəndir. Şairin azərbaycanca yazdığı qəzəlləri ilə yanaşı, fars dilində yaratdığı sənət inciləri XVII əsrin farsdilli poeziyasının ən yaxşı nümunələri olduğundan Saibi eyni zamanda İran ədəbiyyatının da görkəmli nümayəndəsi hesab edirlər.

Saib Təbrizi yaradıcılığından danışan alimlər onun yeni söz demək tərzindən, fikir orijinallığından və üslub xüsusiyyətlərindən ayrıca danışmış, şairin bu cəhətlərini sənətkarlıq nailiyyətlərindən hesab etmişlər.

Saib vətəni Təbrizdən ayrılıb uzun illər İsfahanda və qürbət ölkələrdə yaşadığı müddətdə, həmin ölkələrdə ədəbi-ictimai fikrin inkişafına böyük təsir göstərmişdir. Buna baxmayaraq, Saib həmişə Təbrizin havası ilə qanadlanmış, bu gözəl şəhərin adını iftixarla çəkmiş, ona mənsub olduğu üçün fəxr etmişdir:

*Sədi əgər Şirazın boz qumundan yarandı,*
*Saib doğdu Təbrizin müqəddəs torpağından.*

Şair qürbət ellərdə olarkən Təbrizdə keçirdiyi xoşbəxt günlərini, ömrünün bahar çağlarını həsrətlə xatırlamışdır:

*O bahar ömrümüzün günləri düşdükcə yada,*
*Saibin fikri gəzər Təbrizin o cənnətini.*

Saib ədəbiyyat aləmindəki müvəffəqiyyətlərini bu doğma şəhərin adı ilə bağlamış, "Saib, sən gözəl təbinlə Təbrizi şəhərlər içrə başuca etmisən" deyərək doğma anası qarşısında iftixarla hesabat verən təvazökar bir oğlu xatırlatmışdır.

Şair Hindistanda olarkən İsfahana qayıtmağı arzuladığı kimi, İsfahan şəhərində də həmişə Təbrizi arzulamışdır. Çünki İsfahanda Saib nə qədər gözəl şeirlər yazsa da, özünə və sənətinə qarşı bir laqeydlik və qayğısızlıq hiss edib narahat olmuşdur:

*Saibin şeiri verir indi bütün gözlərə nur,*
*Görməmişdir belə bir sürmə İsfahan yuxuda.*

Fəqət gözlərə nur verən bu sənətkar İsfahanda özünü "ətək altında saxlanan çırağ"a bənzədir.

Saib yaxşı bilirdi ki, onun günəş kimi parlaq sənətini pərdələmək, odalov saçan şeirlərinin səsini batırmaq mümkün deyildir. Odur ki, yazırdı:

*Küllə məni örtmək diləyən sadədil insan,*
*Çaxmaq daşını parçalayan şölələrim var.*

Saib qürbət ölkələri dolaşandan sonra keçirdiyi iztirabları, çəkdiyi sıxıntıları aşağıdakı beytində ümumiləşdirmişdir:

*Qürbətə bağlama bel, tərk eləmə tez vətəni,*
*Hər quşa öz yuvası, hər kişiyə öz vətəni.*

Şairin sənətə-ədəbiyyata olan atəşin məhəbbəti onun yenilik axtarışları ilə vəhdət təşkil edərək, yaradıcılığını həmişə inkişaf edən bir xətt ilə irəli

aparmışdır. Saib İran ədəbiyyatında böyük sənətkarlar tərəfindən salınmış və ona qədər çoxlarının tapdalayıb keçdiyi yolla getmək istəməmişdir. Böyük tarixə malik olan Şərqin zəngin ədəbiyyatında yeni cığır açmaq qüdrətini özündə hiss edən şair öz arzularını əməli fəaliyyəti ilə həyata keçirmişdir.

Saibin zəngin ədəbi irsini nəzərdən keçirdikdə onun doğma ənənələrlə bağlı olması ilə yanaşı, özünün aşağıdakı beytdə dediyi sözlər təqlid və təkrardan nə qədər uzaq olduğunu göstərir:

*Nə qədər təqlid ilə eyni yolu getmək olar?*
*Körpə quş uçsa, onun çox uzaq olmaz səfəri.*

Saib Təbrizi poeziya aləmində ilk qanad açdığı gündən daha yüksəkliyə uçmaq arzusunda olmuşdur. Yeri gəlmişkən qeyd edək ki, onun mütəfəkkir və novator bir şair kimi yetişməsində Azərbaycan şifahi xalq ədəbiyyatı ilə klassik poeziyanın qabaqcıl ənənələrinin çox mühüm və inkaredilməz rolu vardır.

Saib Təbrizi Qətran Təbrizi, Xaqani və Nizami ənənələri üzərində yüksəlib inkişaf etmişdir. Azərbaycan dilində yazdığı şeirləri onu Füzuli poeziyasına daha çox yaxınlaşdırmaqdadır. Bu ona insan taleyini və ictimai həyatın ziddiyyətlərini daha dərindən dərk etmək imkanı vermişdir.

Saib Təbrizi farsdilli poeziyanın da dahilərini həmişə qiymətləndirmiş, qəzəllərində Sədinin, Hafizin, Mövləvinin, Əttarın və b. adlarını hörmətlə yad etmiş və onlardan təsirləndiyini söyləmişdir.

Şeirlərinin hər beytində bir dünya məna gəzdirən şairin ədəbiyyat aləmindəki müvəffəqiyyətinin əsas amili şeiri daha da kütləviləşdirməsindən, anlaşıqlı etməsindən ibarət idi. Xalq ədəbiyyatından, atalar sözlərindən, zərbül-məsəllərdən geniş istifadə edən şair şeirlərini bacardıqca sadələşdirmək istəmişdir. Ancaq Saib şeirinin sadəliyi onun fikri vüsətinə, bədii ifadə tərzinə, romantikasına heç də xələl gətirmirdi, əksinə, bəlkə, onu daha da cilalayırdı. Saibin bədii təsvir vasitələri o qədər zəngin və rəngarəngdir ki, onu oxuyanlar heyran olmaya bilmirlər.

Saib yaradıcılığının məziyyətlərindən başlıcası onda yenilik ruhunun güclü olmasıdır. O özündən qabaq dönə-dönə işlənmiş, köhnəlmiş ifadə və təsvir vasitələrini rədd edib, şeirə yeni məzmun, yeni bədii vasitələr gətirmiş, onu daha da təravətləndirmişdir. Lakin bu yolda şairi bəyənənlərlə yanaşı, rədd edənlər də olmuşdur. Bununla belə, heç kəs böyük bir həqiqəti inkar edə bilməmişdir ki, Saib XVII əsrdə yeni bir üslubun yaradıcılarındandır.

Saib Təbrizinin başçılıq etdiyi bu ədəbi cərəyan İranda "İsfahan səbki", Hindistanda "Hind məktəbi" adı ilə məşhurdur.

Qeyd etmək lazımdır ki, ədəbiyyatda gedən hər yeniləşmə, heç şübhəsiz, əvvəlcə ayrı-ayrı şairlərin üslubunda təzahür edir, sonra bütün ədəbiyyatda



yeni bir cərəyanın meydana gəlməsinə səbəb olur. İranda Saiblə yanaşı, dövrün ən qüdrətli sənətkarları Nəziri Nişapuri, Ürfi Şirazi, Talıb Amuli, Zəhuri Tərşidi, Vəhşi Yəzdi və b. öz əsərlərini yeni üslubda yazmışlar. Hindistanda İrandan mühacirət etmiş bir sıra mütərəqqi ruhlu sənətkarlarla yanaşı, Hindistanın, Əfqanıstanın və Orta Asiyanın da qüdrətli söz ustalarının "Hind məktəbi"nin inkişafında böyük rolu olmuşdur. Yeri gəlmişkən qeyd edək ki, təzkirəçilər çox zaman "Hind məktəbi"ni "Saib məktəbi" də adlandırmışlar.

Saib Təbrizi özü də yeni üslubda şeir yazması ilə fəxr edir və sözünün qüdrətini, şeirlərinin sevilməsinin əsas səbəbini məhz təzə səbkidə əsərlər yazmasında görür və qəzəllərində ara-sıra buna işarə edir:

*Bu sənə fəxridi şairlər içrə, Saib, sən*
*Təzə bir tərzdə dür tökmədəsən təbindən.*

Saib başqa bir şeirində təzə üslubun məhz onun tərəfindən yarandığını bir sənətkar qüruru ilə qeyd edir:

*Bu məhəbbət söhbətin mən cahana salmışam,*
*Səbkimin ülgüc dilin çünki əyana salmışam.*

XVII əsrdə bütün Şərq ədəbiyyatında yeni mütərəqqi cərəyan kimi şöhrətlənmiş "Hind məktəbi"nin təbliğ etdiyi ideya, dövrün qabaqcıl fəlsəfəsi olan panteizmlə bağlı idi. Şərq ədəbiyyatında dərin kökləri olan humanizm – insana məhəbbət bu ədəbiyyatın aparıcı xətlərindən biri olmuşdur.

Yeni ədəbiyyatda çox bariz şəkildə meydana çıxan və bir sıra təəssübkeş alimləri qane etməyən cəhət poeziyanın baş qəhrəmanlarının əvəz olunması idi: "yüksək şəxslər"in həyatının təsviri, şəxsiyyətin tərənnümü əvəzinə, poeziyaya şəhər əhlinin həyatı gəlmişdi. Bu da poeziyanın məzmununun kütləviləşməsinə az təsir göstərmirdi.

Poeziyada dilin lüğət tərkibi də xeyli dəyişmişdi, bədii ifadə və təsvir vasitələrində də yeniləşmə var idi. Təzə mövzu və məzmun özü ilə poeziyaya təzə epitetlər gətirirdi. Çünki poeziyada yeni üslubun meydana gəlməsinin bir səbəbi də köhnə poetik konsepsiyanın öz daxili möhkəmliyini saxlaya bilməməsi idi. Şeirə canlı danışıq dili, atalar sözləri, məsəl və rəvayətlər gəlirdi. Geniş xalq kütləsinə yaxınlıq şeiri bir sıra fikir dolaşıqlığından, məfhum girbabından və mücərrədçilikdən azad edir, onu sadələşdirirdi. Saib Təbrizi bu haqda yazırdı:

*Sadə şeir aşiqitək düşmədəyəm dillərə mən,*
*Yeri var, körpə laçın uçmağa iqdam eyləyər.*

İctimai həyata fəal münasibət, hökmdarların tənqidi, fikrin yığcam, aforizm şəklində verilməsi bu üslub yaradıcılarının təsvir dairələrini daha da genişləndirirdi.

İstər Azərbaycanda və İranda, istərsə də Hindistanda bu yeni üslubda yaranan poeziyanın ən gözəl nümunələrini biz Saibin yaradıcılığında görürük.

* * *

Saib Təbrizi lirik şairdir. Orta əsrlər lirikası əsasən məhəbbət poeziyasıdır. Bu romantik poeziyada məhəbbət çoxşaxəli və geniş bir mövzudur. Onun həyatla, humanizmlə, dövrün fəlsəfi və ictimai fikri ilə bağlı müxtəlif qolları vardır ki, onları öyrənmədən şairin təfəkkür aləminə, şeirlərinin məna dərinliyinə varmaq mümkün deyildir.

Bu baxımdan Saibin divanını diqqətlə nəzərdən keçirən hər tədqiqatçıalim aydın görə bilər ki, bu usta şairin orijinal yaradıcılıq yolu, ictimai varlıq haqqında, insanlar haqqında yeni fikirləri, üslubu və ifadə xüsusiyyətləri vardır.

Saib öz lirikasının ruhuna və məzmununa görə xalq həyatı ilə bağlı bir şairdir. O, xalqdan öyrənməklə xalqın həyat tərzi haqqında da qiymətli fikirlər söyləmişdir.

Məhəbbət Saib Təbrizi poeziyasının həyat həqiqətlərini romantik ülviyyətlə qovuşduran qanaddır. Məhəbbət yalnız real zəmini olan təbii və həyati bir tələbdən ibarət deyil, eyni zamanda ülviyyət dərəcəsinə ucalan qeyri-adi bir vəziyyətdir.

Bütövlükdə orta əsrlər Şərq poeziyasında olduğu kimi, Saibin şeirlərində də məhəbbət insanın, təbiətin, varlığın daxilindəki nizam, həyatın qanunauyğunluğu, torpağın, suyun, asimanın vəhdəti deməkdir. Məhəbbət insanın zahiri gözəlliyi, daxili aləminin paklığı, humanizmi, kamilliyi, özünü dərk etməsi, qayğısı, həyat fəlsəfəsi, dünyaya bağlılığı, həm də sevib-sevilməsidir.

Məhəbbəti öz lirikasında belə hərtərəfli tərənnüm edən Saib bütün varlıqda məhəbbət görmüş və ona məhəbbət bəsləmişdir. Şairin fikrincə, həyatda məhəbbətsiz heç bir şey yarana bilməz. Çünki bütün varlığın mərkəzində ona həyat verən, onu yaşadan ülvi bir məhəbbət mövcuddur. Elə buna görədir ki, şair bizə yadigar qoyub getdiyi hər sözü, hər misranı sevə-sevə, odlu məhəbbətlə yaratmışdır. Şairin şeirlərini oxuyarkən adama elə gəlir ki, beytlərdə düzülmüş kəlmələr onun fikir aləmində tamamilə dəyişmiş, yeni məna kəsb etmişdir.

Biz Saibin böyük ədəbi irsində məhəbbətin müxtəlif şəkillərdə tərənnümünə rast gəlirik. Belə şeirlərdə şairin ruhən bağlı olduğu doğma Azərbaycan poeziyasının nəfəsi, orta əsrlər Şərq şeirinin mütərəqqi ənənələrinin təsiri hiss olunduğu kimi, Saibin özünəməxsus yenilik axtarışları da duyulmaqdadır.



Şərqin bütün böyük söz ustaları kimi, Saib Təbrizinin də məhəbbət lirikası orta əsrlər poeziyasının tərənnüm etdiyi məhəbbətin bir sıra əsas problemləri ilə sıx surətdə bağlıdır.

İstər kiçik həcmli lirik şeir parçalarında, istərsə vüsətli, geniş hadisələri əhatə edən epik əsərlərdə Şərqin böyük söz ustadları bu aləmin müxtəlif cəhətlərini qələmə almışlar.

Aydındır ki, məhəbbətin müxtəlif cəhətləri dedikdə biz heç də sevgililərin xarakterindən doğan sevgi hisslərinin müxtəlifliyini nəzərdə tutmuruq.

Bizim qeyri-adi hesab etdiyimiz ülvi məhəbbətin özü də adi bir şəkildə insanla bağlıdır. Çünki bu məhəbbət bir nəfərin (şairin) qəlbində, şüurunda cücərib inkişaf edərək romantik vüsət alsa belə, şairin başqa birisinin (lirik qəhrəmanın) halında görmək istədiyi real insanların (oxucuların) qəlbinə yol tapmaq, onları hərtərəfli inkişaf etdirmək arzusudur.

Biz əksər hallarda kiçik həcmli şeirlərdə lirik qəhrəmanın şairlə eyniləşdiyini görürük. Çünki bu əsərlərdə lirik qəhrəmanın dilindən deyilən sözlər şairin fikirlərini, düşüncə və arzularını ifadə edir. Deməк, lirik qəhrəman bir növ şairin hisslərinin, hadisələrə münasibətinin ümumiləşmiş obrazıdır.

Saib Təbrizinin də yaratdığı lirik qəhrəmanlar hicranın çətin, əzablı yollarında vüsala çatmaq üçün fədakarlıqla irəliləyirlər. Bu qəhrəmanlar üçün eşq olan yerdə cəfa ilə vəfa eyniləşir. Məşuqənin öz aşiqinə etdiyi cəfa onun vəfası üzündəndir. Fəqət, Saib qəhrəmanlarının məhəbbəti həmişə romantik olaraq qalmır.

Saib Təbrizi özünün ictimai ideyalarını, siyasi və humanist fikirlərini də məhəbbət qəzəllərində vermişdir.

Saib yazır ki, onun vəsf etdiyi gözəlliyin və ya təbliğ etdiyi fikirlərin mayası həyatdadır. Lakin şair real aləmdən aldıqlarına romantik vüsət verir, onları mübaliğə, təşbeh və başqa epitetlər vasitəsi ilə ziynətləndirir:

*On dörd gecəlik ay edərəm, bircə an sənin*
*Hüsnün görünsə gözlərimə bir hilal kimi.*

Şairin dünyəvi məhəbbəti tərənnüm edən lirikasının əhatə dairəsi çox genişdir. Bu məhəbbətin qayəsi sədaqət, fədakarlıq, başucalıq, inam, vəfa, minnət çəkmədən yaşamaq kimi bəşəri xasiyyətlərin təbliğidir:

*Tutma ol gül damənin məhşər günündə can üçün,*
*Qılma yüzsüzlük nigar ilən bir ovuc qan üçün.*

Saibin Azərbaycan dilində yazdığı bu qəzəlində lirik qəhrəmanın öz sevgisi yolunda fədakarlığı, daxili aləminin zənginliyi və qüruru sənətkarlıqla verilmişdir.

Şəxsiyyət azadlığı ideyası Saibin qəzəllərində müxtəlif deyim tərzi və obrazlı ifadələrlə əks olunmuşdur.

Şair həyatı dərin məhəbbətlə sevən qəhrəmanına yaşamaq üçün "pərgartək hər nöqtəyə baş əyib" alçalmağı qadağan edir. Çünki Saibə görə, "minnət ilə yaşamaq ölümdən betərdir". Qeyrətli adamlar "dərdlərinin dərmanı üçün" nakəslərə əl açmazlar. Şərabdan ötrü öz ixtiyarını əlindən verənlərdən heç nə gözləmək olmaz. Belə adamlar "özünü göstərsin deyə atını meydanda insafsızcasına çapıb öldürənlərə bənzəyirlər". Onlar "bir mədə şəraba görə" və ya "bir afərin" eşitməkdən ötrü "minnət kəməndini" boynuna salanlardır.

Saib didaktik şeirlərində də həyat və insanlar haqqında bu mövqedən çıxış edir. Bu şeirlərdə lirik şairlə mütəfəkkir şair vəhdət təşkil edir. Məhəbbət lirikası həyat fəlsəfəsindən qidalanır, oxucuda həm dərindən düşünmək, həm də mənaların daxilinə nüfuz etmək qabiliyyəti tərbiyə edir. Əyilməyi, minnətlə yaşamağı pisləyən şair, insanları dostluğa, qardaşlığa çağırır. Özü də bərk ayaqda, çətin gündə zəifləməyən, sınaqlardan çıxmış, sarsılmaq bilməyən bir dostluğa.

Gün dönəndə üzü dönən, qara gündə qaranlığa çəkilən vəfasız "dostlara" nifrət edən şair belə adamların qəlblərinin qaranlıq olduğunu, gecə quşu kimi həmişə günəşdən qaçdıqlarını söyləyir.

Saibə görə, insanın həyatda yarıtmaz və dargörüşlü olmasına başlıca səbəb onun cahilliyidir. Cəhalətin qaranlığında qalmış adamın ixtiyarı öz əlində olmur, onlar əqldən çox həvəsə tabe olurlar. Çünki "qaş qaralanda yarasalar cövlana gələrlər".

Saib Təbrizinin şeirlərində dövrünün ictimai, fəlsəfi və əxlaqi görüşləri öz əksini tapmışdır. Biz bu lirik parçalarda feodal cəmiyyətinin ziddiyyətlərini, haqsızlıq və zülmün müxtəlif şəkildə təzahürlərinin tənqidini görür və bunlara qarşı şairin həssaslığının şahidi oluruq. O, qəzəllərində tez-tez özünü həyat "karvanının önündə fəryad edən zəngə" oxşadır.

Şair fəryad çəkir ki, zəmanəsində nə haqq var, nə ədalət. Elmə, sənətə qiymət verən yoxdur, işrət məclislərində əyləşənlər "qəflətdə olanlardır, özünü dərk edənlər isə biçarələr...". Belə bir dövranda "hünər əhlinin baxtı asimandan qırmızı qar yağanda çiçəklənəcək".

Saib zəmanəsindən şikayətlənərək deyir ki: "Daş ürəklilərdən daşa dəyib kənara sıçrayan ox kimi qaçıram... Qəminə şərik olduqlarım ürəyimə qəm yükləyir, yollarından tikan götürdüklərim ayaqlarımı başıma qoyurlar..."

Bütün bunlar şairin öz dövrünün və zəmanəsinin hakim təbəqəsinə qarşı ucalan etiraz səsi idi. Saibin istədiyini, onun özünün dediyi kimi, "nə məscid, nə meyxana, nə də şahlar" verə bilməzdi.



*Varlılar hakim olan dövrandan insaf gözləmə,*
*Çün dəyirman fırlanır, zor altdakı daşa düşər.*

Belə həyat tərzi şairin qəlbini sıxır, onun varlığını sarsıdır, o, sinədolu nəfəs almaq və öz daxili aləmi ilə tənha qalmaq üçün geniş səhraya üz tutub getmək istəyir:

*Bu şəhər sıxdıqca, Saib, məndə taqət qalmadı,*
*Bir geniş səhra, yaşıl çöllük, biyaban istərəm.*

Saibin bu fikri Məcnunun insanlardan qaçıb "azadlıqda" yaşamaq fəlsəfəsi ilə səsləşir. Çünki Məcnunu səhraya qaçıran hicranın özündə də zəmanənin qəddarlığı vardı.

Lakin Saib sonrakı şeirlərində bu "yer dəyişmək" ideyasından əl çəkir. Çünki məkanı əvəz etmək "bir zindandan başqa zindana düşmək kimidir".

Saib həyatın ağırlığını, iqtidar adamlarının, yəni hökmdarlarının qəddarlığını yalnız bədii surətlərin və ya lirik qəhrəmanın dili ilə deməklə kifayətlənmir. O, böyük sələfi Nizami kimi, hökmdarı nəsihət yolu ilə ədalətli olmağa, rəiyyətlə yaxşı rəftar etməyə çağıran beytlər yazır, bəzən örtülü, bəzən də açıqcasına xatırladır ki, zülmlə hökmdarlıq etmək olmaz, çünki "rəiyyətə zülm edən hakim öz budunun ətindən kabab çəkən sərxoşa bənzər...", yəni sərxoş ayılandan sonra öz tutduğu əməlindən peşman olduğu kimi, hökmdar da etdiyi zülmün barını dadacaqdır.

Saibə görə, ürəklərdən kin-küdurət, paxıllıq hissləri çıxarılsa, hökmdarlar ədli, insafı özlərinə peşə etsələr, yer üzü cənnətə dönər.

Saib təkrar olaraq xatırladır ki, hakim təbəqənin ləyaqətsizliyi və kütbeyinliyi üzündən xalqın güzəranı ağır keçir. Adamlar ömürlərindən keçən hər günə təəssüf etmək əvəzinə, sevinirlər. Ölkədə köhnə ilin yola salınıb yeni ilin qarşılanması mərasimi də bunun nümunəsidir:

*İlimiz, günlərimiz gör nə qədər qəmli keçir,*
*Ömürdən hər ötən il millətə bayram sayılır.*

Lakin Saib dövrün hakiminə öyüd-nəsihət verməyin faydasız olduğunu gördükdə daha kəskin şeirlərlə çıxış edir. O, hökmdara xatırladır ki, xalq səndən sədəqə istəmir və sənin əlində topladığın iqtidar da, miknət də xalqındır. Siz onu geri qaytarırkən heç də fədakarlıq etmirsiz. Xalq hər şeyə qadirdir. O, xəsislərdən sədəqə istəməz, necə ki, "huma quşunun itin ağzından sümük alması mahal işdir".

Saib şahlara xatırladır ki, bu dünyaya çoxlu iqtidarlı adamlar gəlib-getmişlər, onların hakimiyyətlərini zəmanənin fırtınaları məhv etmişdir. Süleyman iqtidarına malik olan hökmdarların gözündə qarışqa timsalında görünən xalq isə yaşayır, özü də öz zəhmətinin bəhrəsi ilə yaşayır.

Saib şeirlərində dönə-dönə haqqı tapdalanan, ədalətsizlik görüb zülmə məruz qalan aşağı təbəqənin mənəvi cəhətdən zəngin, hətta fiziki cəhətdən də qüvvətli olduğunu yuxarı təbəqənin gözünə çəkir. Şair qəti olaraq inanırdı ki, haqq yol haqsızlıqdan intiqam alacaqdır. Yolundan çıxanları elə tapşırmaq, elin mühakiməsinə vermək lazımdır:

*Yol əgər haqdır, çəkər yolsuzdan axır intiqam,*
*Elə tapşır, çıxdılar yoldan əgər yoldaşlar.*

* * *

Saib Təbrizinin bir sıra şeirlərində rast gəldiyimiz "Ömür qısalığından ancaq qafillər şikayət edirlər..." və ya "Biz on günlük həyatdan cana gəlmişik, yazıq Xızır ömürlük olaraq bu zindanda qalacaq..." kimi bədbinlik əhvali-ruhiyyəsi heç də orta əsrlərin fəlsəfi görüşündən deyil, bəlkə, həyatdan, feodal-mütləqiyyət dünyasının ziddiyyətlərindən doğan əhvali-ruhiyyədir. Həm də bu bədbinlik hissi şairin yaradıcılığının mahiyyətini təşkil etmir. Çünki şair özü də dünyanı ziddiyyətləri ilə birlikdə sevir, ondan əl çəkməyin qeyri-mümkün olduğunu söyləyir.

Saib başqa bir şeirində bu kədərinin (həyatdan doymasının) mənasını açıq-aydın izah etmişdir:

*Çəkmə dar olsa əgər, yolçu da yoldan incir,*
*Bu cahandan məni yoxsulluğum incitdi axır.*

Mütəfəkkir şair həyat həqiqətlərinin daxili mənasını dərk etdiyindən narahat həyat sürür. Çünki hər şeyi görüb başa düşmək, onun mənasını açmaq Saib dövrünün hakim təbəqəsini narahat etdiyindən bir qəbahət, bir cürm sayılır. Şair özü demişkən, "bixəbərlik aləmi behişt imiş, yüz dəfə heyf olsun ki, biz gec xəbərdar olmuşuq...". Şairin bu fikrində çox incə, ancaq olduqca kəsərli bir istehza var: bixəbər olsan, həyat sənin üçün behiştdir, istər yüz il yaşa... elə ki, duydun, düşündün, görəcəksən ömür zindandır, yaşamaqdan cana gələcəksən.

*Bixəbərlik özü bir aləm imiş, bilməmişik,*
*Heyf, səd heyf ki, biz sonra xəbərdar olduq.*



Adamların huşyar olmamaları, hər şeyi dərk etməmələri, onların qəflət yuxusunda qalmaları isə yuxarı təbəqənin xeyrinədir. Saib deyir, "yetim uşaq kimi nənnimiz göz yaşında yırğalanıb, dayəmiz də qanımızı içərək bizi xamuş etmişdir". Fəqət mehribanlıq əvəzinə, dayəsindən, dövrün hakim təbəqəsindən zülm, əzab görənlərin, nənni yerinə göz yaşı içərisində böyüyənlərin nümayəndəsi olan şair heç zaman susmamışdır.

Beləliklə, rişəsi həyat həqiqətlərindən su içən Saib lirikasında məhəbbət mövzusu böyük bəşəri ideyaların təbliği ilə bağlıdır. Saib şeirində yalnız məhəbbət təbliğ və tərənnüm olunmaqdadır – insan məhəbbəti! Daxilən pak, zahirən gözəl, xislətən xeyirxah insanların məhəbbəti...

* * *

Saib Təbrizinin dünyagörüşünün formalaşmasında yaşadığı dövrün ictimai-fəlsəfi aləmi ilə mənsub olduğu ədəbi mühitin inkaredilməz təsiri olmuşdur.

Saibin ictimai həyata qarşı etirazlarının mayası dövrün hüquqsuzluğundan və ziddiyyətli şəraitindən gəlirsə, bu etirazın fəlsəfi fikir və nidaları Nəimi, Nəsimi, Şəbüstəri, Hafiz və Mövlana ənənələrindən gəlməkdədir.

Şair qeyd edir ki, onun canında həyat yolunu işıqlandıran bir nur var. Bu nur onun qəlbində, idrak aləmindədir. Demək olar ki, Saib ömrü boyu bu idrak aləminin işığında irəliləmişdir.

Saib Təbrizi əsrinin azad fikirli bir mütəfəkkiri kimi ictimai həyatda azadlıq – sərbəstlik axtarmışdır. Əgər belə olmasaydı, şair ümman kimi çalxalanmaz, narahat fikrinin dalğaları onu sahildən-sahilə çırpmazdı.

Şairi narahat edən daxili çəkişmələr, axtarışlar, təfəkkür aləmində qarşısına çıxan yığın-yığın sualların cavabını axtarmaq cəhdləri, onu bu yol ilə gətirib panteizmə, bütün ayrılıqların birləşdiyi ülvi eşqi dərk etməyə çıxarmışdır. Bu da Saibin bağlı olduğu hind ədəbi məktəbi üçün səciyyəvidir.

* * *

Hər hansı sənətkarın qüdrəti ilk növbədə onun sözə olan tələbkarlığı, ona nə dərəcədə sahib olması ilə müəyyənləşdirilir. Sözü seçmək, onu cilalamaq sənətkarlığın ilk əlamətidir. Çünki sözsüz ədəbiyyat olmadığı kimi, bütün sözlər də sənət materialı ola bilmir. Əsl şair öz fikirlərini oxucusuna daha aydın və təsirli çatdırmaq üçün sözün bədii təsirindən ustalıqla istifadə edir.

Saib Təbrizi böyük lirik şair kimi, demək olar ki, öz fikirlərini həmişə oxucularına obrazlı bir dildə çatdırmağa çalışmışdır. Onun bütün qəzəl və qəsidələrinin dili rəvan olub yüksək bədii epitetlərlə zəngindir.

Saibin poeziyasının rəğbətlə qarşılanmasının bir səbəbi də onun xalq dilindən istifadə etməsidir. Məlum məsələdir ki, bədii dil xalq dilinin inciləri hesabına təkmilləşir. Bu qaynaqdan yazılı ədəbiyyata yeni-yeni ifadələr, məsəllər, atalar sözləri axıb gəlir və bu Saibin də poeziyasına təsir etmişdir.

Saib, üslubuna uyğun olaraq, özündən əvvəl yazıb-yaratmış sənətkarların hamısından çox xalq məsəlləri, el sözləri işlətmişdir.

Saib Təbrizinin böyük sənətkarlıqla qələmə aldığı bəzi beytləri zərbülməsəl kimi dillərə düşmüşdür. Bu beytlərdə həyat hadisələri, insansevərlik, xarakterlər, dostluq, nəsihət və sair bəşəri fikirlər öz əksini tapmışdır. Aşağıdakı misala diqqət edək:

*Küçədə torpaq ilə oynayan o oğlana bax,*
*Kim ki, nadandı, bu dünya onu da oynadacaq.*

Adi həyat hadisəsindən çıxış edən şair insanları elmə, biliyə, özünü dərk etməyə, cəhalətdən, nadanlıqdan uzaqlaşmağa çağıran aforizmlər yaratmışdır. Başqa bir beytində özünü məzlum kimi göstərən zalımların necə qəddar olduqlarını göstərmişdir:

*Nərgiz kimi o gözlərə aldanma, amandır,*
*Məzlum görünən zalimin hər zülmü yamandır.*

Saib elmsiz, biliksiz, lovğa, paxıl insanları tənqid etmiş, onları düzgün yola, həyatı, insanları sevməyə dəvət etmişdir. Saibə görə, dünyanı bəzi adamların gözündə qiymətdən salan onların daxilindəki paxıllıq hissidir:

*Kim paxıllıq tozunu silsə ürəyindən əgər,*
*Gözlərində yer üzü təzə gülüstana dönər.*

Saib insan şəxsiyyətini, insanın mənəvi yüksəkliyini çox yüksək qiymətləndirmiş, hər şey üçün üzünün suyunu tökən yaltaqları, tamahkarları tənqid atəşinə tutmuşdur. Söz oyunu vasitəsi ilə onlara xatırlatmışdır ki, insanın "abrusu" arxda axan su deyildir ki, sən "bir arxa su gəldi, ümid var bir də gələ" məsəlinə arxalanıb özünü alçaldasan. Çünki "abrusunu" itirmiş adamın yenidən "aburlu" olması mümkün deyil:

*Abrunu tökmə hədər, böylə misal var, deyə sən:*
*Qurumuş arxa ümid var ki, gələr su təzədən.*

Saib ədəb-ərkan, cəmiyyətdə, məclislərdə özünü necə aparmaq qaydası, dostluğun məziyyətləri, düşməni heç zaman aciz saymamaq, böyüyə hörmət,



kiçiklərə örnək olmaq və s. haqqında onlarca şeirlər yazmışdır. Dostluqdan danışarkən şair deyir:

*Ayrılar dostundan, əlbət, olmasa dost mehriban,*
*Çün sarı yarpaqları bağdan qovar badi-xəzan.*
*Qətrədən irmaq olar, irmaq da çayda birləşər,*
*Tənhalıqdan heç nə hasil etməmiş ayrı olan.*
*Müxtəlif xislətlilər yüz il tanış olsa, yenə*
*Xasiyyət tutmursa, onlar ayrılar bir gün, inan.*

Saib Azərbaycan dilində olan şeirlərinin birində cavanlara nəsihət edir ki, əgər istəyirsiniz xalq içrəsində hörmətli olasınız, "qocalar qədrini igidlikdə bilin".

Farsca qəzəlində oxucusuna məclis qaydalarından danışır:

*Çalış qonaqlığa getmə, əgər gedər olsan,*
*İtaət eylə sən hər qaydaya mətanətlə...*
*Yağ ilə bal kimi ol cümlə məclis əhliylə,*
*Üzünü turşudaraq baxma sən küdurətlə...*
*Biri danışdı əgər, kəsmə sən sözün yarıda,*
*Üyüdər öz dənini xalq həmişə növbətlə.*
*Gələndə məclisə öyrən əvvəl nədir səbəbi,*
*Soyutma məclisi hey pıçhapıç söhbətlə.*
*O məclisə ki, ora varlılar yığışmışlar,*
*Gedərsə yoxsul əgər, əyləşər nə halətlə?!*

Saib Təbrizinin sənətkarlıqla deyilmiş bu cür nəsihətamiz şeirləri çoxdur. Elə buna görə də təzkirəçilərin verdiyi məlumatdan aydın olur ki, Saibin divanlarından seçilib üzü köçürülmüş gülçinlər o zaman kitabxanalardan daha çox alimlərin və şeirsevərlərin evində, hökmdarların saraylarında olurmuş. İllər keçdikcə Azərbaycanın bu böyük söz ustadının divanları dünyanın bir çox mötəbər kitabxana və müzeylərinə aparılmışdır.

Saib Təbrizinin yadigar qoyub getdiyi ədəbi irsi ilk dəfə Hindistanda, "Seçilmiş əsərləri" 1927-ci ildə Heydərəli Kəmali tərəfindən İranda, "Külliyyat"ı 1954-1957-ci illərdə Əmir Firuzkuhi tərəfindən Tehranda, Azərbaycan dilində qəzəlləri 1946-cı ildə ərəb əlifbası ilə akad. H.Araslı tərəfindən Bakıda, Saibin öz xətti ilə yazılmış divanının faksimilesi 1971-ci ildə Kəraçidə nəşr olunmuşdur.

Saib Təbrizinin hörmətli oxuculara təqdim olunan bu kitabında toplanan əsərləri adlarını çəkdiyimiz divan və külliyyatlardan əlavə, Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda saxlanılan divanlarından seçilmişdir.

Saib Təbrizinin yadigar qoyub getdiyi yüksək sənət nümunələri, təbliğ etdiyi böyük bəşəri ideyalar bu gün də çox yüksək qiymətləndirilməkdədir.

Azərbaycanın bu görkəmli sənətkarı XVII əsrdən bəri yazılmış minlərlə cünglərdən, təzkirələrdən, ədəbi və elmi kitablardan oxucuların qəlbinə köçmüşdür. İndi o, milyonlarla pərəstişkarının ürəyində yaşayır. Şair özü də vaxtilə yazmışdır:

*Bu qara torpağın altındadı Saib, - deyə siz gəzməyiniz,*
*Məni bundan sonra gəzsəz, siz ürəklərdə gəzin.*

Ümidvarıq ki, Saib Təbrizinin ana dilində təkrar nəşr olunan bu "Seçilmiş əsərləri" onu qəlbində gəzdirən oxucuların sayını xeyli artıracaqdır.

***Balaş Azəroğlu***





* * *

Nə ehtiyac ki, saqi verə şərab sənə
Ki, öz piyaləsini verdi afitab sənə.
Şərab ləli üçün tökmə abiru zinhar
Ki, dəmbədəm ləbi-ləlin verir şərab sənə.
Əgər urum daşa, peymanəni keçür, saqi,
Şərabidən neçə göz tiksə hər hübab sənə.
Qurutma tərli üzarın içində badeyi-nab
Ki, gül kimi yaraşur çöhreyi-pürab sənə.
Şərabidən nə əcəb olmusan əgər sərxoş,
Bu duzlu ləblər ilən neyləsün şərab sənə?!
Bu atəşin yüz ilən kim dutar sənin ətəgin,
Həlal elər qanını, ta yetər kəbab sənə.
Dedim çığarə səni xət hicabıdən qafil
Ki, ol qubar olur pərdeyi-hicab sənə.
Sənin səhifei-hüsnün kəlami-Saibdir
Ki, daği-eyb olur xali-intixab sənə.

* * *

Aşiqin göz yaşına rəhm eyləməz ol afitab,
Yığlımaq[1] ilə aparmaz od əlindən can kəbab.
Baş verəndə xəncəri-sirabına yetməz mənə,
Gərçi sanır özünü başdan keçənlərdən hübab.
İçdi qanlar ol sitəmgər ta kəbab etdi məni,
Çəkdi oddan intiqamın dönə-dönə bu kəbab.
Xak oldum ol kəmanəbru oxun seyd etməgə,
Bilmədüm gül yayidan düşməz yerə tiri-şəhab.[2]

Gər dutuşsa ateşi-ruxsaridən, yerindədir,
Eyləsin aşiqlər ilə necə yüzsizlik niqab.
Şəfqət ilən bir kərə başım götür torpaqidən,
Necə yolunda şəfəqdən tərləsün qan afitab?

[1] Yığlımaq – ağlamaq.
[2] Tiri-şəhab – yanan ox.

Fariğəm səngi-məlamət içrə cori-çərxidən,
Neyləsün göhərdə olan suya moci-inqilab?
Əql-eşq etmək söz ilən səhl, asan görünür,
Baş ağardı nafətək, ta qanın etdi mişknab.[1]
Sanmıya hər kim fəna dünyada mövcud özünü,
Daxili-cənnət olur məhşərdə Saib bihesab.

* * *

Eldən çıxaram zülfi-pərişanını görgəc,
İşdən gedərəm sərvi-xüramanını görgəc.
Susuzlara gər can axıdur çeşmei-heyvan,
Mən can verərəm çeşmei-heyvanını görgəc.
Gər bağlamusan el gözünü şərmi-üzarın,
Candan kəsilür xəncəri-müjganını görgəc.
Reyhan ki, nəzakət tökülürdi qələmindən,
Xət tirə çəkər zülfi-pərişanını görgəc.
Bülbül ki, gülün ləli-ləbindən söz alırdı,
Dili dolaşır qönçei-xəndanını görgəc.
Rizvan ki, behiştin yemişi gözünə gəlməz,
Dişlər əlini sibi-zənaxdanını görgəc.
Yerdən xəti-reyhan vərəqin pak silibdir,
Nəqqaşi-gülüstan, xəti-reyhanını görgəc.
Gül rəngi alur sübh iki xali-tərindən,
Xürşidi-üzar möhriqi[2] əfşanını görgəc.
Müjgani alıb qanlu yaşından rəgi-yaqut,[3]
Saib ləbi-ləli göhər əfşanını görgəc.

* * *

Olmadı xürşididən dağlarda rəngin qaşlar,
Gördilər ləli-ləbin, qan tərlədilər daşlar.
Qıldı peyda hökmi-təqvimi-kühən gül dəftəri,
Açdılar ta çöhrei-dildarımı nəqqaşlar.

[1] Mişknab – mişk kimi saf.
[2] Möhriq – yandıran.
[3] Rəgi-yaqut – qırmızı damar.



Qılmadılar sinei-əfkarımı amacgah,[1]
Əksük etdilər bizimlən ol müqəvvəs[2] qaşlar.
Aşiqi-sadiq bilir səngi-məlamət qədrini,
Məxzəni-sultana layiqdir bu yarar daşlar.
Günü dündən el, dedim, tərk etməsün yoldaşlığı,
Çün qara oldu günüm, yad oldular qardaşlar.
Yol əgər həqdir, çəkər yolsuzdan axır intiqam,
Elə tapşır, çıxdılar yoldan əgər yoldaşlar.
Oldu məğlubi-həvai-nəfsi-istilai-əql,
Aldılar hakim əlindən ixtiyar ovbaşlar.
Çün könül binur olub mütləq ənan alur həvəs,
Qaş qaralanda çıxarlar yuvadan xəffaşlar.[3]
Mehriban olmaz nəsimi-sübhdəm hərgiz sənə,
Şəmtək ta tökməsəm Saib gözündən yaşlar.

* * *

Aşiq qanını vəsməli qaşın nihan içər,
Cöhərli tiğ qın ara peyvəstə qan içər.
Etdükcə qan könülləri ol ləli-ateşin,
Abi-həyattək qara zülfün rəvan içər.
Ta bir piyalə verdi, kəbab etdi bağrımı,
Hər kim onun əlindən içər badə, qan içər.
İllər yaşar Xızr kimi hər kim ki, gecələr,
Gül üzlü yar ilən meyi çün ərğəvan[4] içər.
Adəm nədir ki, içməsün ol verdigin şərab,
Versən əgər, firiştə meyi bigüman içər.
Saqi mənimlə şişei-peymanə neyləsün,
Dəryani bir nəfəsdə bu rigi-rəvan içər.
Tezraq çəkər nədamətə[5] bədməstilik yolu
Hər kim ki, yaxşı içsə şərabi, yaman içər.
Saib ki, mən onun sözünü yerə salmadım,
Bilmən neçün mənim qanımı asiman içər.

[1] Amacgah – nişangah.
[2] Müqəvvəs – qövs şəklində.
[3] Xəffaş – yarasa.
[4] Ərğəvan – qırmızı.
[5] Nədamət – peşmançılıq.

* * *

Gül kimi hər kim ki, gülzar içrə nəqd canı var,
Səyilə töksün sənin yoluna ta imkanı var.
Ta ayağın torpağına tökməsin, dutmaz qərar,
Hər kimin məclisdə mina tək bir ovuc qanı var.
Nə əcəb aşiqləri gər başdan açsun naz ilə,
Kaküli-mişgin kimi hər kim ki, sərgərdanı var.
Eyləyibdür nöqteyi-xalın məni pərkarsız,
Yoksa dərya üzrə hər bir qətrənin dövranı var?
Gəzdirərlər əlbəəl dağın könüllər parəsi,
Yerdə qalmaz cam tək hər kim ki, isti qanı var.
Puçdi hər söz ki, deyərlər mərifətdən əhli-qal,
Bəhridən çıxmaz sədəf ta gövhəri-qəltanı var.
Çox degil heyrət yeri, gər varsa şirin sözləri,
Tutinin, Saib, nəzərdə güzgi tək meydanı var.

* * *

Məni məhrum edən rüxsaridən zülfi-pərişandır,
Bu dəryayi-lətafət mövci-ənbər içrə pünhandır.
Əgər xürşidi-taban ilə sənsiz həmşərab olsam,
Ləbi-ləli-meyalüdi gözümğə qanlu peykandır.
Dədi-dami[1] müsəxxər eyləyübdür cəzbei-eşqin,
Dügün[2] Məcnuni-şeyda başına çətri-Süleymandır.
Məni məkri-rəqib avarə qıldı yar kyindən,
Çıxaran Adəmi firdovsidən təzviri-şeytandır.
Qaçan aşiqlərin fikrinə düşdü ol əqiqi-ləb
Ki, onun bir qara gözlülərindən abi-heyvandır.
Müsəlmanam, deyir məstin, içir aşiqlərin qanın,
Mənəm kafir, əgər ol düşməni-iman müsəlmandır.
Məhəbbət əhli həngi-camu nişati-dərdidən dönməz,
Neçün çəksün xümar ol kim, həmişə içdigi qandır?
Məni-xaki nə tənha olmuşam Məcnun kimi rüsva
Ki, ol dərddən fələk səngi-məlamət içrə pünhandır.
Fələklər qan içər gördükdə təcrid[3] əhlini, Saib,
Ki, yuksizlər[4] həramilər göziğə tiği-üryandır.

[1] Dədi-dam – vəhşi heyvan.
[2] Dügün – (burada) dərd.
[3] Təcrid – kənara çəkilmiş, ayrılmış.
[4] Yuksizlər – yuxusuzlar, yatmayanlar.



* * *

Çıxardi xət, mənəm zülf mübtəlası hənuz,
Dügün saqaldıvu başımdadır qarası hənuz.
Xətin qübari quyaşi[1] əgərçi yaşurdi,
Gözümi xirə qılur yüziyin səfası hənuz.
Bahar yetdi də qanlar ki, tökdi gözlərdən,
Xəzan olanda nələr eyləsün cəfası hənuz.
Suvardılar qılınc ilə məgər gülüstanı
Ki, bir-birinə qovuşmaz gülün yarası hənuz.
Həyat suyuna bir dağ qoydu rəşki-ləbin
Ki, keçdi ömri-əbəd, tüşmədi qarası hənuz.
Mühiti-eşqara mən ol hübabi-bibakəm
Ki, getdi başımu başımdadır həvası hənuz.
Vüsal ümidinə ömrün keçirdi küyində,
Yetişməz işlərinə Saibin duası hənuz.

* * *

Tutulmuş könlümü cam ilə şadan eyləmək olmaz,
Əl ilən püstənin ağzını xəndan eyləmək olmaz.
Nə sözdür bu ki, olsun sahibnəzər zühad,
Qara torpağı hərgiz abi-heyvan eyləmək olmaz.
Bulut qılan kimi cövlan urar da ildırım tiği,
Könül pərdələrində eşqi pünhan eyləmək olmaz.
Qılıc gər içsə aləm qanını, sirabılıq bilməz,
Səni üşşaq qətlindən peşiman eyləmək olmaz.
Mənim göz yaşımı çıxgil, fələklərdən təmaşa qıl,
Hübabi qəsrilər içində tufan eyləmək olmaz.
Məni-Məcnuni aqil eyləmək mümkün degil, nasch,
Söz ilən müşgi-nabi,[2] qan ki, bir qan eyləmək olmaz.
Xətadan keçdi, ceyran qanını müşk eylədi Saib,
Demə, üsyanı taət, küfri iman eyləmək olmaz.

[1] Quyaş – günəş.
[2] Müşki-nab – müşk kimi təmiz.

* * *

Meydən ol çöhreyi-ziba ərəqəfşan olmuş,
Ya sərasər göz olub üzünə heyran olmuş?
Bu görən damrəni halə xəyal etmə ki, çərx
Ağzın açıb məhi-şəbgərdimə heyran olmuş.
Gözdən iraq ki, [bu] soltani-cünun şövkətdən,
Hər dügün başıma bir çətri-Süleyman olmuş.
Ləbi-ləlin qəmindən bəs ki, udubdur qanlar,
Xubların daş ürəci kani-bədəxşan olmuş.
Ta görübdür nəzərin var onilən qaş yayı,
Gül üzün cəm qılıb qönçeyi-peykan olmuş.
Saf edən də ləbi-canbəxşini dövran işidir,
Bir-iki qətrə damıb çeşmei-heyvan olmuş.
Rəhm qıl Saibə, saqi, mey ilən dut əlini,
Necə içsin qanını bu ürəgi qan olmuş?

* * *

Xəti-qübarın, arizin ayati-Quran eyləmiş,
Hüsni-sahib şövkətin muri Süleyman eyləmiş.
Noqtei-səhv eyləyibdir gözlərin ceyran gözün,
Qaşların bayram hilalın taqi-nisyan[1] eyləmiş.
Azdırıbdır gül yüzün bülbülləri gülzarıdən,
Sünbülün, reyhan xətin torpağa yeksan eyləmiş.
Kəbəni bütxanə edibdir firəngi gözlərin,
Yer yüzün zünnar zülfün kafərstan eyləmiş.
Başını xəti-şüa ilən dutubdur afitab,
Ta mənim çapuk səvarım əzmi-meydan eyləmiş.
Ləli-meykunin ki, içibdir bədəxşan qanını,
Qönçəni bülbül gözünə qanlu peykan eyləmiş.
İltifati-ləli-canbəxşin qara günlüləri
Xəlq içində pərdədari-abi-heyvan eyləmiş.
Dərdi-eşqin çöhrei-zərrin ilən yer yüzünü,
Səfhei-xurşidi-təbantək zərəfşan eyləmiş.
Moci-dəryayi-ehsanın dutubdur yer yüzün,

[1] Nisyan – unudulmuş.



Şövqi-ruyin bu cəhani şəhri-yunan eyləmiş.
Çilvei-badi-bahari-iltifatın gül kimi,
Könlümü min çak ilən dəsti-giriban eyləmiş.
Nə əcəb, gər Saib ilən xəttini qıldım rəqəm,
Xəti-xalın böylə çox kafəri müsəlman eyləmiş.

* * *

Ömr keçdi, səfər əsbabını amadə qılın,
Hər nə sizdən kəsə tiği-əcəl, ondan kəsilin.
Qülzümi-eşqidən ey ayrı düşən həmdəmlər,
Düşmüşikən yola silabi-bahari yığılın.
Ta sizi dövri-zəman eyləməyibdir pamal,
Gün sarı şəbnəm güldükcə çəməndən çəkilin.
Olmayan çərxara pərvanə rəvandan qafil,
Bu gül ilə qarani, güzgüləri saf eləyin.
Gög fəzası nə məqali[1] – pəru bal açmaqdır,
Danei-nar kimi bir-birinizə qısılın.
Gər umarsız ki, cavanbəxt olasız axiri-ömr,
Qocalar qədrini zinhar igitlikdə bilin.
Artırur gərdi-məasini[2] quru istiğfar,[3]
Bu zəmingər tozunu əşki-nədamətlə silin.
Faş qılur xəm qocalar qamətini taətsiz,
Əkməmişkən sizi bu çərxi-müqəvvəs əkilin.
Duta gər qönçə kimi çevrənizi neştəri-xar,
Verməyin gül kimi əldən qədəhi-mey, içilin.
Kim ki, sağər kimi ağzın açasız minanın,
Gülə-gülə kərəm ilə onu məmur qılın.
Badə, ney cuşi onun söz kəlamındandır,
Saibin qədrini, ey əhli-xərabat, bilin.

* * *

Tutma ol gül damənin məhşər günündə can üçün,
Qılma yüzsüzlüğ nigar ilən bir ovuc qan üçün.
Açmagil ağzın görəndə xali-mişkin danəsin,

[1] Məqal – danışıq yeri.
[2] Məasi – günah.
[3] İstiğfar – tövbə, bağışlanma.

Əkmə baş pərgartək hər nöqtəyə dövran üçün.
Yoldaş oldur kim, qara günlərdə yoldan çıxmasın,
Keçmə yoldaşdan Xızırtək çeşmeyi-heyvan üçün.
Yengi ay başın əgər xurşidə ta olsun təmam,
Sadədil bilməz ki, bəslər özünü nöqsan üçün.
Məşrəb üçün qoymagil əldən ənani-ixtiyar,
Xamiliqdan atını öldürməgil meydan üçün.
Hüsn-cölanından əl kəsməkdir arvadlar işi,
Keç özündən mərdilərtək Yusifi-Kənan üçün.
Minnət ilə dirilik, Saib, ölümdəndir bətər,
Can verərlər əhli-qeyrət dərdi-bidərman üçün.

* * *

Məhi-şəbgərd əgər görsün onun xürşid rüxsarın,
Kəmənd eylər onu seyd ötmək üçün halə zünnarın.
Şəkərxənd eyləyəndə neyləsün üşşaq ilən yari
Ki, aci sözlərin verər [ona] ləli-şəkərbarın.
Deyirlər, dərdmənd olan bilər həmdərd halını,
Yetişməz xəstələr halına neyçün çeşmi-bimarın?
Neçün məhv olmasın adəm onun seyranını görçək
Ki, heyran oldurubdur vəhşətin gördükcə rəftarın.
Nə layiqdir ki, eşq əhli qıla qan içdigin zahir,
Neçün bülbül yaşurmaz el gözündən qanlu münqalın?
Süpehri-səngidil içrə mən ol Fərhad zəbərdəstəm
Ki, abi-tişədən kani-zümrüd qıldı kuhsarın.
Məgər ol afitab ilən şəfəqgun mey içər Saib
Ki, sərxoş mey çəkər yer üzrə hər gün sübhdəm sarın.

* * *

Saqiya, meydən rüfu qıl çak bulmuş könlümü,
Qıl yuvası qan ilən peyvənd üzülmüş könlümü.
Qalmışam yerdə qanadsız quş kimi pərvazıdan,
Yola sal cami-şərab ilən büzülmüş könlümü.
Artuq eylər badei-safi mənim viranlığım,
Dərd ilən təmir qıl, saqi, pozulmuş könlümü.
Zöhdidən qan quruyubdur bağrım içrə lalətək,



Tazə qıl əski mey ilən bu qurumuş könlümü.
Lütf qıl səhbai[1]-roşənbirlə, ey mahi-təmam,
Bayram ayı eyləgil qəmdən bükülmüş könlümü.
Cam urmaq rəsmidir, saqi, tutulmuş ay üçün,
Seyqəli-cam ilə pərvaz et tutulmuş könlümü.
Eylə kim, Saib, qəmi-dövran tutubdur çevrəmi,
Seyri-gül mümkün degül açsun tutulmuş könlümü.

* * *

Biz nə imdi zərrətək cövlana gəlmişlərdənüz,
Afitabi-eşq ilən dövrana gəlmişlərdənüz.
Gün keçirməkdir hesabi-şahid əgriliğ üçün,
Doğruluğdan biz bu gün divanə gəlmişlərdənüz.
Saya dur barani-rəhmət, gər qılıc gögdən yağar,
Qoç kimi qurban üçün meydanə gəlmişlərdənüz.

* * *

Şahe-mən, dər kuye-to ta key konəm fəryad hey?[2]
Daxi taqət qalmamışdır, dad hey, bidad hey.
Həmdəməm qəm, munesəm qəm, delbəra, qəmxar qəm,[3]
Ey dolanım başına, sənsiz degil dil şad, hey.
Gəh be-eşve, gəh be-ğəmzə, gəh təğafol, gəh be-naz,[4]
Aparırsan əqlimi bir şivəgər üstad, hey.
Bəs həme-şəb dər fəraqət zaro nalan, bi-rəfiq,[5]
Qalmışam zaru-zəlil, ey yari-mən, imdad hey.
Dər dil Saeb bəsi ca kərdəəst çeşmane-məst,[6]
İki kafər bir müsəlman öldürür, bidad hey!

---

[1] Səhba – şərab.
[2] Ey mənim şahım, sənin yolunda nə vaxta qədər fəryad edim?
[3] Həmdəmim qəm, munisim qəm, dilbərim, qəmxarım qəmdir.
[4] Gah işvə ilə, gah qəmzə ilə, gah naz ilə.
[5] Bütün gecəni sənin ayrılığından zar, nalan və yoldaşsız.
[6] Sənin sərxoş gözlərin Saibin ürəyində yer almışdır.

* * *

Kənara çəkmə üzündən ol ənbər əfşanı,
Amandı, qırmağınan bu dili-pərişanı.
Mənim bu ağzımı söz ilə bağlamaq da olar,
Yaraya bəxyə vurarlar ki, axmasın qanı.
Quru çörəklə güzaran edib bu aləmdə,
Nə xahiş eylə, nə minnət, unut bu imkanı.
Ürəklər ovlamaq ol zülf üçün çox asandır,
Şiri kəməndə salıb, gəzdiribdir hər yanı.
Yenə də sərv ağacın qumru gizli məskən edib,
Ümidi var ki, görə bağda, bəlkə, cananı.
Əgər çıxarsa əli yaxadan, fələk bir gün
Yada salar üzüyü, divi, o Süleymanı.
Bu qönçə qəlbimə sığmaz bu aləmin kədəri,
Tutarmı qum saatı qum dolu biyabanı?
Əgər ki cismin ilə ruhun olsa bir rəngdə,
O anda fərşin olar göylərin də tufanı.
Bu qış ayında əgər İsfahan bəzənmişsə,
Yəqin onu bəzəyib Saibin bu dastanı.

* * *

Əzdikcə fələk torpağa döndüm bu cahanda,
Yox özgə dənim, mən üyüdəm bir daha onda.
Divar dibinə çəksə də yoxsulluğum, ancaq
Huma quşu dayəmdi mənim mən doğulanda.
Qəm dağı, inan, qamətimi əydi kamantək,
Ancaq məni sındırmadı bir ləhzə boran da.
Dövran mənə nə verdi, nə geydirdi, soruşma,
Ruzum – qəzəbim, paltarım eybimdi cahanda.
Dağ səbrim ilə uyğudayam dağ ətəyində,
Xəncərlə ayırmaq bizi mümkünmü bir an da?!
Öz süfrəmə mehman oluram, bəsdi mənimçün,
Göz dikmərəm özgə əlinə, qopsa tufan da.
Kam almasa da hər iki dünyada bu aşiq,
Qəlbi açılır yarı görüb heyran olanda.



Bir dürrəm özüm, qiymətimi verməsələr də,
Aydındı mənə, yoxdu xiridar bu məkanda.
Mən ki fələyə minnət ilə başımı əymərəm,
Əzsin, nə olar, istəmərəm ondan aman da.
Zahirdə mənəm varlı ki, batində fəqirəm,
Qönçə kimiyəm paltarın altında qalanda.
Əlvan libasa yox həvəsim, Kəbətəkin mən
Bəsdir dəyişəm paltarımı il qurtaranda.
Sayəmdə əgər şöhrətə çatmışsa bu xalqım,
Ruzim sümük olmuşdu humatək bu məkanda.
Saib, səni kim bağladı bu mülkə ki, qaldın?
İndi sənə zindandı bura, qal, hələ yan da!
Başlandı yenə od nəfəsi burda baharın,
Yüz rəngə çalan qönçələri pozdu qərarın.
Kəmbəxt olana neməti-əlvan nəsib olmaz,
Gül qanına batmaqla qızarmaz üzü xarın.
Ruzgarın əgər xoş keçə, ölmək yada düşməz,
Hər bad ilə sönməz çırağı çünki məzarın.
Mən[1] etməyə çərxi-fələyi yox daha taqət,
Zər güdməyə qıvrılmaq olub qisməti marın.[2]
Qəlbi işıq insanlara dünya qara keçdi,
Gördü bu həyatın hər üzün – dərdin, azarın.
Dövran dolanıb, kama yetişdin daha, Saib,
Bir badə də iç, ta ki sına məsti-xumarın.

* * *

Can boğazda, sübhtək biz indi nalan olmuşuq,
Dərdimiz çıxmış üzə, eşqi nümayan olmuşuq.
Ol müqəddəs yerdə də şamtək yanar şerim mənim,
Min təəssüf ki, ətək altında pünhan olmuşuq.
Gərçi zahirdə libasım köhnəlib qəmdən mənim,
Püstətək çıxdıq qabıqdan, biz də xəndan olmuşuq.
Kim bizə yaxşı olarsa, qəm yeməz heç bir zaman,
Çünki şirazə[3] kimi dəftərlərə can olmuşuq.

[1] Mən – inkar.
[2] Mar – ilan.
[3] Şirazə – kitabın vərəqlərini tikmiş sap.

Qarğının hər şadlığında iki aləm cəm olub,
Bizsə şimşəklər kimi göylərdə cövlan olmuşuq.
Bu geniş səhrada qismət bir tikan olmuş bizə,
Çöldəki toz-torpağa sahibi-imkan olmuşuq.
Söykənibdir aynatək divara indi arxamız,
Bu bağa, bu bostana baxmaqla heyran olmuşuq.
Göz-göz olmuş yarəmiz köz bağlayıbdır qapqara,
Bu səbəbdəndir ki, biz indi pərişan olmuşuq.
Süfrəyə baxmaq olub dünyada qismət bizlərə,
Rəngbərəng nemət görüb, süfrəsi əlvan olmuşuq.
Boynuma zəncir salıb həlqəyə bənzər gözlərin,
Gözləri yolda qalan bir əhli-zindan olmuşuq.
Biz ki cənnət meyvəsindən ummadıq zahid kimi,
Almatimsal üzlərin ətrinə mehman olmuşuq.
Məşriqin ulduzların bənzətmişəm mən güllərə,
İndi o güldən sarı qəlbi dolu qan olmuşuq.
Ətrimiz olsa, o torpaqda tikan da gül açar,
Özgə bir aləmdi o, biz orda reyhan olmuşuq.
Darüləmanda[1] olan tək-tənhalıq küncündəyik,
Qaçdıq insandan uzaq, əhli-biyaban olmuşuq.
Hər gecə məsti-xumar olsaq da, sübh asudəyik,
Lakin o yarın gözündə məsti-viran olmuşuq.
Bizdən almışdır libasın mişgi-ənbər məskəni,
Bu səbəb olmuş ki, biz dillərdə dastan olmuşuq.
Biz qarabəxtik, fəqət aləm bizimlə namidar,
Bir üzüktək barmaği-dövranda cövlan olmuşuq.
Aləmi nəzmi-nizama salmağa acizlərik,
İndi bu düzlüklə biz sərvi-gülüstan olmuşuq.
Bu həyat bəzmində, Saib, şam kimi yanmır qələm,
Neyləyək, biz hər zaman əhli-şəbistan olmuşuq.

* * *

Gül üzün nəqş elədim sinədə yarın pünhan,
Sarı, cəhənnəmdə bu gün cənnət özü oldu əyan.
Zahirən bir bahara bənzəyirik – yox xəzanı,
Çün hənayla bəzəyibdir baharı fəsli-xəzan.

[1] Darüləman – pənah evi.



Bu həyatda varımız bir dəridir, bir də sümük,
Əsər etməz, nə qədər səxt keçərsə dövran.
Biz bu yolda ürəyin qanını içdik, yaşadıq,
Sadəlövhdür su, çörək fikri edən hər insan.
Hara getsək də, bizə hümmətimiz arxa olar,
Tez çatar ox hədəfə, möhkəm onu atsa kaman.
Bizə qismət kaman olmaq idi, ov ovlamadıq,
Özgələrçündü fəqət, hər nəyimiz varsa, inan.
Nə üçün də bu qara torpağa biz heyran olaq?
Yerlə göy seyr eləyib qoy bizə olsun heyran.
Bu yolun yoxdu sonu, hey gedirik, hey uzanır,
Elə qəflətdəyik, amma hələlik yox ayılan.
Meyvəmiz kölgədi bu torpağın üstündə fəqət,
Müddəiyik ki, bizə borclu qalıbdır bağban.
Saibin boşsa əli dünya malından, ancaq
Səslənir zəng kimi, ta mənzilə çatsın karvan.

* * *

Demirəm, səhrada bir rəhbərim yoxdu mənim,
Qanadımdan savayı, bir hünərim yoxdu mənim.
Cigəri yanmış o qəvvas da mənəm, yox nəfəsim,
Dağdan özgə, ürəyimdə gövhərim yoxdu mənim.
Neçə müddətdi axan qümlər olub həmsəfərim,
Gedirəm, mənzilim harda – xəbərim yoxdu mənim.
İstərəm, qəlbimə atəş yağa bu uçmaqdan,
Daşa dönmüş ürəyimdə şərərim yoxdu mənim.
Elə yüngüldü yüküm, Nuh məni almış gəmiyə,
Çör-çöpəm sanki, tufandan xəbərim yoxdu mənim.
Bənzərəm sərvə, baxarlar mənə heyran-heyran,
Qəmdən özgə, bu cahanda səmərim yoxdu mənim.
Sapı odlansa şamın, od yeriyər qəlbinədək,
Axı pərvanəyə, yansam, zərərim yoxdu mənim.
Narahat qəlbim ilə hər gecə söhbət edirəm,
Ondan özgə, nə edim, naməbərim yoxdu mənim.
İki dünyaya dəyər indi qulaq dincliyimiz,
Heç də qəmgin deyiləm, simu zərim yoxdu mənim.

Şam kimi istəmişəm ki, işığım pərvaz edə,
Heyf ola, uçmaq üçün balu pərim yoxdu mənim.
Əymişəm, qönçə kimi, başımı öz sinəmə mən,
Saib, ondan savayı özgə yerim yoxdu mənim.

* * *

Nə qədər sövq edəcək arzu bu meydana bizi?
Hərzə bir it kimidir, sövq edir hər yana bizi.
Ömür bir ipdi, düyündən savayı yox səməri,
Əksələr torpağa, torpaq gətirər cana bizi.
Bizim hər bir tükümüzdən, elə bil, dağ asılıb,
Seldə yoxdur o hünər, çatdıra ümmana bizi.
Buludun kölgəsi düşməz biz əkən danələrə,
Təkcə hümmət yetirib bu bağa-bostana bizi.
Eşqə düşdük, dinimiz, əqlimiz əldən getdi,
Daha kim çatdıracaq, söylə, o karvana bizi.
Özünə zülm eləyər, kim oxusa naməmizi,
Namədir vaqif edən çünki o pünhana bizi.
O məcazı gözəlin sərv kimi qamətidir,
Varmıdır özgə gözəl, döndərə qurbana bizi?
Saib, hər müşkili dırnaq ilə açmaq olmaz,
Gər açılmazsa bu müşkil, salacaq qana bizi.

* * *

Ustad bir saqi istər hər dəm şərabı eşqin,
Od istər, ataş istər ancaq kababı eşqin.
Fanussuz olmamışdır şamlar bizim otaqda,
Şahid hicabsız olsa, yanar hicabı eşqin.
Bu dərdli ahım axır xalqı divanə etdi,
Heç kəsə dəyməsin kaş iyi kəbabi-eşqin.
Fərhad dağı çapanda işlərdi, məst olardı,
Kaş üstümə doğaydı o afitabı eşqin.
Kimin ki, ağlı azdır, yəqin o az ağılla
Bilər, bir az da olsa, nədir gülabı eşqin.
Əbədi ömrə Xızrı razı salmaq olardı,



Ona olsaydı qismət əgər savabı eşqin.
Hər insanın cahanda öz qibləgahı vardır,
Mən də qulamı oldum, Saib, cənabi-eşqin.

* * *

Qəmi başdan aşanın olmaz ölümdən həzəri,
Qurumuş bir çəmənə ildırımın yox xətəri.
Qəlbinin yanmağını söyləmə, ey lalə, mənə,
Qəlbi yanmışdan olar qəlbi yananın xəbəri.
Neməti əldə edər, kim buna səy etsə əgər,
Pərdədən də görəcək məşuqu aşiq nəzəri.
Ürəyi odlananın mütribi mənzildə olar,
Necə ki, od alışar, rəqs eləyər şölələri.
Layiq olmaz hər adam gəzdirə eşqin dağını,
Qeyri aşiqlərə göstərməz üzün çün o pəri.
Nə qədər təqlid ilə eyni yolu getmək olar?
Quş təzə uçmağa başlarsa, uzanmaz səfəri.
Od salar xırmanına bir gün o eşq sahibinin
Saibin şölə çəkən qəlbinin ol zərrələri.

* * *

Buludun göz yaşı verməzdisə ümmana məni,
Özgə cövhər verəcəkdi yenə dövrana məni.
Eşq naz ilə əlin qoydu sinəm üstə mənim,
Döndərib ömrü-günü indi pərişana məni.
Bir hübabdır bu gəmim, vardı havadan xətəri,
Qorxuram əssə nəsim də, sala tufana məni.
Zahirim xoşdu ki, Saib edə heyran hamını?
Aynatək əks edərəm, çəksələr hər yana məni.

* * *

Güllərə rəng verib çünki vəfadarlığımız,
Sərvi heyran eləyib bunca havadarlığımız.
O, Məsiha nəfəsin kölgədə qoysa, yeri var,
Bu xumar gözlə sağalmış daha bimarlığımız.
Qəmənin ağzı boğazımda, durub gözləyirəm,
Bəlkə, Saib, ola ol yara fəda varlığımız.

* * *

Bir uşaqtək özünü torpağa heç sürtmək olar?
Palçıq ilə günəşin çöhrəsini örtmək olar?
Qara torpaqsa bədən, bəs niyə əl çəkmirsən?
Bir pişik timsalı heç əl-ayağı öpmək olar?
İlhamı naqis olanlar təzə şeri nə bilir,
Bu həyat çeşməsini şor yerə heç səpmək olar?
Ömr yaz yellərітək inci tökür ötdükcə,
Gül kimi, kol-kos arasında məgər bitmək olar?
Bir ömür ləli-ləbin istədi öpsün Saib,
Bu qədər qəlbi sınıq aşiqi incitmək olar?

* * *

O qəddinin həsrəti salmış məni bəlaya.
O zülfünün şövqündən bir yoldaşam səbaya[1]
Görüm ki, ayrı düşsün o qayçı gözlərітək,
Kim saldısa hicranı bu şad gündə araya.
Ömrümüzün sonunda fələk insafa gəldi,
Döndük quyu başında Yusif kimi bəqaya[2]
Nəfəs çəkdim, odundan yandı neyin də bağrı,
Kəsildim mən də bənd-bənd, axır gəldim nəvaya.
Dövran əmni sıxanda İrandan etdim hicrət,
Uzaq Hind ölkəsindən qurtar məni, xudaya!

* * *

Asan da gəlməsin, ey ağciyər, şikar sənə,
Çətin başa gələcək axırı bu kar sənə.
Şiri şikara gedən çox zaman şikara dönüb,
Gər şikar olmamısan, tale olub yar sənə.
Arif ol kəsdi ki, öz-özünü dərk eləyir,
Sahiliyox bu dəniz heç verər kənar sənə?
Əlin ətəkdən uzun durmusan nahaq beləcə,
Nə ümmid eyləmisən, yol verə hasar sənə!

[1] Səba – səhər yeli.
[2] Bəqa – daimi.



İnanmıram ki, qiyamətdə də dura biləsən,
Nədəndi eyləməyir təsir heç bahar sənə?
Göyün sinəsini yüz parça etdi şimşəklər,
Bircə an gözlərini açmadın, nə var sənə!
Nədir bu kölgənin ardınca hey düşüb qaçmaq?
Bu sərvə diqqət elə, sayəsi çatar sənə.
O daş ürəyin ilə çox da iftixar eləmə,
Fələk əzər o daşı, bir divan tutar sənə.
Öz həddini aşanı bir gün endirər bu fələk,
Unutma həddini, ta verməyə qərar sənə.
Ağıllı başlanan iş, bil, o vaxt çatır sona ki,
Gülür məhəbbət ilə onda ruzigar sənə.
Közərmiş ulduz ilə dağlı lalədən başqa,
De, indi hansı gülü bəxş edib bahar sənə?!
Nə yaxşı oldu ki, axır oyandın, ey Saib,
Axı bu daş yuxular az verib azar sənə?!

* * *

O qara zülfün əsiri necə miskin görünər?
Sünbülüstanda axı ahuyi-mişkin görünər.
Aşiqin yetməz əli, sanma, yarın damənınə,[1]
Harda ki gülşən olar, orda da gülçin[2] görünər.
Eşq olan qəlbə elə eşq özü təskinlik olur,
Eşq ilə dağ çapana sureti-Şirin görünər.
Heç kəsin baxtı qara olmadı mən Məcnuntək,
Başımın üstə yanan şam belə qəmgin görünər.
Naümid kəslərə hicran gecəsi sonsuz olar,
Ümid olsa, qara yer gül kimi rəngin görünər.
Bu ağır yatmağı sanma özünə dövlət əbəs,
Axı yaz fəsli yuxu daş kimi səngin[3] görünər.
Yüngül ol, mənzilə çat, yüngül elə öz yükünü,
Bil ki, qəm dağa dönər kimdə ki, təmkin görünər.
Eşqidə miskin olan meydanı tez tərk eləyir,
Saib, ancaq ölülər eşqidə miskin görünər.

[1] Damən – ətək.
[2] Gülçin – gül dərən.
[3] Səngin – ağır.

* * *

Rəf qıllam hər bəlasın bu dili-divanənin,
Dağ seli çağrılmamış mehmanıdır viranənin.
Rəhm qıl sən biz qarabaxta, özün insafa bax,
Şam gecə almış elə qəlbin necə pərvanənin.
Eşq odundan qəlbi də hifz eləmək mümkün deyil,
Hər nəyi vardı, aparmış sel, inan, bu xanənin.
Qəlbini eşqin odunda kim əritməzsə əgər,
Qiyməti çıxmaz üzə qəlbdə olan dürdanənin.
Keç o çör-çöpdən, dolan sən qəlblərin ətrafına,
Antək könlün evi qoy şəhd ilə dolsun sənin.
Fürsəti əldən buraxma çün bahar əyyamıdır,
Qədrini bir gül əlində şeh dolu peymanənin.
Hər səhər sil göz yaşın, bundan peşiman olma sən,
Çün bu torpaq hər düşən şeh damlasın udmuş yəqin.
Ey müqəddəs Kəbə, hər işdə məni hümmətli et,
Xidmətinə, bəlkə, mən layiq olam bütxanənin.
Şeytanın təlimine məskəndi qara qəlblilər,
Çün bahar axşamları yox rövnəqi əfsanənin.
Bir sifətlə həqq yolu getsən əgər, mümkün deyil
İki aləmdə kəsə bir kəs yolun mərdanənin.
Cəhd edir göylər məni sındırmağa, bilmir məgər
Yox dəni doqquz dəyirman içrə bu biçarənin?
Eşq pak olsa, lazım deyil pərdə, duvaq,
Yoxsa şəm ağuşuna girməzdi pərvanə yəqin.
Çün xəcalətdən suya dönmüş hicabda saxlanan,
Saib, ümmandan cüda düşmüş yəqin xanən sənin.

* * *

Torpaq ucaldacaqdır, torpağa düşsə hər dən,
Dikbaşlığın ucundan sən torpağa düşərsən.
Qocalıqda göz yaşı peşmanlıqdan nişandır,
Dolsun sübhün suyundan qoy axşamkı piyalən.
Heyrətlənər həmişə, işıqlı olsa qəlbin,
Ayna çox olsa evdə, yüz görsənər bir bədən.
İllər pisi-yaxşını çəkər məhək daşına,



Saçlar da zaman-zaman dişlər tökdü şanədən.
Hər kəsdə varsa imkan bu kandardan keçməyə,
Hünərlə qoysun qədəm, çəkinməsin heç nədən.
Mən o qanadı sınmış bülbüləm, göz yaşımdan
Tor toxudum, torlanıb başdan-başa bir çəmən.
Nəfəsi qəlbdən çəkən bir cazibə varmıdır?
Çör-çöp nədir ki, onu öz yuvama yığam mən.
Bizi bir-birimizə, amandı, vurma, dövran!
Tüklər qarışan zaman daraq sınacaq həmən.
Qorxuram acizliyə yozalar bu halımı,
Dözümümlə mən qisas alardım zəmanədən.
Qulaq asma zahidin sözlərinə heç zaman,
Dəryanın sahilində olur çör-çöp də bəzən.
Saib, səbrli ol ki, bizim bu zəmanədə
Verməyəsən, amandır, ixtiyarı əlindən.

* * *

Ayrılar dostundan, əlbət, olmasa kim mehriban,
Bil, sarı yarpaqları bağdan qovar badi-xəzan.
Qətrədən irmaq olar, irmaq da çayda birləşər,
Tənhalıqdan heç nə hasil etməmiş ayrı olan.
Müxtəlif xislətlilər yüz il tanış olsa, yenə
Xasiyyət tutmursa, onlar ayrılar bir gün, inan.
Dinməsən, fikrində sözlər cəm olub səssiz qalar,
Çün danışdın, hər hərif bir səs edər dildə bəyan.
Kuzədə baxsan gülaba, rəngi birdir, ətri bir,
Rəngbərəng güldən onu çəkmişdi gül ətri tutan.
Sən uzaqdan əqlimi, huşumu başdan almısan,
Ayrılar mənzil başında karivandan-karivan.
Kim bəsirət əhlidir, əqli həqiqət zənn edər,
Eşq onunçün röyadır, röya qalıbdır hər zaman.
Üzdə dost var, başına hey and içər öz dostunun,
Arxada qanın içər, bax, böylə dostdan əl-əman.
Qonşu olmazsa əgər dostlar, doğrudan, yaxşıdır,
Onda çox möhkəm olar dostluq, elə bir imtahan.
Sözlə mənanı ayırmaq heç zaman mümkün deyil,
Öylə kim, Saib, mahaldır ayrıla cananla can.

* * *

Qurubdu məclisi güllər yenə gülüstanda.
Çiçəkli süfrədi bu bağdakı xiyaban da.
O ağ ləçəklər ilə hər tərəf tülə bürünüb,
Elə bil, ağ geyinən Leylidir bu bostanda.
Gümüştək ağ görünür qapqara o torpaq da,
Şükufə yarpağıdır, diqqət etsən, hər yanda.
Ürəkdəki qubarı açmağa bağ aciz idi,
Bahar çiçəklər ilə verdi qəlbə dərman da.
Gecəni sübhə kimi yatmayan o məstlərtək,
Üfüqdə güldü səhər sanki bir bəyaz donda.
Necə söz əhlini mən heyran etməyim, Saib,
Əlindəki bu qələm bitməz hər neyistanda.

* * *

Yük etmə qəlbinə dərdin cahanın,
Quş asmaz hər budaqdan aşiyanın.
Yalandan çəkmə ah, qorxa fələklər,
Əyilsə, ox vurarmı öz nişanın?
Sağalmaz, Məcnunu zəncirləsən də,
Qəmi yox dalğadan çayda batanın.
Zamanı fəth elə odlu nəfəslə,
Belini odda əymişlər kamanın.
Gözəl güllər sifariş eyləmişlər,
Qının sərhəddini yazla xəzanın.
Sədəftək ağzını pak eyləsən sən,
Udarsan gövhərini asimanın.
Zəhərdən qıl həzər, adət edərsən,
Zəhərlə məhv olar axırda canın.
Canın əldən gedir, bundan nə fayda,
Olar faydası hər dərdə davanın.
Vəzifə nərdivanilə ucalma,
Buz üstədir ayağı nərdivanın.
Göyün ki, qaməti qövsə dönübdür,
Çətindir düz gedə işi cahanın.
Axan göz yaşları bir gün sel olsa,



Yıxar qəflət evin, olsun gümanın.
Sən öz xasiyyətinlə çox öyünmə,
Öyün ki, razı qaldı mehimanın.
Canı çox bəsləmə, ruha fikir ver,
Axı ayna gözüdür aynadanın.
Beyinsiz boş qəfəsdi dünya, Saib,
Sümüyü at, it olsun mehribanın.

* * *

Kim deyir ki, bir yerə çatmaz bizim hər dadımız?
Dağı yerdən oynadıbdır ahımız, fəryadımız.
Körpəni yaxşı yatırdar, yaxşı yellənsə beşik,
Silkələndikcə bizim möhkəmlənər bünyadımız.
Şirinin rəsmin ürək qanımla hər an çəkmişik,
Bisütunu eylədi məşhur fəqət Fərhadımız.
Dosta nöqsan saymıram, onlar bizi az yad edər,
Biz elə dövrandayıq, yaddan çıxıbdır adımız.
Ovu tutcaq tez kəməndlə bağlayırlar ovçular,
Gör necə çəkmiş kəməndlə dağ bizə səyyadımız!
Sanma məhv olduq, bizi qəlblərdə axtar sən yenə,
Bir də duşməz sellərə viran olan abadımız.
Döydü, bərkitdi bizi, Saib, zamanın zindanı,
Tövbə etdi, bir daha döysün bizi ustadımız.

* * *

Şehli yanağa baxmağa heç taqət olarmı?
Tufana gəmi düşsə, məgər rahat olarmı?
Məşuq düşə bilməz kənara sevgilisindən,
Hər hüsn məgər ayinədən xəlvət olarmı?
Dişlərsə ana döşlərini, qan əmər övlad,
Pislik edənə yaxşılıq heç qismət olarmı?
Hər lalə dağı qəlbdə min dağa dönürsə,
Getsən bağa bu hal ilə, bir ləzzət olarmı?
Qəddin bükülüb, ömr gödəldi, demək, artıq,
Əyri düzələr, heç belə bir söhbət olarmı?!
Bir kəs ki, xəsis oldu, ona asma qulaq sən,

Düşsə gözünə qılçıq əgər, zəhmət olarmı?!
Yalvarmadı şeh bağbana, qoy vəslə yetim mən,
Eşq aləmidir, burda məgər minnət olarmı?!
Naqqal adamın ağzını tiksən, yenə susmaz,
Söz qanmayanı hey başa sal, ibrət olarmı?
Xoşdur zarafat, kim bacarırsa onu, ancaq
Saibdə əgər yoxsa bu hal, adət olarmı?

* * *

Hicran düyünü qafilə oldu sinəm üstə,
Sarban uyuyur, qafilə qalmış hələ düzdə.
Gəzmə bu çölü, burda elə bir tikan olmaz,
Gül qönçəsini axtarsa, o tapmaya bizdə.
Bir beyt qədər fasiləmiz vardı həyatda,
Mənada birik, ayrı görünsək belə üzdə.
Divanə də olsaq, yenə bu səhrada qallıq,
Zəncir də qılınctək əyilər gərdənimizdə.
Saib, təzə yazmış bu qəzəldən, deyirəm mən,
Yarın da xoşu gəlsə, şad olluq özümüz də.

* * *

Ol qədər qəddim əyib, eşqim kaman eylər məni,
Alıb əldən ad-sanım, o, binişan eylər məni.
Qalmışam xalqın pənahında, demə, nahaqdı bu,
Tacirin çatsa əli, bil ki, talan eylər məni.
Müşkül işdir keçdiyin səhranı bir də keçməyin,
Qorxuram eşqim Züleyxatək cavan eylər məni.
Bu gözəl güllər məni heyran edibdir, qorxuram,
Bağiban yanında bu işlər yaman eylər məni.
Qəlbinin sirri nə oldu, bilmədim, Saib, onun,
Qorxuram fikrim nəhayət xəstəcan eylər məni.

* * *

Qan vermişəm hər kəlmyə mən öz bədənimdən,
Sönmüş o Süheyl ulduzu, dönmüş Yəmənimdən.
Ayla, Günəşə, şəmə də möhtac deyiləm mən,



Çox qəlbə işıq düşdü mənim əncüməninıdən.
Kim söhbətimə assa qulaq, dərk edər, əlbət,
Könlüm qədir axşamına dönmüş yenə qəmdən.
Başdan-ayağa ney kimi dil-dil ötürəmsə,
Zahirdə fəqət dilsiz-ağızsız bədənəm mən.
Dikmiş gözünü gövhərimə indi bu dünya,
Toz zərrəsi ancaq tökülür pirəhənimdən.[1]
Biz dəryada paltar hayına qalmışıq, əfsus,
Köynək yerinə gey hübabı,[2] söyləyək əhsən!
Tuti necə əlvan görünür bağda, çəməndə,
Mən də bəzərəm yer üzünü söz çəmənimdən.
Zəhr içsəm əgər, ağzım acı olmaz həyatda,
Ruzgarı acı etdi mənə çünki bu məskən.
Tükdən də zərif söz yaradan olsa da Saib,
Söz mülkünə inci tökürük biz də qələmdən.

* * *

Kim ki, varlandı, silindi xatirindən namımız,
Dövlətin artdı, unut dostu, budur əyyamımız.
Hər kəsin artar məqamı, çox yeyər öz qəlbini,
Özgə camlardan kiçik olsun bizim qoy camımız.
Saldı dərdə bu cəmiyyət incidilmiş qəlbimi,
O gümüş pullu balıqtək pullar oldu damımız.
Göz açınca gəldi, keçdi ömrümüz, çatdı sona,
Bir qığılcımtək bizim də yandı, söndü şamımız.
Sıxdı azad qəlbimi bu dünyanın gülşənləri,
Qumrunun o tar gözündə sərv olub əndamımız.
Yox müəllim dincliyi şagird əlindən heç zaman,
Zəhrə dönmüşdür həyat, çün hasil olmaz kamımız.
Arxamız səhradı, öndə yoxdu bir yol göstərən,
Cövri-dövrandan olub yüz parə qəlbi-xamımız.
Əldə lalə rəngli cam, Saib, özün də yoldasan,
Ta fələk dövran edir, bil ki, dolanar camımız.

[1] Pirəhən – köynək.
[2] Hübab – su üstündəki qovuqcuq.

* * *

Təsbehə zikr etməyə yoxdur daha heç halımız,
Vay ola o kəslərə, bəlli deyil əhvalımız.
Bu burulğan ki, görürsən, pişvaza çıxmış bizi,
Məcnunun ruhudur o, başlanmış istiqbalımız.
Hər hübab dəryada bənzər bir müqəddəs örtüyə,
Rəhmət ilə başlasa gər nameyi-amalımız.
Daş ürəkli kəslərin olsa tərəhhüm hissləri,
Dərk edərlər xalq üçün qalxar bu qeylü qalımız.
Sadəlövh kəslər bu dünyadan güdərlər mənfəət,
Biz humayıq, bayquşa möhtac deyildir falımız.
Alnımız qəlb aynasından həm təmizdir, həm də saf,
Orda əks olmuş bizim ilk ləhzədən iqbalımız.
Zənn edirdik, hər işi asanca həll etmək olar,
Şahinin cəngində imiş ancaq istiqlalımız.
Zülmətin rəngilə cövhərlənməmişdir aynamız,
Rahat etmiş abi-heyvandan bizi iqbalımız.
Biz ki, milçək ovlamaq üçün belə tor qurmadıq,
Onda hörümcək toru olsun gərək amalımız.
İndi peşmanlıq üzündən xırmana od vurmuşuq,
Saib, heç qəm etmə, yoxdur yer üzündə malımız.

* * *

Yaxamı verməd isə eşq gözəllər əlinə,
Məni ovsunlayaraq axırı saldı felinə.
Dönmədi çərxi-fələk, neyləmək, arzumca mənim,
Ləblərin atdı məni sanki baharın selinə.
Elə pejmürdəhalam, bir nəfəsim qalmış, o da,
Qorxuram, bir gün uça, dönməyə öz mənzilinə.
Qanadı sınmış o bülbül kimiyəm, bağbanlar
Kaş salaydı məni güldən toxunan zənbilinə.
Kimsəyə yoxdu gümanım, mənə dildarlıq edə,
Saib, uçdu yenə də fikrim o qürbət çölünə.



* * *

Bülbül qəfəsdə olsa, qalar çəməndən ayrı,
Şamı fanusa qoysan, düşər o səndən ayrı.
Qəlbin döyüntüsündən dağ titrədi yerindən,
Dağ çapanın başını saldı bədəndən ayrı.
Sinəmin atəşində bu dünya odlanardı,
Köynəyim etməsəydi dünyanı məndən ayrı.
Sənin məhəbbətindən dodaqlarım qovuşmuş,
Mümkünmüdür ki, qalsın sevən sevəndən ayrı?
Saib, məndən soruşma, nədən qürbətə düşdün,
Saldı qərib fikirlər məni vətəndən ayrı.

* * *

Saqi, gəl saxsı qədəhlə qəmimi yüngül elə,
Həvəsim yoxdu qalım dünyada bir zərrə belə.
Mən bu sonsuz çölü gəzməklə nəfəsdən düşdüm,
Tut əlimdən, axı var mənzilimə çox yol hələ.
Gahi boynumda həmayil, gahi çiynimdə idi,
Getdi zülfün də ömürtək, daha o düşməz ələ.
Hələ sən imtahan üçün elə divanə məni,
Ötməsəm Məcnunu mən, qaytar o dəm aqil elə.
Qorxulu səhrada yoxdursa mənə məskən əgər,
Saibəm, vardı ürəklərdə yerim hörmət ilə.

* * *

Göz yaşım ilə dönübdür qara torpaq çəmənə,
Qürbət eldən köç edib gəldi xəyalım vətənə.
Baxsam həsrətlə əgər hər qara daş parçasına,
Nəzərim altda dönər daş da əqiqi-Yəmənə.
O fəna xəncəri kəsmişdi həyatın suyunu,
Bu yanan torpağa su verdi gözüm yaşı yenə.
Aşiqin laləyə bənzər ürəyi qanla dolub,
Kaş verə badi-səba müjdə sevəndən sevənə.
Qara torpaq o Xütən ahusunun mişkin əmib,

Biz şir ağzında ikən fikrimiz uçmuş Xotənə.
Saib, eşq bəhri ilə başlamışam şerimi mən,
Misralar tabe olub, gör necə, fərman verənə?

* * *

Qəm çəkməyə layiq deyiləm, şad elə onda,
Viranə əgər etməsən, abad elə onda.
Tapşırma məni xatirata, eyləmə miskin,
Yol getməyə var qüvvətim, azad elə onda.
Bəlkə, çatam o qafiləyə, ordadı qəlbim,
Hümmətli ağam, layiqi-imdad elə onda.
Ölmüş kimiyəm, yoxdu bədəndə belə qanım,
Divanə, – deyib sən yenə icad elə onda.
Dünya eşidir fəryadını Saibin, ancaq
Sən də eşidib fəryadımı, yad elə onda.

* * *

Canı biz qurtararıq bu bədənin qeydindən,
Samanı çək kənara ta ki, üzə çıxsın dən.
Zülfdən azad edə gər bu dili-divanəmizi,
Bu həyatın toruna salmarıq ömrü yenidən.
Səyimin qarşısını almağa gər göstərə cəhd,
Bil, çüxa tikdirərəm bu qaba ip köynəyi mən.
Düşsə dövlət quşu bir gün toruma, and içirəm,
Mən səxavətlə onu qurtararam dardan həmən.
Saibin açmadı heç müşkülünü xalqın əli,
Üzünü Allaha tutmuş, tək odur imdad edən.

* * *

Bizim ki, özgələrə bənzəməz ibadətimiz,
Ürəkdə gizli qalar əhdimiz, şəriətimiz.
Yəqin budur səbəbi məqsədə yetişmir əlim,
Könüldən olduq uzaq, hasil olmaz hacətimiz.
Gülün vusalına şəbnəm kimi qovuşmamışıq,
O qəmli qönçəyə bənzər bizim bu halətimiz.



Nədir ki milçək, onu gizlənib şikar eləyək,
Huma şikar eləməklə bitər qənaətimiz.
Əgər ki, qıvrılaq atəş içində min dəfə biz,
Haray qoparmağa qoymaz, inan ki, qeyrətimiz.
O köç yolunda bitən barlı bir ağac kimiyik,
Payıza qalmayır heç vaxt budaqda nemətimiz.
Çiçəkli bağçada, Saib, bu insaf olmazdı,
Görəndə qönçəni biz olmasaydı rəğbətimiz.

* * *

Nə qədər qında yatıb pas atacaq xəncərimiz?
Paltar altında zirehtək qalacaq cövhərimiz?
Axı səhrayi-qiyamətdə ki bitmir lalə,
Orda, bil, olmayacaqdır daha dərdi-sərimiz.
Zöhrə[1] acizdi dönə ordumuzun dövrəsinə,
Canını məqsədi uğrunda verər ləşkərimiz.
Qanadı yanmış o pərvanəyə döndüm yenidən,
Alışıb yandı el uğrunda könül dəftərimiz.
Görmədim bir kəsi ki, ağlaya öz halımıza,
Özgənin bəxti üçün dövr eləyir əxtərimiz.
Düşmən hər söhbətimizdən necə də kam götürür,
Başsızıq şam kimi, məclisdə hanı rəhbərimiz?
Arzumuz qəmli ürəkdə dolanıb aha dönür,
Şah damardan od alıb sanki yanır məcmərimiz.[2]
Ağlayaq, ya da güləк, birdi bizimçün, Saib,
Göylərin şişəsini sındıracaq əllərimiz.

* * *

Bu böyük yolda təvəkküllə bitir hər səfərim,
Təsbehi, zünnarı[3] hörmət ilə saxlar kəmərim.
Qurumuş toxmu bulud islada, bitməz yenidən,
Qayğım artdıqca mənim, artdı ürəkdə kədərim.

[1] Zöhrə – Karvanqıran ulduzu, Venera.
[2] Məcmər – tonqal.
[3] Zünnar – xristianların bağladığı qurşaq.

O xumar gözlər olubdur məni də məst eləyən,
Elə zənn etmə, mənim yoxdu qədəhdən xəbərim.
Harda oldum, orada aşdı başımdan su mənim,
Bənzərəm gövhərə mən, qəmlər alıb dövrü bərim.
Mən sənin fikrin ilə, gör, necə daldım özümə,
Qurumuş başımın altında qolum, yox xəbərim.
Sinəmin hər sümüyü xəncərə bənzər necə də,
Odlu ahlar ilə dolmuşdu körüktək ciyərim.
Mən ki hər torpağa öz toxmumu səpməm, Saib,
Qəlbi yanmışları gördükdə çoxaldı şərərim.

* * *

Su qabına tökməzlər dardır deyə şərabı,
Dəli selə bənzədər gecə vaxtı məhtabı.
Qəlbin yoxsulluğundan göz yaşımız axmayır,
Qönçəni sıxsan, yenə çıxmaz onun gülabı.
Məcnun Leyli zülfündən düzəlmiş kəmənd bilər
Yol üstə ilğım vurub cilvələnən sərabı.
Qəlbi ölmüş insanın o yorğun gözlərində,
Kafur[1] olar ağ çiçək ay atanda niqabı.
O gözlər qovdu sənin gözlərindən röyanı,
Bir də röya görməzsən, Saib, çəkmə əzabı.

* * *

Torpaqdan qüvvət alıb keçir hər anı eşqin,
Laməkana az qalır çatsın məkanı eşqin.
Gecə qaysaq bağlamış, gündüz – təzə yaradır,
Aysız, günsüz dolanır, bil, asimanı eşqin.
Bu bir parça torpağı nurlandıran fələkmi?
Bəlkə, halə olubdur göydə kamanı eşqin?
Titrəyib qorxusundan torpağa endi göylər,
İç bu dolu kasanı, ol qəhrəmanı eşqin.
Burda duz ilə almas bir qiymətə satılmış,

[1] Kafur – ağ maddə.



Mənim duzumsa oldu məlamət kanı eşqin.
Allaha çox şükür ki, axır gətirdi bəxti,
Saib də olmuş indi bir pasibanı eşqin.

* * *

Aya bənzər o gözəl aldanar hər yağlı dilə,
Kişi istər ki, yolun rişəsini[1] alsın ələ.
Kim ki qafildi, o rahatdı səsindən təbilin,
Biz ürək vurğusunu yoxlayarıq nəbzi ilə.
Özünü öymək özü cəhlə bərabər kimidir,
Gödək olsa libasın, qorxusu yoxdur əzilə.
Hiylə ilə hünəri harda görübsən bir ola?!
Tülkülər ovlayanı ovlamayıbdır şir hələ.
Düşməni aciz hesab eyləmək acizlik olar,
Çox zaman gizlədilər çör-çöpün altında tələ.
Göz yaşı Saibi almış araya halə kimi,
Necə ki, halə çəkib dövrəsinə ay da belə.

* * *

Məstlik nişanı artıb üzündə dilnəvazın,
Baharda artırar çün nigar da xabi-nazın.
Qalmaz ürəkdə tabı, kim bircə yol görərsə
Bağa qədəm qoyanda hüsnün o sərvinazın.
Əqlin qüruru neylər eşqin gücü önündə?
Yox qorxusu kəklikdən dağlarda şahibazın.
Yoxsulluqda qorxutmaq aşiqləri nahaqdır,
Ömrün boyu qalacaq alnındakı o yazın.
Əgər Məhmudun əmri Hində qədər çatıbsa,
Ancaq o baş əyərdi fərmanına Ayazın.
Bir yol gedər həyatdan sadiq olan aşiqlər,
İldə bir yol köç eylər qafiləsi hecazın.
Qorxum budur ki, işvən həvəsimi oyatsın,
Arzusunu çin etsin bu ilhamı dəyazın.

[1] Rişə – damar.

Danış yarın zülfündən, yolu qısalda, bəlkə,
Əfsanədən danışmaq uzaq yolda nə lazım?
Dodaq dilin ucundan öz qanını içər, bil,
Şam tək yanan ürəyin eşitməzlər avazın.
Gözəlliyin nişanı öncə həyalı olmaq,
Həyalı olsan, ey gül, hasil olar niyazın.
Saib, məcazi-eşqin həqiqətin tapıbsan,
Həqiqətə dönübdür onunçun da məcazın.

* * *

Olduq necə halın duyanı biz bu cahanın,
Bizdə görünür sirri-nihanı bu cahanın.
Əsrarını faş eyləmədi dünya, biz olduq
Həm aynası, həm ayna tutanı bu cahanın.
Susduqda dönüb sir dolu gövhər oluruq biz,
Dindikdə bizik odlu bəyanı bu cahanın.
Torpağın ürək dağı kimi yazda göyərrik,
Üzdə olarıq fəsli-xəzanı bu cahanın.
Köhnə şərab ilə ürəyi nəşələnən pir,
Əslində bizik bəxti-cavanı bu cahanın.
Qətrə dəyişib gövhər olar söhbətimizdən,
Bir dürr kimiyik şöhrəti-şanı bu cahanın.
Zəncirə salıbdır bizi ol ahu nəzərlər,
Divanəsiyik, həm də ki, canı bu cahanın.
Düzlükdə bizi əldə əsa eylədi dövran,
Sonra əyərək etdi kəmanı bu cahanın.
Huşsuzluğumuz yadları qəlbən şad edibdir,
Yatdıq, yuxuda keçdi hər anı bu cahanın.
Karvanımızın zəngini əks eylədi səhra,
Bu ahı idi, həm də fəğanı bu cahanın.
Bizdə cəm olub sirri iki dünyanın, ancaq
Həm heyrətiyik, həm də gümanı bu cahanın.
Zahirdə əgər gözlərimiz pərdələnibsə,
Olduq gecə şamdanda yananı bu cahanın.
Saib, xəbərin yoxdumu bu məclisimizdə
Müşküldü ola dərdə qalanı bu cahanın.



* * *

Şad elə laləyanaq, zülfü pərişanları sən,
Nura qərq eylə ürəkdən o şəbistanları[1] sən.
Nə qədər çıxmayıb əldən, hələlik fürsət var,
Cəm elə, biryerə yığ cümlə peşimanları sən.
Kəbə hər yerdə olar, təmirinə cəhd eləmə,
Bacarırsan, şad elə qəlb evi viranları sən.
Gər Züleyxa həvəsindən qutarıbsan canını,
İki dünyaya əvəz eyləmə zindanları sən.
O məlahət kanını etmə qiyas lövlöv ilə,
Duzluğa kim aparar, söylə, nəməkdanları, sən.
Vaxt əzizdir, sən onun qiymətini, qədrini bil,
Qəlp pula satmaginən Yusifi-Kənanları sən.
Badə çox yaxşıdı, ancaq o da əndazə ilə,
Gəzmə bülbül kimi hədsiz bu gülüstanları sən.
Dodağın ixtiyarın vermə o arif əlinə,
Etmə ümmid tutuya ol şəkəristanları sən.
Güllərin bal gülüşü onları xəndan[2] eləmiş,
Hansı gülşəndə görübsən belə xəndanları sən?
Yüz gözəl göz görə, bil, Saibi heyran etməz,
Can atarsan, görərsən gözləri pünhanları sən.

* * *

Hər kəsin ki, əlləri adət edə peymanəyə,
Bil ki, o bir də uzanmaz təsbehi-səddanəyə.
Arif hey meyl eləyər həlqələnən zülfə tərəf,
Aşina olsa yaxından Kəbəyə, bütxanəyə.
Dolanım dövrəsinə qəlbin o pərgar timsalı,
Çünki könlüm quşu adət eyləmişdir danəyə.
Xisləti pis olan insana nəsihət eləsən,
Yozacaq hər sözü o, bəlkə də, bir əfsanəyə.
O kəsin bəxti gülübdür üzünə, çünki o da
Bir nişan həlqəsitək adət edər bir xanəyə.
Kim ki, Saib kimi dərk etdi zamanın dəhşətin,
Çəkilib durdu kənarda, döndü bir biganəyə.

[1] Şəbistan – dərvişlərin yataq yeri, hücrə.
[2] Xəndan – (burada) açılmış gül.

* * *

Aləmi-mənadan, ey ki, xəbərin yoxdu sənin,
Susmağından savayı, bir sipərin yoxdu sənin.
Sən də öz aləmini tərk elə, bir çıx kənara,
Axı bundan ki müqəddəs səfərin yoxdu sənin.
Yoxdu sərvin bəhəri, gör, nə geyinmişdi fəqət,
Qəlbini qəm yeməsin ki, bəhərin yoxdu sənin.
Xızr olar qorxulu səhrada sənin həmsəfərin,
Bunu dərd eyləmə bir rahibərin yoxdu sənin.
Zənn edirsən ki, tikanlıqda sənin hər tərəfin,
Çünki o qəlbin evində gövhərin yoxdu sənin.
İstəyirsən calaq et güllərini qanqal ilə,
Bil ki, bu işdən axır bir səmərin yoxdu sənin.
Sındırıbsan qəfəsi, qorxu düşübdür canına,
Göylərə uçmaq üçün balu pərin yoxdu sənin.
Hünərin yoxdusa, Saib, nə öyün bunca belə,
Nə özündən həzər et ki, hünərin yoxdu sənin.

* * *

Kuzətək meyxanadan özgə yerim yoxdu mənim.
Hopmuşam torpağa, heç bir səfərim yoxdu mənim.
Uşağın atdığı daş bu dəli qəlbə nə edər?
Kəkliyə bənzəyirəm, bir kədərim yoxdu mənim.
Üstümə yağsa qılınc zərbələri dalğa kimi,
Sinədən başqa döyüşdə sipərim yoxdu mənim.
Ürəyim səhraya bənzər, necə mən şadlıq edim,
Orda bir zərrə işıqlı gövhərim yoxdu mənim.
Ye "şəkərdən də şirin" sən Əbucəhl qarpızını,
Qaş-qabaq sallama ki, heç şəkərim yoxdu mənim.
Mən o sərvəm ki, sarı yarpağımı yel aparar,
Qapılar gəzməyə özgə nəfərim yoxdu mənim.
Hünər eşqin nəzərində nə zaman məqbul olub?
Hünərim bircə budur ki, hünərim yoxdu mənim.
Qəlbimin istəyi eşqin qəmidir; Saibə de,
Ondan özgə ürəyimdə bəhərim yoxdu mənim.



* * *

Vəslü hicran bir olar qəlbdən heyran olana,
Daşını qoy, tərəzi başını əysin o yana.
İşi vaxtında görərlər, necə ki, vaxt oldu,
Yusifin yatması da etdi kömək bir gün ona.
Göz yaşı axmağa başlarsa şikayət edərək,
Kirpiyin səfləri mümkünmü önündə dayana.
Gül ki öz ətrini ehsan eləyib minnətsiz,
Yaxşıdır, minnəti qaytar elə minnət qoyana.
Saib, ay üzlü gözəl kaş yad edə dostlarını,
Bu yatan bəxtin ümid var ki, o dəmdə oyana.

* * *

Qapını bağlayacaq bağban, əgər gəlsə bahar,
Ağ gülü pambıq edib öz qulağın güllə tıxar.
Yar ayın nurunu səhrada qum üstündə görər,
Fikr edər, süddü belə, qumların üstündə axar.
Eşqimi gizləmişəm indi peşimanam özüm,
Duz dadıb duz qabını gizləməyə verme qərar.
Min dəfə göydəki aydan çox olur şölələri,
Sinəmi, varlığımı yandıran o odlu qübar.
İsfahandan gedir hər ölkəyə, Saib, sürmə,
*Misridə, Şamda bizim sürməyə heç tay tapılar?*

* * *

Qocalıq vaxtı yerə qoyma sən o mey camını,
Qaytarır köhnə şərab gəncliyinin ilhamını.
Aşiqə canı fəda etməyi təlim eləmə,
Söndürər badi-səba, qaydadı, eşqin şamını.
Məni söndürdü səhər yelləri, yoxdur hünərim
Yetirəm şama yanan qəlbimin hər peyğamını.
Ümidim vardı ki, yaz fəsli kimi əldə çiçək,
Başlayardım yenidən mən ömürün bayramını.
Nə qədər qəm yemişəm, qəlbdə nihan saxlamağa

Bədnəzərdən sinəsin dağını, qəlbin qəmini.
Peşmanam, dişləyirəm barmağımı heyrətlə,
Vermişəm bada mən ömrün o bahar əyyamını.
Çox təəccüb edirəm Saibə, incitdi nahaq,
Duymadı yarın o incə, o zərif eyhamını.

* * *

Çatmayır dəryadakı sərvətə hərgah əlimiz,
Nə olar gövhər ilə dolsa əgər sahilimiz?
Gəlməsin İsa bizim dərdimizə dərman üçün,
Badənin gül dodağıyla açılar müşkülümüz.
Söylə, qəmdən savayı, qəlbimizi kim tanıyır?
Seldən özgə, kimi görmüş qapıda mənzilimiz?!
Biz əkən tarlaların məhsulu yoxsulluq olur,
Bir qarışqa gözünə yerləşəcək hasilimiz.
Mumiyatək dağılar qəlbimiz axırda bizim,
Çünki dərmandı bizə öz qəmimiz, nisgilimiz.
Fələyin minnətini çəkməyə dəyməz, Saib,
Nəyə lazımdı ki, minnətlə açılsın gülümüz.

* * *

Həlqə olduq qapısında yenə meyxanələrin,
Bu hal ilə yetişək vəslinə peymanələrin.
Biz xarabata uşaq vaxtı gəlib düşməmişik,
Kərpic olduq divarında bu qədim xanələrin.
Dilimin xəncəri aşiqləri doğrar gündüz,
Gecə şəmim yaxacaq atəşə pərvanələri.
Məşvərətlə açılır sirri əyər dünyamızın,
Mən deyim, sən də çevir təsbehinin danələrin.
İstərik tez qurtara söhbətini indi qələm,
Vaqif olluq halına sonra da divanələrin.
Xabi-qəflət alacaq, alsa bizi ağuşuna,
Bircə anda düşərik qoynuna əfsanələrin.
O gözəllər elə hopmuşdu bizim canımıza,
Saib, olduq mayası biz də bu bütxanələrin.



* * *

O acı sözlərə səbr eyləyərək dözdüm mən,
Çün kamal əhli olan nakam olur, sezdim mən.
Hərzə söz söyləyənə yaxşı cavab susmaqdır,
Susaraq, hay qoparan hərzə dili üzdüm mən.
Kama çatmaq diləyirsən, eli çatdır kamına,
Bunu gördüm, hara getdim, haranı gəzdim mən.
Od ilə sən mumu bir yerdə necə saxlayasan?!
Atəşimlə poladı mum kimi, bil, əzdim mən.
Unudublar səni, Saib, yada salmaz kimsə,
Dərdimi ləl ilə dağ sinəsinə yazdım mən.

* * *

Surətin sanki səməndər eləyər ayinəni,
Gülüşün sinəsi gövhər eləyər ayinəni.
Hüsnünün şövkəti İskəndərin o şöhrətinə,
Şəfəqin ayə bərabər eləyər ayinəni.
Can alan xalın ilə şəkkərə dönmüş dodağın,
Tutiya, bəlkə də, şəkkər eləyər ayinəni.
Aləmi yandıran hüsnün eləməz kimsəyə zülm,
Odlu səhra, ya da məhşər eləyər ayinəni.
Tərləmiş surətin aydan da gözəl cilvələnər,
Baxana nurlu bir əxtər[1] eləyər ayinəni.
Qanadım mum kimidir, Allah, özün dadıma çat,
Atəşin şöləli məcmər eləyər ayinəni.
Dolanar başına məşşatə, necə zərgələr
Bəzəyib haşiyəsi zər eləyər ayinəni.
Arif insan ilə söhbət özü bir dövlətdir,
Görkəmin bir daha zivər eləyər ayinəni.
Göz yaşı tökdü xəcalətlə baharın buludu,
Şəbnəmin çünki təzə-tər eləyər ayinəni.
Sadəlövh tez düşər həmsöhbətinin təsirinə,
Təsirin tutiya bənzər eləyər ayinəni.
Yusifi görmək üçün güzgü həvəs etməyəcək,

[1] Əxtər – ulduz.

Baxışın, bil ki, tavangər[1] eləyər ayinəni.
Daş ürəklər əriyib döndü suya hicrində,
Gözlərin çeşmeyi-kövsər[2] eləyər ayinəni.
Saibin qəlbi yarın gül üzünə heyrandır,
Dil açar tərifə gövhər eləyər ayinəni.

* * *

Qəlbin hər bir mətləbin həmxanədə biz tapmışıq,
Şam yanıbdır, nurunu pərvanədə biz tapmışıq.
Bəzi dostlardan əgər ki, aşinalıq ummuşuq,
Çox təəssüf ki, onu biganədə biz tapmışıq.
Nöqtədən tumar[3] dolu hərf istəsən, tapmaq olar,
Çoxları çox ov edib, bir danə də biz tapmışıq.
İynətək kipriklərin səf-səf durubdur aşikar,
Zülfünün hər tək-təkin bir şanədə biz tapmışıq.
Sildi üzlərdən tozu-torpağı bu tufan seli,
Bu halı, bu şadlığı meyxanədə biz tapmışıq.
Üzdə əks eylər ürəkdə toplanan nur şöləsi,
O nuru meylə dolu peymanədə biz tapmışıq.
Bir günahsız ov kimi düşdü tora axır könül,
Hər nə tapdıqsa fəqət divanədə, biz tapmışıq.
Saibi guşə-nişinlikdən ayırmaz zər belə,
Dünyanın hər şadlığın bu xanədə biz tapmışıq.

* * *

Heç kim bilmir gecələr yatmayanın həsrətini,
Xosrov istər ki, bilə Şəbdizinin qiymətini.
Dərya sakitsə, demək, çör-çöp ilə söhbət edir,
Bu gövhər ümmanının kəs bu ucuz söhbətini.
Qanlı qəlbin xəbərin çün qan içən eşq bilər,
Meylə dolmuş qədəhin saqi bilər hörmətini.
Nazın öldürsə kimi, bir də qiyamətdə durar,

[1] Tavangər – dövlətli, güclü.
[2] Çeşmeyi-gövsər – (dini) cənnətdə bulaq.
[3] Tumar – lülələnmiş uzun kağız. Şairlər çox vaxt şeiri belə kağızda yazarmışlar.



İti xəncər yarası sonra verir dəhşətini.
Şah ağılsızsa əgər, şöhrəti də olmayacaq,
Fərhadın eşqi azaldıbdı şahın şövkətini.
Yaralı sinəmi harda açıram dəftərtək,
Artırır arif olan kəslərin o həsrətini.
Güllərin yarpağını göz yaşı pak eyləyəcək,
Bülbül hardan görür axşam şehinin surətini.
O bahar ömrümüzün günləri düşdükcə yada,
Saibin fikri gəzər Təbrizin o cənnətini.

* * *

Meyə batmış dodağın gör nə gətirdi başıma,
Huşumu başdan alıb sonra güvənmə huşuma.
Elə sənsizləmişəm, nanəyə bənzər ürəyim,
Gəl tələs, gəl, əzizim, birbaşa gir ağuşuma.
Öz əlinlə bu cəvahir evini bağlamısan,
Barı insaf elə sən gəl bu ləbi-xamuşuma.
Qara zülfün yuxuda söyləyir əfsanə mənə,
O dönüb sübhəcən həmsöhbətimə, sirdaşıma.
Mənəm ol qümri ki, Saib, o yaşıl sərv ağacı,
Yarpağından əba tikmiş ki, gəlir çox xoşuma.

* * *

Oxşayar qəlbi məgər seyri-gülüstan tənha?
Bəlkə də, verdi icazə bizə bağban tənha.
Yazbaşı dostlar ilə bağları gəzmək dəmidir,
Xızra nə ruh verəcək ömri-cavidan tənha?
O təzə qönçələrin seyrinə dalmaq xoş olar,
Məst edib bülbülü gül, bağda da bağban tənha.
Qəlbimi oxşadı ətriylə yenə sübh yeli,
Kaş ki, heç başlamaya səhrada tufan tənha.
O qara gözlərin alsın sinəmi bir də nişan,
Neçə yol oxladı bu sinəmi dövran tənha.
Elə bir fürsət ola, biz də ürəkdən danışaq,
Deyərəm sözlərimi mən yara pünhan tənha.
Bir mənəm, bir də ki, bu nəmli gözüm qürbətdə,
Saibə qismət ola bir də İsfahan tənha.

* * *

Bir nəzər salsa əgər nərgizə oxşarın sənin,
Təzədən cana gələr, bil, neçə bimarın sənin.
Düşsə şəbnəm gül üzə, qorxu budur təsir edə,
Asimanın göz yaşıyla güldü gülzarın sənin.
Gözlərində bir quru səhra olar dünya üzü,
Kim ki, bağlarda görər məstanə rəftarın sənin.
Dimdiyində tutinin sözlər də heyrətdən donar,
Üzbəüz dursa onunla güzgü rüxsarın sənin.
Hüsnünə baxmaq üçün yox kimsədə cürət belə,
Çün yaşardı gözləri, gün gördü didarın sənin.
Gör şirinlikdən o ləblər qönçələnmişdir necə!
Kimsə bilməz qönçədə gizlənmiş əsrarın sənin.
Kirpiyindən nizələr tutmuş təbiət çöhrənə,
Gülüzü hifz eyləsin pis gözdən ol xarın sənin.
Kim səni dinlərsə, o, vallah, ürəkdən şad olar,
Çünki düzdür hər sözün, hər əhdin, ilqarın sənin.
Aynaya cövhər çəkirlər ki, daha parlaq ola,
Dövrələnmiş ol qara zülfünlə rüxsarın sənin.
Güldərən heyrət edər, gördükdə səntək bir gülü,
Bəlkə, məst eylər onu bir anda gülzarın sənin?
Cürət etməzdi çəkə meydana öz gövhərlərin,
Yusifi-Kənan əgər görsəydi bazarın sənin.
Torpağın altında da rahat yata bilməz, inan,
Kim ki torpaq üstə olmuşdur giriftarın sənin.
Nə qiyamətdən xəbərdardır, nə də duz dadmış o,
Saib, hər kəs görməyib o sərvqəd yarın sənin.

* * *

Yuma bilməz gözünü aşiqi-divanə gecə,
Sübhədək çünki açıqdır neçə meyxanə gecə.
Boş söz ilə boş ürək ki, dola bilməz heç vaxt,
Kim oyaq qalsa, ona xoş gələr əfsanə gecə.
Qəlbimin sərvəti sinəmdəki bu dağlardır,
Hər uçulmuş ev olar bayquşa da xanə gecə.



Ömrünü sərf eləyir şam da qaranlıq gecəyə,
Odlu göz yaşını şamın içə məstanə gecə.
Səhərin gül üzü xoş gəlmədi pərvanələrə,
Şənlənib rəqs eləyər şəm ilə pərvanə gecə.
Yoldaş oldur ki, silə dərdü qəmi qəlbindən,
Necə ki, yoldaş olur aşiqə peymanə gecə.
Parlaq ulduz gecələr nur çiləyir yer üzünə,
Sən də yan, şölə çəkib şam kimi mədanə gecə.
Yoxdu xəlvətdə yerim, təkcə xəyalımla qalım,
Zahidinsə yeri mehrab, özü rindanə gecə.
Gecə məclisdə olan sübhü pərişan açacaq,
O qara saçlarına çəkməginən şanə gecə.
Qəmə fürsət düşə, çəkməz ətəyindən əlini,
Özünü xəlvətə ver, çək yaxanı yanə gecə.
Xəstə dostun yanına dəyməyə, Saib, elə get,
Gəlişin ta ki, dönə dostuna dərmanə gecə.

* * *

Çalış, riayət elə qanuna itaətlə,
Amandı, yorma nahaq xalqı sən ibadətlə.
Çalış qonaqlığa getmə, əgər gedər olsan,
İtaət elə sən hər qaydaya mətanətlə.
Əgər ki, var inamın, tanrı hər şeyi eşidir,
Yavaşdan eylə duanı ürəkdə hörmətlə.
Yemək ki, süfrəyə gəldi, namazdan əl çək sən,
Çalış, itaət elə qaydaya cəmaətlə.
Yağ ilə bal kimi ol cümlə məclis əhliylə,
Üzünü turşudaraq baxma sən küdurətlə.
Tələsmə məclisi qurtamağa, hara getsən,
Çalış ki, yormayasan xalqı boş nəsihətlə.
Biri danışsa əgər, kəsmə sən sözün yarıda,
Üyüdər öz dənini xalq həmişə növbətlə.
Gedəndə məclisə öyrən əzəl nədir səbəbi,
Soyutma məclisi, sən pıçhapıçla söhbətlə.
Ziyafət olsa, ora varlılar gələr, şəksiz,
Gedərsə yoxsul əgər, əyləşər nə halətlə?!

Belə zamanda ki, yox söhbətin xiridarı,
Çəkil də bir yana sən, dinmə, sus məharətlə.
Əgər ki, guşənişin olmaq istəməz Saib,
Başa salın onu siz indi bu nəsihətlə.

* * *

Mən pərişan deyiləm hali-pərişanlığıma,
Şəmşirəm, gülmə daha sən mənim üryanlığıma.
Odlu nitqimlə mən hər məclisə şam olsam da,
Yanmağım oldu səbəb axırı peşmanlığıma.
Bu həyat əydi mənim qəddimi, oldum ikiqat,
Daha kimdir inana sahibi-meydanlığıma.
Hələ məktəbli ikən dərsimi etdim əzbər,
Heyran olmuşdu hamı əbcədə[1] heyranlığıma.
Qana batmış dodağın açdı qızılgül naz ilə,
Elə bil, razılıq etdi o da bağbanlığıma.
Bir otaq tikdim ona, ayna kimi şəffaf idi,
Gəlmədi heyran ola bir daha insanlığıma.
Harda viranə görübsən, orada gövhər var,
Baxmasın, Saibə de, zahiri viranlığıma.

* * *

Həvəsə tabe o gül üzlü nigar olsun niyə?
Bu işıqlı ildırım kolluqda tar olsun niyə?
Badədə bir qüvvə vardır, daşları mina edər,
Mey içib, huşdan gedib, insan xumar olsun niyə?
Havalar xoşdur, çəmən güllük, düzənlər yamyaşıl,
Bəs bizə qismət baharda dörd divar olsun niyə?
Hər nəfəs qəvvas üçün bir sinə gövhərdir, inan,
Bəzi nadanlar bu gövhərdən bezar olsun niyə?
Xoşdusa bir daş kimi yolda nişantək durmağı,
Zəng kimi karvanda o bəs biqərar olsun niyə?
Bir kəsin dəryaya dönməkçün var isə imkanı,
Bir hübabtək su üzündə o qabar olsun niyə?
Saib o ustada yazmış bu cavabı, söyləyər,
Ta nəfəs varkən nəfəssiz, intizar olsun niyə?

[1] Əbcəd – müəyyən bir tarixi və ya rəqəmi ərəb əlifbası ilə ifadə etmək üsulu.



* * *

Həsrətə tab gətirər kim ki, yanıb, eşqə düşə,
Bil ki, şirin gözlərilə nurlanar axşam meşə.
Eşqidə nə sirri varsa, qəlbidə tutmaz qərar,
Al şərabın təsirindən rəngbərəng olmuş şişə.
Bəhrə vermiş torpağı şum eyləmək asan olar,
Gənclərə nisbət qoca möhkəm olur hər bir işə.
Eşqidir ümdə səbəbkar, dağ çapan nakam ölüb,
Şirinin təsvirini çəkmək deyil ancaq peşə.
Saib, heç çıxmır yadımdan ol yarın nazik beli,
Bu xəyallar dərd olub bir də bu hicran görmüşə.

* * *

Bu cahanı başıma hicr dağı dar eləyib,
Nə edibdirsə mənə, laləyanaqlar eləyib.
Dikmədim gözlərimi yarın o gül xırmanına,
Qəlb evim xəlbirə bənzər, o sitəmkar eləyib.
Qaməti ox kimi düz yarın əlindən yanıram,
Kaman etmiş o məni, bəlkə, yeri var, eləyib?
Mən xərabatda göyərdim, orada boy atdım,
Bir nadan daş ki, atıb dərdimi aşkar eləyib.
Doydu qəlbim də, gözüm də bu həyatdan o, məni
Bir xəzan yarpağıtək dərdə giriftar eləyib.
Bir uşaq xisləti var məndə, qocalsam da əgər,
Fələyin zülmüdü, mən bəxtsizi bimar eləyib.
Eyləyən vardı tamah bir çöpə də, ey Saib,
Tamah ancaq xəsisin xislətini xar eləyib.

* * *

Görəsən, dünyada bir qəlbi şad olan tapılar?
Yer şoranlıqsa əgər, orda gülüstan tapılar?
Havayı oxlar üçün eyləmə sən ömrü hədəf,
Ox, kaman olsa əgər, bəlkə də, nişan tapılar.
Yamanı, yaxşını yol yoldaşı olmaqla bilin,
Ox əgər əyri ola, uçdumu, nöqsan tapılar.
Baharın məqsədi var gülləri açmaqda yəqin,

Gül açan vaxta yəqin nəğməyə imkan tapılar.
Qələmin yox hünəri bəs bunu tərif eləsin,
Var neyistansa, şir üçün təzə meydan tapılar.
Yazda bülbüllər ötər, bağlara çıx, sən qulaq as,
Gəlsə qış fəsli, daha bülbül hayandan tapılar?
Gülü gülşəndə xar ilə görəcəksən birgə,
Nə zaman gül açılar, onda da bağban tapılar.
Hər zaman hümmətimiz yüksək olub, fayda nədir?
Nə olub mətləbimiz, sanma ki, asan tapılar?
Sən də o aynaya bənzər sinəni açsan əgər,
Aynaya baxmaq üçün tuti, doğrudan, tapılar.
Çəkilib bir kənara, ayrıla bu aləmdən
Bilsə Saib, ona da yaxşıca canan tapılar!

* * *

Oynadar, vallah, yerimdən nəğmə mən divanəni,
Mütrübün nazı verər axır selə bu xanəni.
Aşiqi yarın vusalı yandırar gör bir necə,
Yandırıb kül eyləyir şamlar yazıq pərvanəni.
Kim ola meydən xumar, hər an duyar mey ətrini,
Arif insanlar fəqət, görsə, tanır dürdanəni.
Çün məzaği-eşqidən tutduq həqiqi eşqə üz,
Biz unutduq o uşaqlıqda qalan əfsanəni.
Şəhridə gördükləri Məcnunu saldı çöllərə,
Çox da asan gəlməsin dərk eyləmək biganəni.
Qəlb əbəs dikmiş gözün zülfündə pünhan xalına,
Eylə də asan deyil tordan götürmək danəni.
Şam kimi sönmüşsə məşuqə, inan ki, canlanar,
Görsə Fərhad tək ona meyli olan mərdanəni.
İnsafa gəlməzsə dərğa, onda, Saib, biz gərək
Mey verib, məst eyləyib, sonra açaq meyxanəni.

* * *

Könlümə ram olmadı ahuya bənzər gözlərin,
Torpağa kölgə salıb kirpiyi neştər gözlərin.
Gözlərim layiq deyil, rüxsarına baxsa əgər,



Sən uzaqdan, sevgilim, aşiqə göstər gözlərin.
Olsa idi əllərimdə öylə bir imkan mənim,
Bil, qızılgül yarpağıyla örtərəm tər gözlərin.
Daş-tərəzində sənin dağlar da pərsəng daşıdır,
Nazəninlərtək edib çün nazı əzbər gözlərin.
Bilmirəm bu sirri mən kim, zülfünün tərifini
Şanəmi yaymış elə, yoxsa ki söylər gözlərin!?
Böylə bir söhbət gəzir, guya ki, sürmə çəkmisən,
Xoş yaranmış xülqətən, de, sürmə neylər gözlərin?
Söylə, heç yaddan çıxarmı şeridə şah beyt olan?
Çıxsa yaddan, Saibə, bilməm, nə eylər gözlərin.

* * *

Qorxu alarmı, söylə, qəlbi qəvi olanı?
Bülbül məst oldu bağda, itirdi aşiyanı.
Özünü dərk edənlər rəhbərdən imdad ummaz,
Dərya olar axırda selin də son məkanı.
Kim ayrılarsa yardan, qəlbin qoyar əmanət,
Quşlar uçub gedəndə aparmazlar yuvanı.
Təəccüblə baxan göz məhcub[1] üzə çəkər dağ,
Uşaq hasarsız istər bağı bəhər zamanı.
İslanmışın yağışdan nə qorxusu, deyərlər,
Sükan əgər düz olsa, gəmi yarar tufanı.
Yusif utandığından önümdən öylə keçdi,
Külək necə gicəldər qumluqda karivanı?!
Məzlumların ahından çatar cəzaya zalım,
Daha çox nalə eylər, möhkəm çəksən kamanı.
Ağac səmərsiz olsa, gərəksiz daş kimidir,
Payız küləklərinin daha çoxdur ziyanı.
Sakit duran nadana irad tutma, amandı,
Mümkün deyil zor ilə bağlamaq bu dükanı.
Hümmətli olsa insan, bəxtdən şikayət etməz,
Fərhad külüng vuranda coşub damarda qanı.
Eşqin dağıyla, Saib, işıqlanmaz ürəklər,
Nurlandıran ürəkdir bu sonsuz asimanı.

[1] Məhcub – utancaq.

* * *

Tez ol, saqi, gətir cami, qızıl rəngə düşüb hər yan,
Payız yarpaqları geysin əlinlə zərli atlasdan.
O qəflət əhli mümkünmü dura eşq əhlinə qarşı?
Oyadar xabi-qəflətdən həyatı qətlələr asan.
Ürək də gah bu dağdan, gah o dağdan aslanır bəzən,
Necə qızdırmadan xəstə dəyişər yastığı hər an.
Qiyamət qopsa dünyada, sanar kəklik oxur daşda,
Ona təsir edərmi heç bu qəlbin etdiyi əfğan?
Bu sirlər aşiqi qəlbim edibdir bir sözü əzbər,
Ürək əvvəl demiş "əhsən", dil isə öyrənib ondan.
Nə ləl vardı, nə də gövhər gedəndə İsfahandan sən,
Özünlə şer apar, Saib, bəzənsin sözlə Hindistan.

* * *

Vurma daş qəlbin önündə daşa öz gövhərini,
Çəkmə hər bir qaralan aynaya öz cövhərini.
Əgər acizsən o pərvanə kimi, atəşə yan,
Yoxsa göylərdə uçub yandır o balu pərini.
Cahanın başına fırlandı günəş sərsəri tək,
Kim səfər eyləsə, bağlar yəhərə şeylərini.
Paxılın atdığı oxdan nə qədər gizlədəsən
Əba altında zirehtək sən həyat cövhərini?
Atmasam torpağa, Məcnun deyiləm, mən günəşin
Başıma min naz ilə qoyduğu taci-zərini.
Saibin başının üstündə gəlib durmasa yar,
Qanlı göz yaşı, inan, isladacaq bəstərini.

* * *

Bu cahanda heç nəyə, bil, etibarım yox mənim,
Çün zəmanəylə döyüşməkçün qərarım yox mənim.
Odlara yanmış toxumdur bu həyatda hasilim,
Ömr ötüb keçdi daha, heyhat, baharım yox mənim.
Dərya ilə gövhərin fərqi, inan, yoxdu mənə,
Mən elə bir dəryayam ki, heç kənarım yox mənim.
Torpağa döndərsə dövran yolların üstə məni,



Bil ki, dövrandan bir özgə intizarım yox mənim.
Öz halımla qalmağım bəsdir mənimçün dünyada,
Çün həyatın işləriylə indi karım yox mənim.
Hamı tək bir istəyim vardır bu aləmdə fəqət,
Gözlərəm öz arzumu, özgə qərarım yox mənim.
Mən ki, əlvan nemət üçün içmədim qəlbin qanın,
Bu səbəbdən sinəm üstə laləzarım yox mənim.
Taleyim yarpaq kimi qonmuş nəsimin çiyninə,
Hər zaman yollardayam, heç bir qubarım yox mənim.
Ayna tək əks eyləmək olmuş əzəldən qismətim,
Ayna tək əks etməməkdə ixtiyarım yox mənim.
Bu həyatda olmadım mən rütbə, mənsəb düşgünü,
Çünki heç bir şöhrətə yox iftixarım, yox mənim.
Var ümidi Saibin də bir gül olsun qisməti,
Gözlərim olsun girov, özgə madarım yox mənim.

* * *

Xoş o əyyama ki, həmdərdü dəva olduq biz,
Fikri bir, arzusu bir, əhdə vəfa olduq biz.
Bir idik mənada, bir beytidəki mənatək,
İki misra kimi surətdə cida olduq biz.
Qələmin bir ucu ilə yazılan bir söz idik,
İki hərfdən düzələn sözdə səda olduq biz.
Bir toxumdan göyərən biz qoşa yarpaqlar idik,
Bir bitib, bir göyərib, həmnişana olduq biz.
Bəxtimiz, taleyimiz, günlərimiz də xoş idi.
Bir hümadan doğulub, sonra hüma olduq biz.
Küçəmiz, mənzilimiz düşdü uzaq, qəm yemədik,
Dostluğu, etibarı, əhdi bəqa olduq biz.
Özümüz eylədik öz çarəmizi, Saib, inan,
Dərd əlində nə əzildik, nə fəna olduq biz.

* * *

Gərçi can zahirdə olmuşdur o canandan cüda,
Dalğanı kim eyləmiş əslində ümmandan cüda?
Kim olub can bir qəlib müşküldü bir də ayrıla,

Bir kitabdan cüzvələr katib edər asan cüda.
Çün mənim hər zərrəmin bir özgədir məcnunluğu,
Dəryada hər zərrəmi etməz mənim tufan cüda.
Eşq hər yerdə ola, qalmaz gözəllikdən uzaq,
Olmadı zindanda da Yusif Züleyxadan cüda.
Yanmasa təndir əgər, bişməz çörək də, şübhə yox,
Qəlbi tez eylər özündən hər soyuq dövran cüda.
İtməz ol şey ki, ələ gəlsə çətinliklə, inan,
Dəryadan heç görmüsən asan ola mərcan cüda?
Püstənin şor ağzını Saib şəkərlə açdı, çün
Gül dodaqlar qənd ilə hər dəm olur xəndan cüda!

* * *

Görünsə nagahan Leyli əgər məstanə səhrada,
Olar Məcnun əlində lalələr peymanə səhrada.
Əsiri-eşq olar hər kəs, gedər azadlığı əldən,
Qumun hər dalğasın zəncir bilər divanə səhrada.
Biyabanda hanı Leyli kimi xalsız olan ceyran?
Cünunluq zəncirindən mən atıldım yanə səhrada
Bunu fikr etməz hər Məcnun, dağıtsa zülfünü yellər,
Pələngin pəncəsindəndir fəqət hər şanə səhrada.
Cünunluq dağı səhrada Süleyman möhrünə bənzər,
Cünunlar mehriban olsun gərək heyvanə səhrada.
Şəhər əhlinə yüz ev tik qızıldan, gözlər doymaz,
Biyaban əhli Hatəm[1] tək salıbdır xanə səhrada.
Qaçar məndən də ahular, fəqət bir vaxt xoşbəxtdim,
Çıxardım ahularla mən necə seyrana səhrada!
Bu tənhalıq məni, Saib, axırda vəhşətə saldı,
Elə zənn eylərəm, oldum daha biganə səhrada.

* * *

Qırmızı qan kimidir çün şərabı şişəmizin,
Qəlbi incitməyəcək inqilabı şişəmizin.
Daş nədir, nəzik ürək sözlə sınar, bəllidi bu,

[1] Hatəm – əfsanəyə görə, əliaçıq, səxavətli bir adam olmuşdur.



Sınmaz hər daşla fəqət, vardı tabı şişəmizin.
Biri zor ilə əgər sındıra bilsə şişəmi,
Yandırar qəlbimi, vallah, əzabı şişəmizin.
Gövhərə təsiri yoxdur, əgər il keçsə quraq,
Bir bulaq tək ötəcəkdir rübabı şişəmizin.
Mey düzəldən kişiyə, ləl kimi zövq verər
Camda hər dalğası, ya hər hübabı şişəmizin.
Əql hər maneənin üstünə ləşkər çəkəcək,
Elə ki, hazır olar, bil, rikabı şişəmizin.
Əyib öz boynunu cəmin önünə getməyəcək,
Belə etsə, çoxalar iztirabı şişəmizin.
Şəraba həsr elədi ömrünü Saib, yenə o
Olmadı, olmadı, bil, kamiyabı şişəmizin.

* * *

Kəmalın hüsnü hara, gözdə iztirab hara?
Şükufə bəhri hara, xeymeyi-hübab hara?
Görəndə zərrəni mən sanki bir cahan görürəm,
Ürəkdə tab hara, odlu-afitab hara?
Könlümdə qalmamış, əfsus, qəmdən özgəciyim,
Bizim xərabat hara, nuri-məhitab hara?
Günəş bərabəridir, təşbeh eyləsək üzünü,
O bayram ayı hara, səndəki hicab hara?
Səni gəzəndə bütün dünyanı gəzib aradım,
Hara gedim daha, ey xanimani-xərab, hara?
Məni ki məstlərin nərəsi oyatmadı bəs
Deyin, o nərə hara, nəğmeyi-rübab hara?
Tutaq ki, çatdı mənə növbə bir sual eləyim,
Sözün niqabı hara, qüdrəti-cəvab hara?
Bu gül yanaqlıların seyrinə dalıb qaldım,
Çəkib apardı məni aldadıb sərab hara?
Gülü ləçəklərinin ətri rüsvay eləyir,
Üzünə çəkmə niqab, sən hara, hicab hara?
Kal ilə dəyişmə, bir gözlə baxma, fərqini bil,
Baxanda göz yaşına, möv hara, kəbab hara?
Tutubdu aləmi dərdsizliyin bəlası, deyin,
Hara getdim ki, bu aləm olub xərab, hara?

Elə tutub gözümün kasasın bu göz yaşı kim,
Yuxum uçubdu tamam, mən hara, o xab hara?
Yarın camalına bax, şöləsi düşüb cahana,
Bu qəlb unutmuş özün, eyləyir şitab hara?
Həyat çeşməsinə baxmaram daha, Saib,
Səraba bənzəri var, mən hara, sərab hara?

* * *

Dolmuş ürək qanıyla yenə əldə camımız,
Meydan oxur hər axşam aya nurlu şamımız.
Bir baxmaq ilə aldın əlimdən qərarımı,
Nərgiz baxışlı gözlərə de, yox aramımız.
O al şərabı içməyi mən tövbə etmişəm,
Çün tövbə edib, içsək, olar mey həramımız.
Ömrümdə düşmərəm mən o cənnət xəyalına,
Çünki fəna evindədi darüssəlamımız.[1]
Meydən şirin nə vardır, odur şad edən bizi,
Meylə həyatda hasil olur cümlə kamımız.
Leyli kimin yüz ahunu biz salmışıq tora,
Eşq aləmində Məcnunu keçmiş məqamımız.
Qəlbin odundan atəş alır sinədə hər ah,
Yandıqca daha bəllənir eşqə dəvamımız.
Bu dünyada nə varsa, onu əql dərk edir,
Müşküldü əqlə bəlli ola hər məramımız.
Xızrın ayağı dəydiyi yerlər çiçəklənər,
Bəxtin fidanı yarpaq açar, var inamımız.
Ceyranların gözündə biz insafsız olmuşuq,
Torla deyil, duayla qurulmuşdu damımız[2]
Qənd verməsən bu dil-dil ötən tutiyə, inan,
Bir kəlmə də danışmaz o şirin kəlamımız.
Dünyanı da idarə edənlər bizik, nədən
Çərxin əlində qul kimiyik indi hamımız.
Güntək cahana isti nəfəslər verən bizə,
Saib, yazıldı göylərə fəxr ilə namımız.

[1] Darüssəlam – dinclik evi.
[2] Dam – tələ.



* * *

Əqli biz divanəlikdə bilmişik,
Sevgini fərzanəlikdə bilmişik.
Aşiqin qanın töküb zülm etməyi
Eşqidə, cananəlikdə bilmişik,
Düz yolu ləngər vurub qət etməyi
Doğrusu, məstanəlikdə bilmişik.
Eşq bağında solub bəxtin gülü,
Biz bunu biganəlikdə bilmişik.
İxtilatın ən gözəl nemətlərin
Sərbəsər əfsanəlikdə bilmişik.
Gər düyünlənsə boğazda göz yaşı,
Biz bunu mərdanəlikdə bilmişik.
Eşqidə canı uduzmaq rəsmini
Hər zaman tiflanəlikdə bilmişik.
Dalğalar dolmuş hübabla dəryada,
Biz onu dürdanəlikdə bilmişik.
Aşiqin can qeydinə qalmaq halın
Qəlbdəki viranəlikdə bilmişik.
Şam başında atəşə odlanmağı
Eşqidə, pərvanəlikdə bilmişik.
Kim bizimlə eyləsə biganəlik,
Mənasın səddanəlikdə bilmişik.
Hər kəsi bir künc edir qəmdən xilas,
Biz onu meyxanəlikdə bilmişik.
Dünyanın hər nemətindən keçməyin
Hümmətin mərdanəlikdə bilmşik.
O fədakarlar gözündə heyrətik,
Röyanı əfsanəlikdə bilmişik.
Saib əldə hər nə etmişdir, onu.
Dostlara həmxanəlikdə bilmişik.

* * *

Bu eşq dərdü qəmiylə necə yoğurdu məni,
Qiyamətin, elə bil, atəşi qovurdu məni.
Yarama bəxyə vurarlar, fəqət nə faydası var,

Təbibim oldu o kəs ki, elə o qırdı məni.
O qədər hicrana dözdüm, ürəgim döndü qana,
Yetim uşaq kimi göz yaşlarım boğurdu məni.
Nəsim bəhanə idi, dəycəkin dağıldı bədən,
Kimisə toplayaraq torpaq üstə qurdu məni.
O lalə qəlbinə dağ çəkdilər bəzək yerinə,
Həyat da min dağ ilə aldadıb doğurdu məni.
De, cücərsin necə bəs torpağa düşən toxumum?
Bu ataş üzlü gözəllər ox ilə vurdu məni.
Nə yaxşı oldu ki, Saib yazıldı xoş xətlə,
Bu tale həsrəti ömrümdə azmı yordu məni?

* * *

Qocalıq gəldi, bu da özgə bir aləm oldu,
Əyilən qamətimiz körpü kimi xəm oldu.
İstədi göz yaşımız laləni sirab eləsin,
Göz yaşı sel ki deyil, adicə şəbnəm oldu.
Ürəyim nəfsin əsiri olub əfsus-əfsus,
Xatirimdə qara div, bir də ki Hatəm oldu.
Qadın ilə günəşin sirrini dərk etməmişəm,
Gözlərimdə bu cahan sirli mübhəm oldu.
O səxavətli ürəklər kimi ağdır üzümüz,
Dünyanın dərdü qəmi sinəmə məlhəm oldu.
Bu qəmi udmaq ilə axıra çıxmaq olmaz,
Yediyim-içdiyim ömrüm boyu hey qəm oldu.
Bax, bu dünyanı qiyas elə qarışqa gözünə,
Saibə mülki-Süleymanı da ver, kəm oldu.

* * *

Mey dolu camda mənim sanki hübabdır ürəyim,
Dərbədər insan üçün odlu şərabdır ürəyim.
Bir meh əssə, dağılar, bil ki, bu canım bənd-bənd,
Hər teli nalə edən dərdli rübabdır ürəyim.
Hər iki aləmi əks eyləmiş alnım sanki,
Heç kəsə söyləmərəm bağlı kitabdır ürəyim.
Körpələr nənnidə laylayla yatar, adətdir,



Fələyin gərdişini gördü, xərabdır ürəyim.
Bir qılınc tək çıxar o lazım olarsa qından,
Kimə mübhəmdi, kimə odlu cavabdır ürəyim.
İki aləmdi, inan, qiyməti yanmış sinəmin,
Sən olan dünyada nurlarla sirabdır ürəyim.
Hər bağın, hər çəmənin nəğməkarı varsa yenə,
Saibin nəğmələrindənsə kababdır ürəyim.

* * *

Heyrətə saldın, əzizim, gəlişinlə bağı sən,
Səni görcək maraq ilə baxaraq susdu süsən.
Nə bahar həsrəti qaldı, nə xəzan qeydi daha,
Sərv tərk etdi bağı çün utanıb qəddindən.
Günəş həsrətdi doyunca baxa bir surətinə,
Qamaşar gözləri gül çöhrəni gördükdə həmən.
İsanın iynəsini sən yaxana taxma nahaq,
Bir tükün siqlətinə tab eləməz, bil, o bədən.
Çıxarıb Bijəni Rüstəm quyudan verdi nicat,
Səni eşq azad edər bu fələyin qeydindən.
Kamana ox qoyularsa, atılar çox uzağa,
Bilmirəm, dövr sapandı məni də atdı nədən?
Nə zaman gəldi bahar, körpə ağaclar göyərər,
Qələmin, Saib, açır hər vərəq üstündə çəmən.

* * *

Başımı verrəm, zəmanə silsə qəm təsirini,
Yandırar ahım odu öz xanəmin hər tirini.
İndi məmur olmuşam divanələr yurdunda mən,
Qollarımdan asmışam divanəlik zəncirini.
Bəllidir, Fərhad çəkib Şirin üçün süd arxını,
Mərd odur çəksin yaradan dövranın şəmşirini!
Köhnə meydən zahidin ağzı həmişə turş olar,
Dəvət et mey içməyə hər dəm xərabat pirini.
Bisütun dağı bizə minnətdar olsa, var yeri,
Dırnaq ilə arx çəkib biz sirab etdik Şirini.
Saibi hind torpağından bəxti etməkçün xilas,
Açmaq istər tilsimi, əfsus ki, bilmir sirrini.

* * *

Şadlığından sinəmin artmış olarsa kədəri,
Cəng atan ayna kimi qəlbimin olmaz səməri.
Darğanın əmri ilə mey satan olmur cümələr,
Bu səbəbdəndi xəcalət görürəm şənbələri.
Gün kimi aləmi rövşən eləyən meydi, desəm,
Köhnə dostumdu, belə tərif üçün var dəyəri.
Tülkü tutsa adamı, paltarını parçalayar,
Şir ilə oynama, vardır bu işin çox xətəri.
O qara zülfə ki, Saib də havadar olmuş,
*Qara atlasdan edib indi belində kəməri.*

* * *

Ya rəbb, ol Şərqdən doğan nurla hidayət qıl məni,
Məhşərim eşq ateşi, əhli-qiyamət qıl məni.
Bu xəcalət tozları axır məni məhv eylədi,
Gövhərəm, öz rəhmətinlə sən himayət qıl məni.
Bir hübabəm, mən həqiqət dəryasında qoy üzüm,
Hümmət et kaşanə fikrindən də rahət qıl məni.
Vermə sən ömrüm şamın başsız küləklər söndürə,
Ömrünü cavid elə, layiqi-hörmət qıl məni.
Damlanı gövhər edir, layiq biləndə dəryalar,
Layiqəmsə, lütf elə, sahibi-dövlət qıl məni.
Bir quru torpaqdayam pəjmürdə bir gövhər kimi,
Odlu göz yaşımla yu, əhli-kəramət qıl məni.
Çırpınan qəlbim itaət eyləməz hər fərmana,
Et qiyamət laləsi, sən daği-möhnət qıl məni.
Çox uzatma möhbəti, Saib, nə qədir var canın,
Söylə ki, yarəb, özün əhli-məhəbbət qıl məni.

* * *

Eşqinin hicri mənim hövsələmi kəm eləmiş,
Məni rahət nə o aləm, nə bu aləm eləmiş.
Təkcə qorxum budu ki, dərd məni yaddan çıxara,
Ölməyi fikr eləməm, bir də bunu kim eləmiş?



Ölümün şərbətini köhnə şərabtək içərəm,
Məni bu dərdlərə çün dövr özü həmdəm eləmiş.
Sinəmin dağına eşqim özü ilk dayə olub,
O qədər yandırıb, axırda onu şəm eləmiş.
Gülün üstündəki qeyrət tərinin damlasıyam,
Sanmayın şaxta düşübdür, məni şəbnəm eləmiş.
Mən bu səhradakı qum üstə bitən bir tikanam,
Yüz ürək qanı mənim dərdimə məlhəm eləmiş.
Almış hər zərrəmi, Saib, külək öz pəncəsinə,
İllər ötmüş ki, fələk toplayaraq cəm eləmiş.

* * *

Su tək aydındı bu aləmdə mənim hər hesabım,
Şəbnəmin qəlbinə təsir eləməz afitabım.
Kim gedə düz yol ilə, bil, yolu tez qət edəcək,
Əyri yol tutsam əgər, artacaq onda əzabım.
Mən sənin fikrin ilə hər gecə getdim yuxuya,
Yusifi röyada görmək olub ancaq səvabım.
Gər məni vermədilərsə ələ, qəsd eyləyərək
Saldılar öylə kəməndə daha artıb əzabım.
Çox nəzərlərdə heçəm, Saib, əgər, qoy heç olum,
Təki xalq salmaya gözdən, budur ancaq cavabım.

* * *

Məhəbbət aləmində zahid yayar riyanı,
Şəhərdə darğa qoyma, amandı, kəndxudanı
Ki, qaynayıb qarışmaz cəmaətə, qalar tək,
Gül dərməyə qoyarlar, qaydadı, aşinanı.
Qələm necə çəkər dad bu hicranın əlindən,
Dırnaqla açmaq olmaz zülfü matəm zamanı.
Özün yüksək tutanlar axır düşər ayağa,
Göydə uçan oxun da torpaqdı son məkanı.
Qeyrətinə vuruldum o yolçunun ki, yolda
Göz-göz edib ayağın səhraların tikanı.
Baldan şirin olubdur ağzı, o kəs ki, Saib,
Sevindirib ürəkdən həyatda bir gədanı![1]

[1] Gəda – (burada) dilənçi.

* * *

O güləndam ki, onun çəkmişəm hər gün əzabın,
Olmaram razı çəkə özgələr indi gülabın.
Dözmərəm hətta səhər yelləri dəysin o üzə,
Nə qədər açmamışam mən o gül üzdən niqabın.
Qarğı at mindiyi vaxt oldum üzəngi tutanı,
Əzabın çəkdiyimin indi görüm kaş səvabın.
Qəlbimi qan elədi, ta ki əli tutdu qələm,
Məktəbə mən aparardım axı dəftər-kitabın.
O mövün torpağına qanımı tökdüm, Saib,
Heç rəvamı içələr özgələr indi şərabın?

* * *

Qoy qopardım mən, atım dərd dolu qəlbi sinədən,
Kimdi od parçasına sinəsini məskən edən?
Dərdimi dağ götürə, tab eyləməz siqlətinə,
Su yerində qan axar köksündəki hər çeşmədən.
Eşqidən özgə nə var bu aləmə can versin o?
Fərhadın eşqilə daşdan çün yarandı bir bədən.
Ol gül üzlü dilbərin qan tökmək olmuş adəti,
Ehtiyat etməz Süleymandan belə, bilməm, nədən
Heç də narahat deyil bizdən sarı çərxi-fələk,
Körpənin göz yaşına nənni olar ancaq vətən.
Arif üçün qəlbimi yüz parə etsəm, incimən,
İstəsəm düşmənlik etsin mənlə hər yoldan ötən.
Parça-parça elədim dırnaqla mən çaxmaq daşın,
Mum nədir, Saib, qoparda bilməyim dırnaqla mən?

* * *

Qəribədir, çəkir əqlin müdam kəməndə səni,
Məhəbbət azad edər, əql edərsə bəndə səni.
Axıtma göz yaşını, atəş üzlülərlə otur,
Verirlər əldən-ələ onlar hər görəndə səni.
İnanma alçaq olan hər kəsə, o, xeyri üçün
Çəkib bazara satar hər yetən həpəndə səni.



Çiçək kimi açılıb gülmə sən o kəklik tək,
İnan ki, yem edəcək şəhbaza bu xəndə səni.
İnanma sübh yerinin qənd kimi gülüşlərinə,
Zəhər qatıb verəcək aldadıb o, qəndə səni.
Edərsə Saibi, əql eyləyər bu qəmdən azad,
Əzəldən əql salıbdır elə bu bəndə səni.

* * *

Verərəm hər nəyimi, tanrı bilir, çün şəraba,
Dərd dönüb nəşə olar, meyl elə bəzən şəraba.
Qönçənin düyməsi altda hələ çox sirlər var,
O sehirli neyi də tutdu çoxu tən şəraba.
Bu sözü, bil, mənə Əflatun özü öyrətdi,
Qəmə əl dəymə, fəqət tapşır onu sən şəraba.
Bir hübab tək başımı çəkmişəm öz sinəmə mən,
Onda qiymətlidi baş, sən onu versən şəraba.
Xızrdan cam əgər alsan, ona diqqət elə ki,
Qatmasın abi-həyat xəlvəti birdən şəraba.
Saibəm, dərdimə aləmdə çatan dərd olmaz,
Bir qara pul belə yoxdur ki, verəm mən şəraba.

* * *

Bir ayna kimi vəslinə canan tələb eylə,
Əvvəl evi tik, sonra da mehman tələb eylə.
Gün gülmıx olub sancılıb eşqin qapısında,
Hər nə diləsən, onda var, ondan tələb eylə.
Sən daşların altında göyərmiş ota dönmə,
Azad boy atıb, qalxmağa imkan tələb eylə.
Daşla dəmirin yoxdusa, atəş nədən olsun,
Gözlə yolunu, ta gələ karvan, tələb eylə.
Hər qönçəni sübhün yeli xəndan edə bilməz,
Ey himmətimin qönçəsi, dövran tələb eylə.
Dostluq məqamın ölçməyə mizandı zəmanə,
Dostu sınasan, borcu yalandan tələb eylə.
Saib, diləyirsən ki, sənə dost ola canan,
Əvvəlcə qələm, bir də qələmdan tələb eylə.

* * *

Sübh çağı zərrin şəfəqlə rəngi qan olmuş Günəş,
Sanki bu görkəmdə xalqa mehriban olmuş Günəş.
Bəlkə, cənnətdən uzanmış yoldu bu göy əyrisi?
Bir zaman cənnətdə, bəlkə, xanədan olmuş Günəş?
Asimanın sirrini kəşf eyləmək asan deyil,
Gah saralmış, gah qızarmış, sirr açan olmuş Günəş.
Aynada hey bir də, bir də görməyə gül çöhrəni,
Bu səbəbdən göylərə hər gün rəvan olmuş Günəş.
Sübh oyan, Saib, şəfəqlər qoy qızartsın çöhrəni,
Çünki hər gün zər şəfəqdən rəngi qan olmuş Günəş.

* * *

Çək yana zülfünü, gül surətinə salma niqab,
Bu gözəlliklə sənə, söylə, nə lazımdır hicab?
Sən olan məclisə cürət eləməz gül dolana,
Gülləri al yanağın atəşi etməkdə gülab.
Vəsl olubdur səbəbi sel tək axan göz yaşımın,
Şad olar kandarına göz yaşını töksə şərab.
Çöllərin hakimi divanə deyirlər, o bizik,
Bu səbəbdəndi şəhər sıxdı bizi, verdi əzab.
O təmiz gözlərə bax, eşqidir hakimlik edən,
Günəşin şöləsinə şəbnəm haçan etmiş tab?
Şor sudan göydə buludlar yaradır gövhər əgər,
Sən o pak gözdə eyib gəzmə nahaq, vardı savab.
Su da layla çalaraq böylə yatırmışdı məni,
Ömr qəflətdə keçib getdi, nədir indi cavab?
Tamah etmə, yaxanı qurtar əlindən tamahın,
Arxayın olma duan hasil ola xanəxərab.
Bu xəyallardı, soxulmuş yenə də qəlb evimə,
Havası artsa belə, partlayar axırda hübab.
Şah əzab versə əgər rəyətinə, şah deyil o,
Bənzəyər sərxoşa kim, eylər ətin şişdə kəbab.
Saib, aldanma ki, dövran sənə rahat keçəcək,
Sən kimi təşnəni çox aldadıb axır bu sərab.



* * *

Qəlb ilə əql çıxıb cəngə qəhrəman yuxuda,
Dəvə qırmış ipini, çünki sariban yuxuda.
Ömr axar bir su olub, gör necə axdı hədərə,
Binanı sel aparır, çünki pasiban yuxuda.
Röyada yarın o gül gözləri dastan danışır,
İstərəm ki, danışam mən də bir zaman yuxuda.
Söylə, bu sehr deyil, bəs nədi ki, yar qaşını
Gözləri üstə əyib sanki bir kaman yuxuda?
Saibin şeri verir indi bütün gözlərə nur,
Görməmişdir belə bir sürmə İsfahan yuxuda.

* * *

Belə bir ahu gözü görməyib heç yan yuxuda,
Qəribə söhbət edir bir para insan yuxuda.
O qara gözlərə düşməz yuxu əsla yaxına,
Görmüsən gözlərini heç yuma ceyran yuxuda?
Sənə xoş keçdi gecə, bizsə pərişan olduq,
Sübhədək gözlərimə qonmadı bir an yuxu da.
Busə aşiqlərinin hər gecə artar həvəsi,
Sürməli gözlər olarsa ona mehman yuxuda.
Gül kimi açdı səhər, sanki uşaq əllərinə
Həna qoymuş anası zövq ilə pünhan yuxuda.
Yarın ol ləl-ləbindən bir öpüş almaq üçün
Saib istər ki, ola sevgili canan yuxuda.

* * *

Fələyin min kələyi, fitnəsi var, yatmaginan,
Körpünün altına daim sel axar, yatmaginan.
Sübh açılmış gülə şəbnəm hamıdan çox yaraşır,
Sübh çağı dursan, halın yaxşı olar, yatmaginan.
Şikarın eşqi ilə tor da gözün yummur, inan,
Yatmasan, qismət olar yaxşı şikar, yatmaginan.
İstəyirsən hər işi sən alasan öz əlinə,
Ox elə kipriyini, sinəni yar, yatmaginan.

Ələmin kölgəsinə girmə, nahaq ah eləmə,
Sübh əgər qovğa üçün versə qərar, yatmaginan.
Acı söz söyləməyin faydası yoxdur; ilanın
Yuvası üstə yatan olsa, çalar, yatmaginan.
Hər kəsin xəstəsi varsa, ona yatmaq yaramaz,
Rəhm elə sən də bizə bir gecə, yar, yatmaginan.
Qayığın köhnədisə, su dolacaq ağzınadək,
Göz yumarsan, qayığı sel aparar, yatmaginan.
Gecə sən olma günah əhli, könül aynasını
Yoxsa sübh vaxtı təzə cəng tutar, yatmaginan.
Pusquda oğru olar, kim yata yol üstə əgər,
Çalışıb mənzilə çat, yolda beikar yatmaginan.
Damarında qaralan qanları neştərlə çıxar,
Ver özün öz halına fövri qərar, yatmaginan.
Dəryada yummayır heç vaxt balıq gözlərini,
Sahilə gəlsən əgər, olma xumar, yatmaginan.
Lalənin yarpağı olsun sənə örnək, ona bax,
Sinənin yarasını sən də qopar, yatmaginan.
Ayı alınış araya halə məhəbbətlə yenə,
Sən gecə haləyə dön, Ay da nigar, yatmaginan.
Qönçə ilə baharın gör necə şadlıq dəmidir,
Səni gül kölgəsinə çəksə bahar, yatmaginan.
Çəməni, sərvi sevən qumru yumarmı gözünü?
Başın üstə dayanıb qəddi çinar, yatmaginan.
Yunisi uddu balıq, dəryada da qaldı oyaq,
Dövrənə mavi sular çəksə hasar, yatmaginan.
O badam gözləri ömrün tağına bənzədirik,
Ruzigarın da gözündə gözü var, yatmaginan.
Leyli karvanla gedir, səarbanıdır indi hilal,
Sənə Məcnun deyəni kim qınayar, yatmaginan.
O qara zülfünə bax, əldən alıbdır qərarım,
Bu qərarsız quluna ol havadar, yatmaginan.
Gecə zülmətdi deyib çox nahaq işlər görülür,
Sən ədəb gözlə, daha etmə qubar, yatmaginan.
Kəndlinin torpağı var, heç səninki deyil az,
Torpağa göz yaşı tök, gündə suvar, yatmaginan.
Kəhkəşandır fələyin tutduğu ol odlu qılınc,



O qılınc başı bədəndən qoparar, yatmaginan.
Hər bahar rəqs eləyər torpağının zərrələri,
Sən də torpaqsan əgər, durma kənar, yatmaginan.
Fələk öz gövhərini vermiş, əmanətdi sənə,
Gizli saxla onu sən, oğru duyar, yatmaginan.
Torpağa mərkəz olub indi şəhidlər üroyi,
Bu şəhid qəlblərə sən vermə azar, yatmaginan.
Mövləvi şerinə Saib bunu yazmışdı cavab,
Ömrünün bir gecəsin sən də naçar yatmaginan.

* * *

Kim tapırsa haqqı, o, hər qətrədə dərya tapar,
Kim özün duysa, bilər dəryada min-min qətrə var.
Bir kiçik zərrə içində kəşf olar aləm ona,
Kim özündə varlığı dərk eyləsə haqdan kənar.
Bu cahan övzəsına göz yummağın mənası yox,
Mənaca kamil olanlar dünyanı bir heç sanar.
Gər külək sahildən əssə, naümidlik bilmərəm,
Dalğalar qoynunda da çünki gəmim yelkən açar.
Qönçəni rüsvay edər güllər içində bağ ara,
Ötməsə bülbül əgər min şövq ilə fəsli-bahar.
Köynəyini Yusifin qoxlarsa bilməz hər adam,
Bu işə Yəqub gərəkdir ki, çıxarsın tez qərar.
İzzət ilə dünyada ömr eyləmək asan deyil,
Yoxsa seyrangah kimi, Saib, bu aləmdə nə var!

* * *

Sadədildir o adam, fəxr edə ki, övladı var,
Ata ilə anaya zəhrə bərabər dadı var?
Hər iki qəlbdə doğan eşqə bəhər övlad olur,
Eşq can yanğısıdır, özgə onun nə adı var?
Gecə o göydə yanan şamlara ulduz deməyin,
Göylərə od çiləyən min sinənin fəryadı var.
Nə qədər arzu qara torpağın altında yatır,
Kimsənin çatmaz əli, nə köməyi, imdadı var.

Yarama duz səpirəm, çünki acı olsa badam,
Duz səpərlər, bu işin də özünün ustadı var.
Əzəli qismət ilə kim şad olur, qoy olsun,
Əbədi işrəti seç, Saib, onun bünyadı var.

* * *

Zahiri görmək əgər adət olub gözlərinə,
Asginan divara o gözləri ayna yerinə.
Öz evindən kənara qoyma qədəm, diqqət elə,
Bir qədəm atmaq ilə düşmə bəla məhşərinə.
Tarımar olsaq əgər, eşqə bunun yoxdu qəmi,
Nə qədər dövr edə pərgar, dayanar nöqtə yenə.
Aynanın qopsa əgər cövhəri, ayna deyil o,
Gözəl oldur ki, elə pərdədən aydın görünə.
Hara baxdınsa, tikandır, dedin, ey dar gözlü,
Görmədin gül-çiçəyi, sən nəzər et bir dərinə.
Sürməli göz qara röya görəcəkdir yuxuda,
Oturub xəstə yanında, alış o şam yerinə.
Sənlə bir yerdə olarsam, inan, hər qanlı tikan
Dönərək əfiyə çalsa məni, o, xoşdu yenə.
Möhr vur ağzına, sus, Saib, uzatma sözü sən,
Hər bəla gəlsə əgər, bil ki, dilindəndi sənə.

* * *

Gəldi gül fəsli, könül, bil ki, bu rindlik[1] çağıdır,
Tulla səccadəni,[2] al kuzəni, mey qəm dağıdır.
Çiyninə atdığın o yun şalı qoy, sinəni aç,
Saldığın şal deyil, o həlqəli qəflət bağıdır.
Cənnətin teşnələri kövsərin eşqilə yanar,
Məncə, o tərsa ləbi abi-həyat qaynağıdır.
Buludun göz yaşı qəbrində soyutmaz sinəni,
İç cəhənnəm alovun, sanma ki, atəş yağıdır.
İstəmirsənsə bu eşq rənginə batsın ayağın,

[1] Rind – ömrünü şad keçirən xərabat əhli.
[2] Səccadə – üzərində namaz qılınan parça, xalça.



Sərv tək qumrunu tut əldə, hünər bayrağıdır,
Qəlbinin qanı mürəkkəb, qələmi şimşəkdir,
Saibin hər varağı bir ömrün yarpağıdır.

* * *

Zülfünün ətrini sübhün yelinə vermə hədər,
Qəlbi kor insana sən tutiya[1] versən, nə edər?
Bu həyat sıxsa səni, səbr ilə döz hər əzaba,
Növbəni gözlə dəyirmanda, dənin vardı əgər.
Hər bina ayrıla özüldən, o qalmaz, uçular,
Necə ki, dəryadan ayrılmaz hübab zərrə qədər.
Qələmi xırdalayıb tökmə ayaq altına sən,
Qələmin şöhrəti olmaz, ayağa düşsə əsər.
Tuti sust olsa, ona qəndi verəndə danışar,
Çün şirindillidi Saib, nəyə lazımdı şəkər.

* * *

Hicrə düşdün, nədi fərqi, gecə, ya gündüz, inan,
Yara təsir eləməz ah edəsən, yoxsa aman.
Qoparar qəlbini uf da eləməz bircə kərə,
Elə bil birdi onunçün ürəyinlə çalman.
Aləmi-vəhdətə bir köynək ilə getmək olar,
Sel gələndə nə bilir bu qayadır, yoxsa saman.
Özünü tərk edənə yoxdu nə alçaq, nə uca,
Özünün vurğunudur hər şeyə bu fərqi qoyan.
İstərəm ki, özümə layiq ola hər əməlim,
Kağız üstə uzanan sözlərim olsun Loğman.
Saibə zövq verir gülşəni seyr eyləməyi,
Fərqi yoxdur, nəzərində gül ola, yoxsa xəzan.

* * *

Hansı qəlbdə yandısa, bil ki, çıraqban etdi söz,
Söz qanan insanları gülşəndə mehman etdi söz.
Hansı söz ki, dinlədikdə qəlbə təsir etmədi,

[1] Tutiya – gözə çəkilən yağ.

Bil, təbil tək hay salıb boş yerdə cövlan etdi söz.
Öz qələmin dişləyərsə söz yazan sözdən sarı,
O qələm əhlin axırda çox pərişan etdi söz.
Xızrın o abi-həyatı zülmət içrə axsa da,
Çün damarlarda axanda sanki tüğyan etdi söz.
Özgələrdən birce fərqim vardı bu babətdə kim,
Hamıdan artıq məni mənada heyran etdi söz.
Kim təvazöhlə dedi qönçə kimi bakirə söz,
Belə söz sahiblərin vaxtında xəndan etdi söz.
Mehribanlıq eyləyib mən sözlərə verdim sığal,
Quş kimi açdı qanad, göylərdə cövlan etdi söz.
Gərçi İskəndər üçün lövhə qoyuldu qəbrinə,
Qəbrimi rövşən edib xalqa nümayan etdi söz.
Çün qələm tək öz başından keçdi Saib söz üçün,
Bu səbəbdəndir onu məşhuri-dövran etdi söz.

* * *

Ya gözün yanındadır xal, ya da yaqut dodağın,
Harda olsa, çəkəcək aşiqə o sinə dağın.
Bil ki, küncdə oturan qəlbi təsərrüf eləyər,
Qəlb sevər o xalı ki, küncünə düşsün dodağın.
Arzusu hasil olar, kim dua eylərsə gecə,
Çünki aşiqə gecə təsiri çoxdur fərağın.
Aləmə naz eləyər şux gözü o nazlı yarın,
Asiman ulduz ilə doldurar hər gün qucağın.
Özgə bir aləm ara, bu fələk altında min il
Qismətin bu gecə-gündüzdü, o torpaq – yatağın.
Boş ibadətlə ürək mülkünə yol tapmaq olar?
Qarğı at minsən, uzaq getməyəcəkdir sorağın.
Saibə söylə ki, bu torpağın üçtündə fəqət,
Heç zaman çatmaz əlin əyrisinə mavi tağın.

* * *

Hardasan, çox gəzmişəm, ey nazlı canan, hardasan?
Bir məkanın yoxmudur, söylə, doğrudan hardasan?
Çünki bir yer qalmadı biz gəzməyək əldə çıraq,



Qətrə tək bəs olmusan sən harda pünhan, hardasan?
Gər vəfan həddən aşıbsa, görmədik biz ki, vəfa,
Qorxuram mən həddini aşmış cəfandan, hardasan?
O şəkər tək ləblərindən busəni etdin əta,
Rəhm qıl, saxla məni bir gecə mehman, hardasan?
Ey nəsimi-sübh tək qönçələri xəndan edən,
Gəl, fərağında ürək oldu tamam qan, hardasan?
Gəlmədin, girdim yerə mən də xəcalətdən, inan,
Rəhm qıl sən Saibə, ey coşğun ümman, hardasan?

* * *

O yarın vəsli üçün tədbirə əl atma hədər,
Gözləmə sübhü hələ, çünki uzaqdır bu səfər.
Kükrəyən selləri mən yolda ötüb keçdim, inan.
Bu dəmir qıçlarıma halqalı zəncir nə edər?
Eşq yar olsa, Züleyxa o qədər pir deyil,
Yusifə köynəyi vermişdi azadlıq, dedilər.
İstəsə qasidi daşdan çıxarar namə yazan,
Şirinə Fərhad özü arx ilə göndərdi xəbər.
Saib, ayrılsan əgər, qəlbini tapşır o yara,
O quşun naləsini dinlə, deyir, gəldi səhər.

* * *

Bu bağın hər tikanı yol göstərən nişandı,
Hər şəbnəmi, deyirsən, ayineyi-cahandı.
Hər qönçəsi, öylə bil, möhürlənmiş namədi,
Hər bülbülün sadəsı fəqət ahu fəğandı.
Hər bir ürək şəhiddir, üzmüş əlin həyatdan,
Şəhidlərin üstündə göz yaşları rəvandı.
Hər qəlb evi silinmiş bir aynaya bərabər,
Hər yarpağı, deyərsən, tuti tək xoş lisandı.
Nəğmə tələb edənlər Xızra verib siyahı,
Ümmanda qərq olana hər dalğa pasibandı.
Torpağa dürr tökəndə Günəş nurlu səmadan
Yarasalar zülmətdə ayağından sallandı.
Cənnət boyda bu bağda bir bağban nə eyləyər,

Bu hüsnə, bu cəmala neçə bağban həyandı?
Hərçənd eşqi nəhrin dəyişməyir həvasın,
Onun havayi-eşqi hübabi oynadandı.
Ey yol ötən, bu çöldə ayağını yavaş qoy,
Çün sadə çöl deyil bu, başdan-başa tikandı.
Ürək dilə gələndə, can da getdi qərardan,
Hər zülfünün ucunda bir həngamə yarandı.
Qələminə dəyəndə eşqin nəfəs, Saib,
Sənin nəvalarından güllərin bağrı yandı.

* * *

Bu göy nədi? – Bir gövhəri, dürdanəsi eşqin,
Bəs gün nədi? – Atəş dolu bir xanəsi eşqin.
Həm Kəbə evi, həm də ki, atəşgədə – məbəd
Olmuşdur əzəldən axı viranəsi eşqin.
Dünyada bu şadlıq, pərişanlığı anla,
Hər an görünür bir cürə meyxanəsi eşqin.
Qəlbim quru səhradı, görünməz sonu gözlə,
Bu səhrada vardır nə qədər lanəsi eşqin.
Yazdı qələmim könlümün hər kəlməsin aydın,
Yox orda, inan, bir dənə biganəsi eşqin.
Odlu günəşin şöləsi dağ basdı cahanə,
Atəş deyil o, sadəcə – divanəsi eşqin.
Hər daş ki, nişangah kimi səhrada qoyulmuş,
Düzmüş olan səhrada məstanəsi eşqin.
Saib ki, olardı həmişə Kəbədə sakin,
Məskəndi ona indi də bütxanəsi eşqin.

* * *

Görmədim bir gözəli eşqə giriftar deyil,
Hüsnünə Misridə kim var ki, xiridar deyil?
Şirləri ovlayanın qəlbini sən ovlamısan,
Hansı şirdir ki, bu işdən o xəbərdar deyil?
Elə bir lalə tapılmaz bu çəmənlikdə, onun
Qəlbinə od salan o səndəki ruxsar deyil.
Sənin o silsilə zülfündü bu dünyanı tutan,



Varmı bir kəs ki, saçın boynuna zünnar deyil?
Göz dikib gözlərinə məst də, xumar da, bunu bil,
Elə nərgiz tapılar çeşminə oxşar deyil?
Hər kəsə ləli-ləbin bir dil ilə söhbət açar,
O şirin ləhcədəki söz kimə aşikar deyil?
Açmamışdır hələ bağçanda sənin bircə çiçək,
Demə öz bəxtinə kim, bəxt sənə yar deyil.
Sənin hüsnün, gözəlim, göz bəbəyimdən pakdır,
Hüsnünün bağı sənin adicə gülzar deyil.
Sədəfin bağrını yar, orda tapılmaz ümman,
Mənə göstər sinə ki, məhrəmi-əsrar deyil.
Kim ki, səndən çəkir əl, söylə, əlində nə qalır?
Nə tələb eyləyir ol kəs ki, tələbkar deyil!
Nə gözəl oldu ki, sən aynadan üz döndərdin,
Hər pərişan nəzəri görməmək inkar deyil.
Bu qərəz əhli yanında dil açıb dinmə nahaq,
Saib, hər gövhərə onlar ki, xiridar deyil.

* * *

Güldün, gülüşün pərdəni atdı dodağından,
Ayna dəxi gül dərdi sənin gül yanağından.
Bir baxmaq ilə təzələnir köhnə yaralar,
Bu lalə dağ almış ürəyin qanlı dağından,
Bu bəxtiqara olmağımın vardı əsası,
Bəxtim su içib sürməli gözlər bulağından.
İsa da edə bilməyəcək dərdimə çarə,
Bu dərdi o öyrətdi mənə körpə çağından.
Saib, civə də hökmümə hazır dayanıbdır,
Şimşək kimi mən çıxmışam eşqin qucağından.

* * *

Qəlbim hicran gecəsi fəryad ilə, bil, şad olub,
Könlümü sakit edən də yenə bu fəryad olub.
Eşqə məşuqəni arif ki, bərabər tutmaz,
Ay ki, yüksəkdə durub, qibtədən o, azad olub.
Bir işi eşqilə kim görməsə, olmaz səməri,

Yusifin köynəyi babətdən əzizlər yad olub.
Nə böyük işdi yəhər bağına ov bağlamağın,
Diri tutmuş kim ovu, bil ki, əsl səyyad olub.
Lalənin yarpağına kim baxa, aydın görəcək
Ürəyi qanla dolanla qarabəxt həmzad olub.
Bakirə söz yazan odlu qələmin var, Saib,
Bil onun sayəsinə söz eviniz abad olub.

* * *

Qəzəbin, lütfün oxursan qaşlarından ol yarın,
Hər bağın abadlığın söylər üzü bağbanların.
İstərəm, gül xərməni olsun mənim dörd bir yanım,
Neyləyim, bağ gizlədib divar dalında öz varın.
Çəkmişəm gül qönçəsindən yarımın kirpiklərin,
Hər kaman düz atsa ox, düzdür, demək, hər ilqarın.
Bülbül eşqin sürməsin çəkmiş gözə, olmuş xumar,
Kim yaza qiymət verib, sonra dəribdir öz barın.
Saib hər söz məclisində Amulu xatırlayır,[1]
İsfahanda boş qalıb söz kürsüsü sənətkarın.

* * *

Üzdəki göz yaşlarım yarın fərağında yatar,
Hənа aşiqdi məgər dilbər ayağında yatar?
Niyə şeh ayrı düşübdür, uyuyub güldən uzaq?
Bu tifil ki, həmişə lalə qucağında yatar.
Gözə çeşmək ki, şərik oldu, daha fayda nədir?
Gülü dər, ta ki nəsmi sübhün otağında yatar.
Kəfən od tək yapışar canına, billah, şəhidin,
Nə qədər qan bahası sinəsi dağında yatar.
Sən könül vermə bu dünya varına, dövlətinə,
Həsirə bənzəyir o, kandar ayağında yatar.
Yol kəsən indi durar, bəs necə getsin Saib?
Adət olmuş, ayağı qorxulu çağında yatar.

[1] Amul – Saib səbkində yazan şairlərdən olmuşdur.



* * *

Əməlindən ürəyimdə hələ nisgil də qalıb,
Çör-çöpü dalğa atıbdır, yenə sahildə qalıb.
Mən kimi sadə adamdan nə nişanə qalacaq?
Tökülən lalə qanım dəməni-qatildə qalıb.
Sədəfi sahilə dəryadan atıbdır ləpələr,
Qəlbidə gəzmə sən insaf sözünü, dildə qalıb.
Yol yaxın olsa əgər, qəlbimizi rahat edər,
Yol uzaq olsa, müsafir daha müşküldə qalıb.
Nə qədər kəmağıla dərya verib gövhərini?
Bizim ümmid gəmimiz indi də sahildə qalıb.
Arxalanma bu daşa-torpağa, yoxdur səməri,
Saib, əsl əsərin şöhrəti min il də qalıb.

* * *

Sənin o məst gözün bir güli-xəndan kimidir,
Yatışın canlar alır, körpəcə ceyran kimidir.
O cəhənnəm nədi ki, qəlbimizə qorxu sala,
Nə behiştdir ki, ora qovğalı meydan kimidir?
Bu məhəbbət yolunu sanmaginan alçaq, uca,
Özünü dərk edənə yol da biyaban kimidir.
Hər nə çəksə başımız dünyada, vardır səbəbi,
Aqil insanlara dünya özü zindan kimidir.
Biri şal bağladı, əmmaməsi yoxdursa əgər,
Ona aciz deməyin, toxdu gözü, xan kimidir.
Məndə yoxdur o hünər ki, sözə ziynət də verim,
Könlümün istəyidir, o, sözə heyran kimidir.
Ayini, ehkamı rədd eyləyən insanlar, inan,
Saib, hər yerdə ola, bir-birinə can kimidir.

* * *

Söz onun tərifinə səy ilə imkan tapdı,
Tuti aynanı görüb, söhbətə meydan tapdı.
O gülün şəbnəmi düşsə, deşəcək daşı inan,
Bülbülün göz yaşı ilə böyüyüb, can tapdı.

Hər adam hər nəyə kim layiq idi, aldı onu,
Camı Cəm aldı, Xızr çeşmeyi-heyvan tapdı.
Başını köksünə əy, qal özün öz fikrin ilə,
Qönçə bu halı ilə şöhrəti asan tapdı.
Qəlbinin dərdi ilə çox da ümidsiz olma,
Zərrə öz qəlbinə daldı, təzə ümman tapdı.
Kim susa bildi, səadət açarın tapdı o da,
Çün sədəf susdu, axır dürri-dirəxşan tapdı.
Can alan sözləri vardır o susan ləblərinin,
Namənin şadlığını ilk dəfə ünvan tapdı.
Əfsus ol Fərhada kim, çapdı dağı, bilmədi o
Onu ki, hiylə tapıb, zor onu hardan tapdı.
Min əzab qarşıda var, indi hanı öylə adam,
Qəlbinin arzusunu olmadı nalan tapdı?
Çox tələsmə, çətin iş, tez dəyişib asan ola,
Quyudan çıxdı Yusif, sonra o zindan tapdı.
Bu fikirlərlə daha söyləmə, Saib nə tapıb?
Onu tapmış ki, nə Hatəm, nə Süleyman tapdı.

* * *

İndi hər bir nöqtədə əvvəlki qiymət qalmayıb,
Dolanıb dövran, daha insaf, mürüvvət qalmayıb.
Yüz risalə yazsalar, yoxdur gözümdə qiyməti,
Çünki Əflatun yazan o məna, hikmət qalmayıb.
Bir ömür mən zülfü tərif eyləsəm, vardır sözüm,
Bir yalan sözdür, deyirlər, qəlbdə söhbət qalmayıb.
Saib, al yarın əlindən sən piyalə, nuş elə,
Bu cahanda bir bina, bir saf imarət qalmayıb.

* * *

Kim ki, azadə təriqətdi, itaət eləməz,
İnanır, pərdədi səccadə, o, hörmət eləməz.
Qəfəs olmuşdu yeri istəsə, ya istəməsə,
O quşun ki, qanadı uçmağa hümmət eləməz.
Mey dolu kəştidə səccadə nədir, yelkən olar,
Kim ki, üzsüzdü, meyi içməyə qeyrət eləməz.



Yolu ləngər vuraraq getsək, onun var səbəbi
Üzrümüz olsa belə, kimsə məhəbbət eləməz.
Nəqşbəndanlığı[1] fikrində əgər məşq edəsən,
Onda məst olmağına bir nəfər heyrət eləməz.
Bəhrəsiz sərv ağacı qaldırar öz başın uca,
Saib, azadə təriqət buna cürət eləməz.

* * *

Dünən ol yar mənim halımı sordu, getdi,
Yüz şirin söz dedim, o dinlədi, durdu getdi.
Kim ki, gəldi bu cahan mülkünü abad elədi,
Qəm-kədər içrə öz ömrün başa vurdu, getdi.
Ancaq o kəslərə xoş keçdi həyat şimşək tək,
Doğulub sonra da şimşək kimi soldu, getdi.
Kimi də züvvar idi Kəbə evin görmək üçün,
Sanki bu yer kürəsi sadəcə yoldu, getdi.
Saibin də dolu idi ürəyi ümmid ilə,
Naümidlik kədərilə yenə doldu getdi.

* * *

Xoş olar, kim öz ləbin qoysa ləbi-peymanəyə,
Alnını kərpic kimi ya söykəsə meyxanəyə.
Röyada bir busə vəd etmiş ona məşuqəsi,
Bir uşaq tək aldanıbdır bu şirin əfsanəyə.
Kim bu yerdən ötsə sakit, zərrəcə eyb eyləməz,
Şamdakı mum ilə ip matəm tutar pərvanəyə.
Heç zaman mümkün deyil əfsunla bağlansın əlim,
Çox da ki, zülfün sənin hər vaxt dolaşmış şanəyə.
Güc alıbdır torpağım susmuş binalardan mənim,
Söz tutarmı heç dodaq hər vaxt dəyər peymanəyə?
Hökm edər kirpiklərim kim, tökməsin göz yaşını,
O açıb-örtər qapı bu evdə sahibxanəyə.
Zahidə diqqət elə, gör əl uzatmış bir hara,
İstəyir mey kuzəsin o bağlaya səddanəyə.[2]

[1] Nəqşbəndanlıq – nəqşbəndilik (təriqət).
[2] Səddanə – yüz dənəli təsbeh.

* * *

Qəzəbdən özgə, dünyada nə meyl etsən, halal olmaz,
Təhəmmül etməyən kəsdə, məsəldir ki, kamal olmaz.
Səmada incəlir Ay da, onu diqqətlə seyr eylə,
Elə zənn etmə cansızdır, ona heç vaxt zaval olmaz.
Çəməndə qönçənin qəlbi deyil bülbüldən asudə
O baş ki, köksə enmişdir, demək, onda xəyal olmaz.
İnanma, Məcnunun qəlbi məzarda rahat olmuş, yox,
Düzü, divanəyə xalqdan nahaqdan bir məlal olmaz.
O kəs ki, tanrıdan, xalqdan həya etməz bu aləmdə,
Həzər eylə o kəsdən sən, gecə-gündüz o, lal olmaz.
Sual da bir açardır, o kilidlənmiş xəsis qəlbə,
Kəramət əhlinə heç yerdə bir sorğu, sual almaz.
Udub öz qəlbinin qanın, yaşa, ömr eylə azadə,
Ürəkdən güc alan şəxsin həyatı qeylü qal olmaz.
De, Saib, qönçələr bir yol fəğan eylərmi bülbülçün?
Tikanlı dildən hüşyar ol, tikanlı dildə bal olmaz.

* * *

Sənin o ay camalın çoxlarını dərdə salıb,
Ay görüb hüsnünü öz dövrəsinə pərdə salıb.
Elə incəlmişəm hicrində sənin, tük kimiyəm,
Bir dəfə düşmüş idim dərdə, üzün bir də salıb.
İynə tikməz sinəmə çəkdiyi o göz dağını,
Kipriyin yarasını, gör, nə yaman yerdə salıb.
Tuti şirin dilinə valeh olandan bu yana
Öyrənib, sözlüyünə bir para sözlər də salıb.
İncə qəlbimlə necə mehriban idik o zaman,
Xəyalın ortaya gircək, araya pərdə salıb.
Necə asudə idi qovğalı işdən Saib,
Eşq onun qəlbinə atəş, hələ bir şər də salıb.

* * *

Mən ki, odda yanmışam, cənnət, cəhənnəm bilmərəm,
Məstəm, ol bütxanəni heç Kəbədən kəm bilmərəm.
Ruzimi, aydın deyildir, ilk dəfə kimdir yazan,



Yazdı o, piri-xarabatımı, ya Hatəm, bilmərəm.
Kəbənin kövsər suyu şordur, məni aldatma, gəl,
Al şəraba şor suyu kim qatdı, mübhəm, bilmərəm.
Bir yalan söz yazmağa meyl eyləməz heç vaxt qələm,
Söylə, bəs harda yazıldı tövbənaməm, bilmərəm.
Min dəfə öpsəm o mey camın, yenə mən doymaram,
Eylə məst ollam, ürəkdə qalsa dərd, qəm bilmərəm.
Mən ki, heyran olmuşam, Saib, o mərmər sinəyə,
Könlümün dərdin silən bir ayrı aləm bilmərəm.

* * *

Dostluğun çox şərti var, ancaq qanında yox sənin,
Dost üçün şam tək alışmaq da canında yox sənin.
Torpağından güc alıb azad ucalmış sərv tək,
Kim deyir ki, yox ucalmaq imkanında, yox sənin?
Çəkdi xəncər al günəşin üstünə bayram ayı,
Qaşını harda görüb ay ki, yanında yox sənin.
Hüsnünə heyran olan göylər qızı atəş saçar,
Sənsə sakit durmusan, bir cövlanın da yox sənin.
Dərdə bax, qəlbim səni biganədən eylər soraq,
Bilməyir ki, özgələrlə peymanın da yox sənin?
Sədd çəkir nazın yolumda, yoxsa birdir qəlbimiz?
Məndən ayrı çün bu yolda qurbanın da yox sənin.
Söyləyin, ümmid elə, Saib, o yarın lütfünə,
Bir şikarsan yoxsa, heç bir ad-sanın da yox sənin.

* * *

Ömrümün hər anı yox, illəri sürətlə keçib,
Mən vüsal arzuladım, günlərim həsrətlə keçib.
Mən bu bağın, çeşmənin qəlbi yanıq bülbülüyəm,
Novbaharım, xəzanım cümlei-möhnətlə keçib.
Az qalır, torpağa dəysin yeriyəndə sifətim,
Hər nəyim vardısa, gəncliklə, o nemətlə keçib.
İndi əfsus ilə ah çəksəm əgər, vardı yeri,
Arzuma çatmamışam, ömr elə zillətlə keçib.
Çırağım sönmüş idi, bir daha yandı, o zaman

Qəbrimin üstə nigarım gəlib, hörmətlə keçib.
Qəzəbi loğma kimi udmağıma eyb eləmə,
Ondan özgə, boğazımdan hamı minnətlə keçib.
Bu gözəllər küçəsindən yolumuz düşdü yenə,
Saib hər vaxt buradan keçsə, o cürətlə keçib.

* * *

Tikan üstə oturam, xoşdu, nə ki, nadan ilə,
İldırım olmasa, göylər qaralar tufan ilə.
Səyyadın mənzili əvvəlcə fəqət çöp-çöp idi,
Ayıra bilməyirik ovçunu indi xan ilə.
Kim paxıl olmasa, qorxmaz o, cəhənnəmdən, inan,
Çün paxıllıq özü oddur, dolanır insan ilə.
Bizi bu beş gün olan ömr gətirmişdi cana,
Vay o Xızrın halına, ömr edəcək dövran ilə.
Ölümü sadədil insan çox uzaq zənn eləyər,
Bir qəbirdir hər otaq, hey dolur o mehman ilə.
Dil bıçaq tək itidir, doğrayar öz ömrünü də,
Bil, günahsız adamın yoxdu işi zindan ilə.
Günəşin gözlərini qəm tozu tutmaz, Saib,
Görür hər kəs cahanı qəlbi verən imkan ilə.

* * *

Mey coşan vaxta əgər ki, küpü yerdən qoparar,
Məstliyim meyxananın səqfini birdən qoparar.
Dolasa mey qolunu boynuna o qarlı dağın,
Zarafat bilmə, dağı zorla kəmərdən qoparar.
Məcnunun nalə səsi düşsə biyabanə əgər,
Leyliyə çatsa bu səs, bil ki, şəhərdən qoparar.
İynə düşmüşdü bu yolda, onu İsa götürüb,
Sən nahaq qorxma, Məsiha səni şərdən qoparar.
Mən nəyəm ki, məni söz ilə də tərif edələr,
Aynaüzlüm məni hər sirli xətərdən qoparar.
Saibin dostlarını görməyə artıb həvəsi,
Onu bülbül ki, görər, qovğanı birdən qoparar.



* * *

Eşq dağında belə şöleyi-qeyrət qalmayıb,
Soyuyubdur al günəş, onda hərarət qalmayıb.
Ah ilə bayraq ucaldan bir ürək yoxdu daha,
Sərvidən xali olub, indi o cənnət qalmayıb.
Kəhrəbanın önünə qaçmır əgər yolda saman,
Bil, pozulmuşdu nizam, çox şeydə hikmət qalmayıb.
Dəryada təmkin, əgər sellərdə sürət yoxdusa,
Məst başlarda, demək, şuri-məhəbbət qalmayıb.
Lalə üzlərdən uçub çünki həyanın rəngi də,
Hətta cənnət meyvəsində bir təravət qalmayıb.
Çün bulud saqi əlində çevrilib oldu sərab,
Bu səbəbdən gövhəri-meydə səxavət qalmayıb.
Xızr abi-heyvanı İskəndərə verməz nişan,
Ruzigarın xislətində heç mürüvvət qalmayıb.
Dünyanı salmış qəribə bir xəyal titrətməyə,
Çün qənaətdə daha əvvəlki ləzzət qalmayıb.
Tapmadım bir əhli-dil ki, qəlblərə məhrəm ola,
Mən dolandım çox şəhər, çox-çox vilayət, qalmayıb.
Yoxdu bir asudə yer ki, daldalanmaq rəsm ola,
Çünki asudə adında indi nemət qalmayıb.
Bu susub əyləşməyi siz yazmayın heç şadlığa,
Yox, daha bizdə həvəs, bir də şikayət qalmayıb,
Heç də cənnət meyvəsindən pis deyil qəlbin qanı,
Əfsus olsun ki, daha əhli-fərasət qalmayıb.
Şərqin o ağ saçların Saib görüb peşman olub,
Əfsus olsun tövbə üçün əldə fürsət qalmayıb.

* * *

Şişəni su ilə doldur, gər şərabın yoxdusa,
Qayığı çəkmə sudan, bir iztirabın yoxdusa.
İstəsən, əlvan gül ilə doldurarsan qoynunu,
Bağıban tutmaz xəbər, onla hesabın yoxdusa.
Gövhəri şirniylə bu əyyamda kim eylər əvəz?
Busə al, ver canını, özgə savabın yoxdusa.
Hər zaman mənalı söz təsir edər, aydındı bu,

Söz uzatmaq eybdir, doğru cavabın yoxdusa.
Çöhrəni məndən çevirmə, arxadan görrəm onu,
Sinəmə əksin düşər üzdə niqabın yoxdusa.
Saldığın xırman gözümdə bənzəyir bir danəyə,
Danəni Ənqa[1] udar, artar, əzabın yoxdusa.
Ürfi ilə Talibin tərifin eylə hər zaman,
Eybidir, Saib, sənə, dosta kitabın yoxdusa.

* * *

Hər kəsin meylə dolu kuzəsi var, aləmi var,
Dünya cənnətdi ona, özgə nə dərdi, qəmi var?
Başını saqi alarsa dizinin üstə əgər,
Zənn edər İsadı o, saqi deyil, Məryəmi var.
Gül dodağında yarın mey quruyub yaqut olar,
Sanki gül yarpağı üstündə təzə şəbnəmi var.
Ətəyimlə silirəm, Saib, üzümdən qəmimi,
Bilmirəm, özgə bu dərdin daha nə məlhəmi var?

* * *

Bu bağın gülləri sənsiz tikandır,
O camın, bax, dodağı lalə-qandır.
Hara salsan nəzər, xənçərdi sanki,
Ayaq basma, nəzər eylə, amandır.
Sinəm dağı olub dünyaya mərkəz,
Küləklər yaramın ətrin yayandır.
Tikan tutmuş gülün nəbzin əlində,
Odur ki, bülbülün halı yamandır.
Dənizdə dalğalar qaynar aramsız,
Gözüm yaşı düşən dərya tufandır.
Xərabatda həmişə bayram olsun,
Kuzəylə mey nigara mehribandır.
O mey rəngli dodağın həsrətilə
Xumar olmuş gülün ətri talandır.
Gülə dırnaq ucuyca yoxdu meylim,

[1] Ənqa – əfsanəvi quş.



Bu gülşəndə mənə qəmxar tikandır.
Çalış, Saib, əlacın eylə dərdin,
Bu dünyanın işi bir imtahandır.

* * *

Yarımın sinəsi ağdır təzə qardan, görünür,
Hər işin axırı əvvəlcə qərardan görünür.
Qəbrimin torpağı da eşqimi elan eləyər,
Dəryanın dalğaları çünki kənardan görünür.
Ümmanın halını bilmək diləsən, dalğaya bax,
Göz yaşı axmasa, qəlbin qəmi hardan görünür?
Çün hüma uçdu, onun kölgəsi də yox olacaq,
Dövlətin qüdrəti, əlbəttə ki, vardan görünür.
Eşq dərdi məni bimar eləyib, dəymə, təbib,
Yoxdu bir qəm çəkənim, təqsiri yardan görünür.
Çalış ömrün baharında götür öz faydanı son,
Hər ilin bəhrəsi çün fəsli-bahardan görünür.
Aynanın ardına rəng çəksən əgər, parlaq olar,
Saibin qəlbi tutulmuşdu qubardan, görünür.

* * *

Bir söz ümmanı coşar dalğalı sinəmdə mənim,
Dünyaca mənə yatır susduğum hər dəmdə mənim.
Nə zaman məst oluram, mey küpü də cuşa gəlir,
İtirir huşunu çox meygədə qüssəmdə mənim.
Dərdini gəzməginən pərdəli aləmdə nahaq,
Tapacaqsan qucağımda uyuyan qəmdə mənim.
Hər təzə söz ki, söz əhli bəyənib fəxr eləyir,
Bil, yadımdan çıxıb o, məst olan əyyamda mənim.
Fələyə yüksələn o təndirimin tüstüsüdür,
Ayağım tozudu göy qübbəli bu damda mənim.
Göylərin pərdə dalında görünən kəhkəşanı
Öz əlimlə alışır hər gecə bayramda mənim.
Gətirib sufiləri cuşa bu vəhdət şərabı,
Sonra da heyran edib odlu sözüm həm də mənim.
Ya xərabatda, ya da meyxanada doldu yaşa,

Dərdlərim təlim alıb çünki o aləmdə mənim.
Sanma dərviş libası geyməyimi pərdə mənə,
Bənzərim yoxdu, inan, zahidə heç kəm də mənim.
Eşqə mən həlqəbeguş[1] bəndəyəm, aləm də bilir,
Kaş yaman gözdən uzaqda qala həlqəm də mənim.
Saibəm, çatmayacaq bəlkə, sözüm bircə kəsə,
Nə qədər eşqin əli gəzməsə sinəmdə mənim.

* * *

Şərabın köhnəsi çün ruhi-rəvanımdır mənim.
O mənim həmsöhbətim, pirim, cavanımdır mənim.
İki dünya kədərindən edib azad o məni,
Camdakı xətlərə bax, qəmdən amanımdır mənim.
Çırağım günlə bərabər dayana bilməsə də,
Dünyada təkcə ürəkdən o, yananımdır mənim.
Baharın od nəfəsi qarsır əgər lalələri,
Məni də odda yaxan fəsli-xəzanımdır mənim.
Dünya nemətlərinə salmadım ömrümdə nəzər,
Əriyən şam deyil, o şam kimi canımdır mənim.
Şadam hər sürət ilə çapsa atın indi fələk,
Fələyin əbləğ atı yorğaçapanımdır mənim.
İsfahanda nə qədər şeir yazıbsan, Saib,
Hamısından bu qəzəl ali nişanımdır mənim.

* * *

Eşq dərdilə ölərsənsə, bu, dünyaya dəyər,
Xızrın o, ömrünə, ya hökmi-Məsihayə dəyər.
Hanı Yusifdə o cürət ki, təhəmmül eləsin?
Yəqubun həsrəti yüz eşqi-Züleyxaya dəyər.
Abı paltarda nə dilbər görünür hüsnü yarın,
Bizi bu görkəm ilə salsa o, sevdaya, dəyər.
Sənə qurban olanın halı pərişan olmaz,
Bu halı görmək özü cümlə tamaşaya dəyər.
Aynanın qəlbi darılmır, o sevir əks eləsin,

[1] Həlqəbeguş – qul.



Aynaya bənzəyən alnın neçə səhraya dəyər.
Eşq üçün fərq eləməz ki, bu zəifdir, o qəvi,
Eşq sevdası alışsa, odu mənaya dəyər.
Saib insafla əgər salsa nəzər yar üzünə,
Xalı dan ulduzuna, qaşlarısa aya dəyər.

* * *

Gülməyin gizlətsə kim, sanki gülü pünhan edər,
Kim açıb ağzın gülər, bir bağçanı viran edər.
Kim ağır vaxta çatarsa xalqının imdadına,
Damlanı öz hümmətilə, eylə bil, ümman edər.
Göz yaşın kim düşmənindən gizlədə bilsə əgər,
O bu hal ilə yəqin öz düşmənin nalan edər.
Bir qəzəb dünyasını kim söndürüb xamuş edə,
Sanki yanmış bir düzü lalə dolu meydan edər.
Söz qananlar məclisində kim susub dursa yəqin,
O, tikanla sinəsin başdan-başa al qan edər.
Şadlığın kim gizlədərsə, qəsd edər öz bəxtinə,
Eylə bil, öz qiymətin xalqın gözündən yan edər.
Laləli bir çöldə kim al rəngli mey çəksə əgər,
San, şəhidlər qəbrini o şam ilə əlvan edər.
Kim öz eşqin gizlədib qəlbində saxlar, Saib, o,
Sən elə fikr eylə ki, bir parça od pünhan edər.

* * *

Ürəyin sirrini o qan axıdan gözlər açar,
Hər evə baxmaq üçün ya baca, ya pəncərə var.
Arif insan hara getsə, qayıdar tez vətənə,
Şam da bir yerdə yanar, şöləsi ətrafa uçar.
Dünyanı qaydaya salmaq elə asan da deyil,
Sanki nadan bir adam mıx götürüb nalı yazar.
Kim yetişsə kamala, o ucalar ərşə qədər,
Sünbülə döndümü dən, yığ onu, xırmana apar.
Göz yaşı pak eləyir sinədən həsrət tozunu,
Ətək ilə silinən aynada heç tozmu qalar?

Sordu xalqın qanını zalım adamlar zəli tək,
Teşnə insan yuxuda hey suyun ardınca qaçar.
Eşqin ilk şərti budur, Saib, özündən keçəsən,
Kim özündən keçəcək, o tapacaq burda qərar.

* * *

O dupduru həyat suyu, bu al şərab, səfası bir,
O ayrı-ayrı pərdənin axır çıxır nəvası bir.
Ya Kəbəyə inanginən, ya bütpərəstlik eylə sən,
Bu yollar ayrı-ayrıdır, axırda rahnüması bir.
Bu mən, bu biz, dedikcə hey yamanca ayrı düşmüşük,
Ürək-ürəklə birləşər, olar onun sədası bir.
Bu dost edir canın fəda, o dost çatırsa kamına,
Qəza oxu, ya neyşəkər, ləzzəti bir, cəzası bir.
Qərəzli insan olmasa, həyatda olmaz ayrılıq,
Günəş üçün bu dünyanın olar şahı, godası bir.
Bahar nədir, payız nədir, soyuq və isti bilməz o,
Kimin ki, şam ağacı tək olar fəqət əbası bir.
Şərabla saqi olmasa ürəkdə qəm, kədər olar,
Bu dərdlərin təbibi bir, əlacı bir, dəvası bir.
Şikayət eyləmə yarın cəfası çoxdu Saibə,
Çün eşq olan zaman yarın cəfası bir, vəfası bir.

* * *

Çöhrəni görsəm, qəm artar, görməsəm, mümkün deyil,
Bu gülü dərsəm günahdır, dərməsəm, mümkün deyil.
Hər nə var məşuqdan özgə, hicran üçün pərdədir,
Yusifin otrin verir köynək, desəm, mümkün deyil.
Var şəhidlər yarası sinəmdə ulduzlar sanı,
Söyləmə indi mənə sən, çəkmə qəm, mümkün deyil.
Meyvə dəyməzsə, budaqdan ayrılıb düşməz yerə,
Mən də ol kal zahidə dərs verməsəm, mümkün deyil.
Mənzili etsəm əvəz, bil, laməkanlıqdır[1] yerim,

[1] Laməkan – məkansız.



Dövrəmə dövr etməsə aləm bu dəm, mümkün deyil.
Qönçəni sübhün yeli hər vaxt çıxardar düymədən,
Məndə ol sübhün yeliycə var kərəm, mümkün deyil?!
Hər kəs öz qeydindədir, hər kəs bəzər öz surətin,
Gövhərin etmək suyun əl ilə cəm mümkün deyil.
Çün gülüstanı tutubdur güllərin ətri tamam,
Olmasa bülbül gözü məhbəsdə nəm, mümkün deyil.
Bisütun Fərhad kimi bir aşiqə qəsd eylədi,
Gər onu torpaqlara mən sərməsəm, mümkün deyil.
Bir həyatdır aşiqə ol zülfünün hər bir teli,
Mən ona bağlanmışam, bil, hörməsəm, mümkün deyil.
Tövbə et gənclikdə sən, hər bir günahdan xali ol,
Diş də düşsə, yar ləbindən öpməsəm, mümkün deyil.
Cəzb edər, Saib, səni, gəl palçığa basma ayaq,
Sonradan peşman olub çəkmək qədəm, mümkün deyil.

* * *

Aləmdə mənim ayinədarım ürəyimdir,
Bülbül də mənəm, bağu baharım ürəyimdir.
Özgə çırağın neyləyirəm qəbrimin üstə,
Sinəmdə yanan şəmi-məzarım ürəyimdir.
Bir ümmana düşdüm ki, onun sahili yoxdur,
Arxam, köməyim, hər havadarım ürəyimdir.
Hər bir düyünü fikr gücüylə açırıq biz,
İndi düyünü açmağa varım ürəyimdir.
Olmuş günəşin süfrəsinə ay kimi mehman,
Bu süfrədə qiymətli nübarım ürəyimdir.
Çün balu-pər axtarmaq üçün şərmisaram mən,
Ov etməmişəm, təkcə şikarım ürəyimdir.
Yorğun bədənimdə tükənibdir daha taqət,
Diqqət ilə bax, sürməli yarım ürəyimdir.

* * *

Vəslə çatdıqsa, yenə qəmdən ürək şad olmayıb,
Gəlsə də bayram, yenə bu tiflə imdad olmayıb.
Ey nəsim, əl çək, o yarın zülfünə dəymə daha,

Çün sənin dırnaqların həsrətdə şümşad olmayıb.
Tişəni Fərhad çalaydı öncə Xosrov başına,
Bəllidir, bu işdə o, Xosrov tək ustad olmayıb.
Köksünə dağ çəkdilər, lalə yanıb kül olmadı,
Bu yanan könlüm mənim bir an da bərbad olmayıb.
Almasa minnət yükün öz çiyninə sərvim, yenə
Bu çəməndə, bax, təməllüqdən o, azad olmayıb.
Saib azadlıq xəyalıyla giriftardır hələ,
Hansı quş zirək olub qurbani-səyyad olmayıb.

* * *

Üzünə zülfünü salsan, daha ənbər nə gərək?
Bu odun şöləsi var, indi səməndər nə gərək?
O qara zülf ilə kakil bəs edər gül camala,
Bir də bu hüsnə bəzək vurma mükərrər, nə gərək?
Aşiqi heyran edən al yanağa xal qoyma,
Gün çıxan vaxtda səmada daha əxtər nə gərək?
Heç görübsənmi qona şeh günəşin çöhrəsinə?
Sırğanı almas elə, yoxsa ki, gövhər, nə gərək?
Su kimi aydın olubdur sənə hər əhvalım,
Bir şirin söz de mənə, yoxsa o kövsər nə gərək?
Hər kəsin kölgəsi yoxdur, sığına kölgəyə o,
Sinəsi dağlanana eşqidə rəhbər nə gərək?
Kim ki, dəryanı üzübdür, ona sel neyləyəcək?
Kim meyi küpdən içirsə, ona sağər nə gərək?
Yaralar təzə olan vaxtda sinə qanlı olur,
Bu təzə yaraya dırnaq, ya da neştər nə gərək?
Harda Saib oxuyar şerini, san, bülbül ötər,
Bülbülə nəğməsini ötməyə dəftər nə gərək?

* * *

Yaz çağı bülbül ötər, həm də ki, bağban sevinər,
Gül olar nəğməsinə bülbülün heyran, sevinər,
Aşiqə can verir o al yanağın danə təri,
Elə bil, Xızr suyundan bu gülüstan sevinər.
Qəmi qəlbdən çıxarıb qovmağı sən sanma asan,



Bir gün ömründə olur qönçə də xəndan, sevinər.
Şimşəyə mane olarmı buludun gur yağışı,
Göz yaşı axsa əgər, qəlb evi asan sevinər.
Gül açanda dodağın sanki təbiət də gülür,
Bu gülüşdən şad olur yer üzü, yeksan sevinər.
Ürəyi qəm bürüsə, dünya da matəm görünər,
Saibin qəlbi bu şadlıqda doğrudan sevinər.

* * *

Mey nə lazımdır, o nərgiz baxışın xoşdu elə,
Sürmə çəksən, bəs edər, çünki o, bihuşdu elə.
Ünvanından bilinir namələrin məzmunu da,
Tərcümanı neyləyir ol kəs ki, xamuşdu elə.
Sanki göz danəsidir sünbülümün buğdaları,
İldırım xırman ilə, bəlkə, həmağuşdu elə.
Gül kimi incə belə istəmirəm qol dolayım,
Cənnətin ətri uzaqdan bizi vurmuşdu elə.
O sitəm ölkəsinə yazdığım o namələrim,
Unudulmuşmu tamam, harda qalıb düşdü elə?
İstəyirsən qulağın dinc ola söz-söhbətdən,
Çəkil öz xanənə, Saib, ora xamuşdu elə.

* * *

Gül köynəyini parçalayan, bəlkə, nəsimdir?
Vaxtsız gülüşü qönçəyə dəhşətli qənimdir.
Daim vətənində qərib olmuşdu sənətkar,
Sən aç sədəfin köksünü, bax, dür də yetimdir.
Təkcə kərəm ilə cahana hökmüran olmaz,
Təkcə kərəm aləmdə olan qəmlərə kəmdir.
Yaz vaxtı köçün vardı, inan, özgə səfası,
Şəbnəm gülün üstündə nəsim saldığı nəmdir.
Səhrada kimin dərdinə dərman tapılıbdır?
Şərh əhlinin hər dərdinə dərmansa həkimdir.
Taleylə barış, xatirini cəm elə sən də,
Naz-nemət içində yaşayır kim ki, həlimdir.

Hər nöqtə ki, məchuldu, var öz şərh-əlacı,
O nöqtə də erşin nəzərində çox əzimdir.
Hər nəqşə ki, ümmidlə könüllər eləyir şad,
O pərdəni açmışdı o insan ki, nəimdir.[1]
Hər qəlbiişıq insana yarpaqda da sirr var,
Nurdan yaradıb yarpağı, dərk eylə, o kimdir?!
Saib günah etmişsə iki dünyada, ancaq
Peşman da deyil, çünki xudavənd kərimdir...

* * *

Bizdən ucada, bəlkə də, bir sirli cahan var?
Varsa, orada özgə həyat, özgə zaman var.
Nə qaldı bizə, fikr eləsən – bircə təmənna,
Aşiq sinəsində o təmənnanı duyan var?
Övladi-bəşərdən kənara varmı bir insan?
Kim görmüş onu, varmı hanı, harda nişan var?
Göz yaşı tökürlər ümidin matəmi üçün,
Bu yer kürəsində nə qədər abi-rəvan var?
Əfsus ilə ahdır – ucalır hey sinələrdən,
Bu bağ verəcək tazə bəhər, bir də güman var?
Sən aləmə baxmaqda, çalış, sadədil olma,
Bu torpağın altında məgər özgə cahan var?
Div göstərir hərdən mələyə sirrili ayna,
Bəlkə, bu cahanda yenə bir sirri-nihan var?
Dünyanı dolan sən də günəş tək, halalındır,
Pak duyğulu insanlara bundan nə ziyan var?
Can tutisinin sözləri heç vaxt acı olmaz,
Sinəndə onu əks eləyən ayna, inan, var.
Gəlmirsə iki dünyada bir iş ki əlindən,
Bir küncə çəkil, gözlə, hələ ömrə aman var.
Saib desə öz dərdini, qan ağlayacaqdır,
Bu məclisimizdə nə qədər dərdi duyan var.

[1] Nəim – nemət verən, nemətləndirən.



* * *

Mən nə təxtü-tac, nə də mülki-Süleyman istərəm.
Kaş ki, məndən razı qalsın nazlı canan, istərəm.
Qalmışam bir taxta üstə mən bu sakit dəryada,
Dalğası hay qoparan bir coşqun ümman istərəm.
Bu yalançı dünyaya gülmək dilər qəlbim mənim,
Sübh tək gülmək üçün mən də bir imkan istərəm.
Tufana cövlan üçün meydan gərəkdi çox geniş,
Qəlbimin tufanına mən bir də cövlan istərəm.
Yox kəvakib nuruna çün ehtiyacım ay kimi,
Ol günəşdən süfrəmə mən istəsəm, nan istərəm.
Bir qarışqatimsalam, yox etibarım torpağa,
Şah Süleyman təxtinə eylərsə mehman, istərəm.
Bu ölü dünya buraxsa pəncəsindən gər məni,
Qəmdən azad dost ilə mən əhdi-peyman istərəm.
Cəddimin yanında yatsam, sanma rahat olmaram,
Yusifəm, qardaşlarım olmuşdu "düşman", istərəm.
Cənnətə dərban qoyarlarsa məni, verməm riza,
Aynadar etsə məni o mahi-taban, istərəm.
Arzusuz bu qəlbə hərgah etsələr bir mərhəmət,
Hər nə imkan eyləyib dost versə ehsan, istərəm.
Bu şəhər sıxdıqca, Saib, məndə taqət qalmadı,
Bir geniş səhra, yaşıl çöllük, biyaban istərəm.

* * *

Dostluğu namədə kim bilsə, o, biganə olar,
Şama dostluq eləyən sidqilə pərvanə olar.
Birdi zünnarla müqəddəs geyim o kəslərə ki,
Kəbədən üz çevirib azimi-bütxanə olar.
Ürəyin parçalana eşqilə, qəm çəkmə buna,
O ürək parçaların zülfə dəyib, şanə olar.
Kim ki, Fərhadlıq edə, sındıra öz tişəsini,
O kəsin bu əməli eşqidə tiflanə olar.
Çəkinər, kölgəsini görsə ürəksiz hər adam,
Sitəmi-yara dözən aşiqi-divanə olar.
Hümməti olmasa ruhun bədəni tərk eləməz,

Qanadı sınsa quşun, onda qəfəs lanə olar.
Əhli-dil ol ki, yetişsin fələyin feyzi sənə,
Şama şöhrət gətirən eşqidə pərvanə olar.
Ovçu görməkdi bizim qismətimiz aləmdə,
Özgələr harda olar, ruziləri danə olar.
Qəlbinin fikrinə Saib nə üçün qalmalıdır,
Bu qara evdə məgər Leyli üçün xanə olar?

* * *

Yüz heyif, keçdi zaman, gül kimi canan soldu,
Baharın fəsli ötüb, gül də pərişan oldu.
O qara xal elə yandırdı ki, öz dairəsin,
Kim ona baxdı, inan, qəlbinə atəş saldı.
Kirpiyin kölgəsi incitdi yarın gül üzünü,
O bahar göyləri tək nərgizi gözlər doldu.
Bundan artıqmı olar qəm, bu elə bəsdi mənə,
Çün xarab olmuş evim sellər axan bir yoldu.
Faydası yoxdu məzarım başına lövhə vurub,
Yazalar ki, günahım yoxsa, savabım boldu.
Gəl yada salma nahaq bir də cavanlıq dəmini,
İldırım tək çaxaraq, göydə yanıb məhv oldu.
Sən mənə vədə verirsən, beləcə ömr keçir,
O gözəllik yolunun səmti, de, sağdı, soldu?
Saibə birdi o yarın otağı, astanası
Etibarı yox isə, sərv mənimçin koldu.

* * *

Fələyin çarxı əzib, qalmamış heç kəsdə nəfəs,
Bacası yoxsa evin, şam kimi sən yanma əbəs.
Dövranın dönməsinə diqqət ilə bir nəzər et,
Dünyanın işləri, gör, düzmü gedir, yoxsa ki, tərs?!
Mehrini salma uşaq tək bu oyuncaqlara sən,
Ömrüdür təsbehin hər danəsi, sən vermə əbəs.
Fələyin həlqələri bir cürə əfğan eləməz,
Zəncirin həlqəsinə bax ki, ucaldar neçə kəs.
İşığın keçməsinə iynə gözü bəs eləyər,



İynəcə var ümidin, o ümidə eylə həvəs.
Ürəyim qanla dolubdur bu şərab içməkdən,
Dərdimi mey ovudur, içməyərək neynim bəs?
Daha yüksəlməyinə etmə ümid sən, Saib,
Qurumuş toxmu görübsənmi göyərsin bir kəs?

* * *

Bu həyatda hamı olmuşdu giriftar özünə,
Unudub haqqı tamam, tək ümidi var özünə.
Yetimin divarını Xızr da tikməz yenidən,
Hər kəsin fikri budur, tikdirə divar özünə.
Şam da pərvanə üçün göz yaşını tökmür, inan,
Sübh olur, ağlayır indi o da zar-zar özünə.
Qönçə həsrət tikanın bülbülə qoymazdı dəyə,
Amma göz açmağı qoymur bu tikanlar özünə.
Kimdi özgə yükünü alsın onun çiynindən,
Hamı İsa kimi olmuşdu cilovdar özünə.
Əzəli nur düşübdür dərü divara tamam,
Yusif öz hüsnü ilə oldu səbəbkar özünə.
Saibin yox nəzəri çün buludun gövhərinə,
Bəsdi öz təbi, olub indi göhərbar özünə.

* * *

O dodaqlar ki, susur, sanma ki, sözsüzdür hər an,
Çox zaman sakit olur çün ürəyi sözlü olan.
Kamanın qoynuna girdikdə susur ox da belə,
Kənara çıxmaq üçün ortaya girdim mən əlan.
Nə ürək peşman olubdur, nə də əfsus demişəm,
Nə zaman əl çalıram, kirpiyimi çallam, inan.
Pambığı at qulağından, sökülür dan yeri, bax,
Başqa bir mənası var sübh sözünün, olsa duyan.
Sürmə çəksən gözünə, bil ki, gözün nura gələr,
Taleyin bəd gətirirsə, elə sən tərki-məkan.
Saib öz naməsini yazdı ürək qanı ilə,
Bir Yəmən ləli kimi alsın onu namə alan.

* * *

Meyə batmış dodağın sanki dönüb sağər olub,
O qara xal yanağında, elə bil, ənbər olub.
Kim əyibdir başını sinəsinə fikrə dalıb,
San, sədəf danəsidir, bəhrəsi də gövhər olub.
Qəlbimiz hansı sədəfdən arasın dürrü, deyin,
Dənizin ağ yalı qəlbimdə yanıb əxtər olub.
Gəl, xəbər alma mənim varlığımı-yoxluğumu,
Alov idim, yanıb ömrüm, saralıbdır zər olub.
Müşkül işdir ki, çətin iqlimə sən tablaşasan,
O qılıncın yarası indi bizə şəhpər olub.
Saibin fikri çiçək tək bəzəyib çox çəməni,
O gözəl sözlər üçün lalə dönüb dəftər olub.

* * *

Sanma hüşyarlığı sən hikmətdir,
Bu cahanın hər işi zillətdir.
Şəhərin şeyxi olub guşanişin,
Bu da bir cür tələdir, şöhrətdir.
İntiqam hissini boğmaq özü də,
Bizcə, ey xacə, böyük nemətdir.
Kim ki, zorla alır öz abrusunu,
Bu da alverdi, fəqət, himmətdir
Ki, verib fikri su ilə çörəyə,
Bir dəyirmandı işi, zəhmətdir.
Bir gəmi sahilə çıxmaz buradan,
Bu dəniz sahili yox, vəhdətdir.
Gün başı üstün alıb, şehsə yatır
Gül yanağında, bu da qəflətdir.
Kim buluddan göhər almış, Saib,
Bil, sədəf tək o da pak niyyətdir.

* * *

Xoş olur pirə oturmaq, vəli gəzmək cavana,
Oxa düzlük yaraşır, əyrilik ancaq kamana.
Rəng dəyişdikcə gözə xoş gəlir hər bir çaları,



Biri yaz məftunudur, başqası vurğun xəzana.
İl boyu gül seli var köksümün altında mənim,
Onca gün yazda gülüstan güləcək gül yığana.
Faydası yoxdu payızda gülə bağban üzünə,
Gül olan vaxtda gülüş çox yaraşar, bəlkə, ona.
Qəfəsə salsan əgər bülbülü, həsrətlə yanar,
Zövq alar, bağda əgər uçsa fidandan-fidana.
Uşağa südlə şəkər versən, o, sakit olacaq,
Zahidi cənnətin eşqi gətiribdir imana.
Özgələr cəhd eləyir dostu çox olsun, Saib,
Düşmənə dost olacaq kim ki, əgər dostu dana.

* * *

Ehtiyacın varsa da, qəlbən tox olsan, yaxşıdır,
Dəryadan minnət belə çəkməzsə insan, yaxşıdır.
Bəxtsizlər eşqidən çəksə bəlalar, incimez,
Şor sudan qorxmaz balıq, hər yerdən ümman yaxşıdır.
Yol gedən tək olsa, tək də qət edər axır yolu,
Hər iki aləmdə kim tək etsə cövlan, yaxşıdır.
Hiyləgər bez köynəyi geysə, təkəbbürlə gəzər,
Əyninə atlas geyə saf qəlbli insan, yaxşıdır.
Şənbənin fikrin çəkər cümə gələndə hər uşaq,
Günləri sən xoş keçirt, var öldə imkan, yaxşıdır.
Dəryada yelkən açıb sərxoşlar hay salmış nahaq,
Kuzələr salsa haray məclisdə, ondan yaxşıdır.
İldırımdan yansa xalqın xırmanı, dargöz adam
Əl uzatmaz, söyləyər, yansa bu xırman, yaxşıdır.
Ay buludda gizlənəndə ayrı cür görkəm alar,
Çün gözəl çöhrə gecə örpəkdə pünhan yaxşıdır.
Hər ötən gün sonradan xatırlanır xoş röyatək,
Fikr edirsən ki, dünən hətmən sabahdan yaxşıdır.
Hər işi yüz ölçmədən beş biçməyin yox faydası,
Sən də, Saib, hər işi yüz ölç, doğrudan yaxşıdır.

* * *

Varına eyləmə sən çox etibar,
Günəşi göydə gəzən yerdə tapar.
Qurumuş çeşmədi yay fəsli bulud,

Bəhrəsiz əldə görübsənmi qabar?
Qar kimi əl kimə vermiş də xeyir?
Zəhmətin bəhrəsi də gövhər olar.
Xəsisin zəhr dadar hər tikəsi,
Qan kəsif oldumu neştərlə çıxar.
Səhərə qalmış bir ulduz kimidir
Şam işığında yatan nazlı nigar.
Gözəlin xisləti də xoş olacaq,
Surətin məna ilə vəhdəti var.
Lalənin bağrı kimi bağrı yanar,
Gecə-gündüz meyə kim olsa düçar.
Özgə eybin deməyi sayma hünər,
Özün öz eybini gör, ver də qərar.
Rəngi yox, ətri yox, o şeh kimidir,
Saib, hər kəs mey içib olsa xumar.

* * *

Eşq hər bir gözələ daireyi-əfsundur,
Leylinin bəxti qara oldu, səbəb Məcnundur.
Gözümüz qanla dolub, səhrada batmışdı tikan,
O İsa iynəsini sancma ki, paltar yundur.
Qəlbi daş insanı da eşq ucaldır, böyüdür,
Aparan Şirini qəsrə, deməyin, Gülgündür.
Pis adamlar əlini öpmək əgər lazım ola,
Belə alçalmağa kim məcbur ola, məhzundur.
Şadlığımdan gözümün kirpiyi örtülmədi çün
Bu gecəm körpə əlindən hənalı, gülgündür.
Tükü tükdən seçənə kimsə əsir olmaya kaş,
Həmişə şanəyə zülf meyl eləyər – məftundur.
Saibin sorma bu yoxsulluğunun sən səbəbin,
Sərv yoxsul görünər bağçada, bu qanundur.

* * *

Bizə bu eşq qəmindən də böyük, söylə, nə var?
Mənim ümman qəmimə kim deyir ümmana sığar?
Biz ömür karvanını qəflətə verdik getdi,



Çün yatarkən bu ömür karvanımız yolda olar.
Bizə bir taziyana oldu ağarmış tükümüz,
Gün gəlib yel tək ötür, hardadı o fəsli-bahar?
Qəflət etmə, nəfəsin varsa, qənimət bil onu,
Bu şamın qəsdinə durmuş nə qədər düşməni var.
Qəfəsə mənlə gəlibdir ürəyimdə bu tikan,
Mən çıxartmam oradan, çünki ürək verdi qərar.
Yatdıq əfsanə ilə, indi ağırdır yuxumuz,
Ruzigarın hayına kim oyanar, olsa xumar?
Saib, o yerdə ki, hər şey gülə dönmüşdü tamam,
Daha nə fərqi səni harda oturdar o nigar?

* * *

Fələyə çatmaz əli kim xaki-payın olmamış,
Düşəcək torpağa ol kəs ki, harayın olmamış.
Sənə verdi yerini, məclisi tərk eylədi ki,
Hamıya sənsən əvəz, bir kimsə tayın olmamış.
Bir böyük ayna elə qəlbini, hər gün ona bax,
Nə belə aynan olubdur, nə sarayın olmamış.
Mövləvi yazdığı o şerə cavabdır bu qəzəl,
Sən nə gövhərsən axı Kəsrada tayın olmamış?!

* * *

Kim tutarsa ətəyindən, olacaqdır əsirin,
Kim dolansa başına, məst edəcəkdir ətrin.
Bir dilənçi kimi alsan əlinə yolda əsa,
Yenə dövlət sarayında əbədi vardı yerin.
Qəribə mərhəmət etmək sənə olmuşdu peşə,
Qəribəm, saxla qapında, olaram mən nökərin.
Sadəlövh qəlbimizin aynası əks etmək üçün,
Bu cahanda səni seçmişdi, məgər yox xəbərin?
Dostlar ilə oturubdur, gözümün nuru mənim,
Düşmənə vermə könül, artırar hər gün kədərin.
Sındırar minlər ilə dağçapan öz tişəsini,
Hansı bütxanəyə bir anlığa düşsə güzərin.

Hədəf olsa oxuna, sinə dönüb şan-şan olar,
Hər tikan bir ox olar, səhraya salsan nəzərin.
O həyat çeşməsinə kimsədə meyl olmaz, inan,
Saib, hər təşnələbə çatsa əgər bir əsərin.

* * *

Səhraya saldı bizi Leyli edib məftun, yetər,
Görsə ceyran ləprini yarpaqda çün Məcnun, yetər.
Bir də bu dünya yetirməz Yusifə tay hüsnüdə,
Ta bu dünya var, bizi məst etsə bu əfsun, yetər.
Ey ilahi, eylədin ilk gündən aydın qəlbimi,
Surəti tapdın, daha fikr eyləmə məzmun, yetər.
Kim çox içsə mey, ona, əlbəttə, ev darlıq edər,
Su ilə gildən düzəltsə bir küp Əflatun, yetər.
Bağlayarsa dağlar meyxanəni, qəm çəkmərəm,
Məst olan aşiqlərə bir cüt ləbi-gülgün yetər.
Sərv bilmir, qumrunu hey danlayır bica yerə,
Bir yaşıl yarpaqla şad olmuş əgər məhzun, yetər.
Bu gülüstanda susuzluqdan daha gül qalmadı,
Bəs deyilmi boş yerə axıb gedir Karun, yetər.
Bunca sən, ey asiman, bəsdir xəsislik etdiyin,
Təşnə olmuş ləblərə bircə ovuc Ceyhun yetər.
Qan olar, Saib, əlində tutduğun ol gül şərab,
Sən olan məclisdə bircə naxələf olsun, yetər.

* * *

Gizlin, nəyə lazım, edəsən yara məhəbbət?
Eşq olsa, o nə səd biləcəkdir, nə də sərhəd.
Qəlbən alışıb yanmasa kim, təşnələb olmaz,
Arif sevər o hüsnü, ola onda həqiqət.
Yarın səni cəlb etməsə hüsnü, üzə vurma,
Xəttü xalına salma nəzər, gözlə ləyaqət.
Su səpsən oda, atəşi öncə göyə qalxar,
Olmaz xəsisə təsiri, sən söylə yüz hikmət.
Şamdır yuxusuz gözlərimə göydəki ulduz,
Göz yaşı içər mey yerinə, kim çəkə həsrət.



Qəlbi bu əcəmzadələrə olsa da mayil,
Əslində ərəbdir babası Leylinin, əlbət.
Gəl söyləmə var böylə qəzəl xacədə, Saib,
Səndən ötürü yüksək olar çünki bu qiymət.

* * *

Bu könül get-gedə o ləl-ləbin rənginə düşdü, düşdü,
Kuzə öz ixtiyarın verdi, meyin çənginə düşdü, düşdü.
Saldı gül rənginə o xəncəri bu qanlı yaram, qanlı yaram,
Dəyişib görkəmi gövhər o suyun cənginə düşdü, düşdü.
Bil, qiyamət səhəri rəngini o meydən alar, meydən alar,
Ləbinin rəngi əgər bir də meyi-gülgünə düşdü, düşdü.
Gövhər ol yarın eşitcək xəbərin oldu xəcil, oldu xəcil,
Bu səbəb oldu ki, o getdi, sədəf mülkünə düşdü, düşdü.
Elə zənn eyləmə, mey içdim, o, nuş oldu mənə, oldu mənə,
Bir kədər boğdu məni, qəlbim evi pis günə düşdü, düşdü.
Günəşə açdı gözün, baxdı o şəbnəm kimi heyran, heyran,
Qanad açdı sinəmin üstə o gövhər, yenə düşdü, düşdü.
Qaldırar bəzən əlin xalq eləyir ömrə dua, ömrə dua,
Kuzəyə fərqi nədir, ömrə-günə indi nə düşdü, düşdü.
Əlini üzsün həyatdan düşə kim eşq oduna, eşq oduna,
Çox çətindir ki, yaxan eşqin əgər çənginə düşdü, düşdü.
Hər uşaq barmağını sormaq ilə yatsa nə yaxşı, Saib,
Vay o gündən davakar dayənin o əngine düşdü, düşdü.

* * *

Narahat beynimdir axır başımı salmış şərə,
Kim bu meydən içdi, gördüm, döndü o, dərbədərə.
Ümmanam, qalxar şaxə sinəmdə hər gün dalğalar,
Gör neçə dərya sığışmış köksümə birdən-birə.
Çiynimin alsa yükün bir gün fələk öz çiyninə,
Siqlətindən dərdimin göylər qoyar başın yerə.
Məst edib bu mey məni, çiynimdədir ancaq kuzə,
Çün Bədəxşanda onu doldurmuşam mən son kərə.
Düşmənin odlu dili qəlbim içində yatsa da,

Susmuşam, xəncər kimi qeyzim də dönmüş əxtərə.
Məst olan vaxtı başımda cəm olur huşum mənim,
Bir şərab dəryası istər qəlbimə ilham verə.
Saibəm, təbim rəvandır, çağlayır çaylar kimi,
Neyləyim kim, bu halım bəlli deyil hər dilbərə.

* * *

Nə zaman xəncərini taxdı fələklər belinə,
Dan yeri al günəşin camını aldı əlinə.
Məst olan kəslərə çün bircə işarə bəs edər,
Bəs edər bircə piyalə bu bağın bülbülünə.
Kim bizim tövbəni sındırdısa bir kəlmə ilə,
Qoydu düz sözləri o qəlbi sınığın dilinə.
Olma bu piri-xərabatdan uzaq bir an da,
Ox kimi kim uzağa uçsa, düşər yad elinə.
Necə dözsün, bu sınıq kuzəni mən saxlamışam,
Fələyin şişəsini sındıran o mey selinə.
Bir günün işrəti də bəsdi, qənimət bil onu,
Bu hənanı yaxır hər gün birisi öz telinə.
Daş ilə şişə ki, düşməndi nə vaxtdan bəridir,
Bil ki, hər bir muradın çıxmaz ürək sahilinə.
Gözünü dikmə bu dünya sənə nemət verəcək,
Heç apardınmı təam kor adamın mənzilinə?
Dilbərin gözləri üstündə duran qaş kimidir,
İki şah misra qoyulmuş qəzəlin övzülünə.
Hər kəsin qəlbi bu gülşəndə təmizdir, Saib,
Şeh kimi çatmış əli indi günəşin əlinə.

* * *

Şişəmə yar tökməsə, gülgün şərabı neylərəm?!
Ay camalım verməsə, hər gün əzabı neylərəm?!
Mahitab ruh oxşayır, şamdan yaxındır qəlbimə,
Öz çırağım var, daha mən afitabı neylərəm?
Şəbbunun ətri məni indi ayıldıb xabdan,
Reyhanın ətri yenə qaytarsa, xabı neylərəm?



Məstəm, amma heç kəsə etməm əzab tufan kimi,
Dalğayam dəryada mən, söylə, hübabı neylərəm?
Çox zaman sübhün yaxasın ilk dəfə mən açmışam,
Bəs bu halətlə özüm indi niqabı neylərəm?
Qəm yeməm ki, asiman atmış gəmim sahillərə,
Üzmüşəm qumda balıq tək, indi abı neylərəm?
Bir xəta iş görməyə yol verməmiş ağlım mənə,
Saibəm, mən etməsəm xalqa savabı, neylərəm?

* * *

Arx kənarında hər ot neştərdir,
Zəhəri yoxdu onun, şəkkərdir.
Gözü yumma ki, könül pərdələnər,
Ağzını yum ki, daha behtərdir.
O gülən gözlərin də mənası var,
Göz badamdır, gülüş də şəkkərdir.
Meyi iç, bir də nəğməyə qulaq as,
Qalanı boş, gərəksiz işlərdir.
Tükü dəlmək hünər deyil əsla,
Eybini kim görürsə, rəhbərdir.
Qəvvasın gözlərində nuram mən,
İçdiyim çeşmə deyil, gövhərdir.
Biz yer üstündə zəif bəndələrik,
Bəxtimiz şöləsi yox əxtərdir.
Nə gözəl nemət imiş azadlıq,
O, gözəllikdə sərvə bənzərdir.
Çün buluddan qopardı öz qələmin,
Saibin hər kəlamı gövhərdir.

* * *

Hər kimin fikri qəvi oldu, o, hikmət tapdı,
Kim ki, söykəndi qara torpağa, qüvvət tapdı.
Kölgədə gəzmədi hər kəs, əbədi oldu həyat,
Kim məhəbbətlə qapı açdı, o, hörmət tapdı.
Gözünü aç ki, təlatümlü dənizdir bu cahan,
Kim ki, yumdu gözünü, dəhridə zillət tapdı.

Hindi tərif edirəm, özgə xəyal eyləməyin,
Burda söz incilərim yaxşıca şöhrət tapdı.
Çün peşimanlıq odu sinəmə dağ basdı mənim,
Saib axtardığını lalədə, əlbət, tapdı.

* * *

O təbəssümlü dodaqdan ki, xəbər yoxdu hələ,
Həsrət ilə alışıb yandı cigər, yoxdu hələ.
Faydası yoxdu hübab sahilə dikmiş gözünü,
Bu dənizdən qayıdan bircə nəfər yoxdu hələ.
Niyə bel bağlayasan sən bu havavu həvəsə,
Şam yanıb oldu yarı, amma səmər yoxdu hələ.
Sən yara qəlbini açmaq diləsən, qorxmadan aç,
Ona kim namə yazar, qəmli dönər, yoxdu hələ.
Hünərin var, o qara gözlülərin ardına düş,
Bu səfərtək görəcəksən ki, səfər yoxdu hələ.
Sübh gəlcək gecənin saçlarını qayçılayar,
Çox şükür ki, mən üçün böylə səhər yoxdu hələ.
Ürəyi yanmaz onun seltək axan göz yaşıma,
Yar özü göz yaşı tökmüş bu qədər, yoxdu hələ.
Toxum ovcundadı, o torpağa dikmiş gözünü,
Söyləyir ki, bu toxumdan da əsər yoxdu hələ?
Nəyə lazım deyəsən ki, bu onun öz evidir,
Bura qəmdən savayı özgə gələr? Yoxdu hələ.
Biz ki azadələrik, tənə nə lazımdı bizə,
Daşı vurma ağaca, sanma zərər yoxdu hələ.
Ləbləri öpmək ürəkdən gələn arzundu əgər,
Demə, atəşsiz o yaqutda xətər yoxdu hələ.
Saibin fikri əgər ki, fələyin çərxin ötüb,
Fikrini şerə verib, özgə nəzər yoxdu hələ.

* * *

Ümidim incələrək dönmüş o bayram ayına,
Bir açar yoxdu düşə çünki bu ümmid yayına.
Həvəsim yox mənim azadlığa, ya bəndəliyə,
Dedilər ki, söyüdün meyvəsi düşdü payına.



Mənsurun mövqeyinə çatdı yüzündən birisi,
Lalələr, söylə, bərabərmi şəhidlər sayına?
Nə zaman zövq ilə çırpındı sinəmdə ürəyim,
Qoymaram bir də onu qəmlə, kədərlə boyana.
Elə pəjmürdəhalam, yox ümidim mən ucalam,
Xəzan olmuş çəmənin kim qalacaqdır hayına?
Şükr elə, Saib, hələ dostların hərdən yad edir,
Vay o gündən düşəsən sən də o qəflət çayına!

* * *

Çox gəzib axır onu tapdım yenə qəlbimdə mən,
Gör mən harda gəzmişəm, harda itibmiş o vətən.
Biz əbəs dərya üzündə sinəni yandırmışıq,
Sən demə, sahildə imiş dəryalarda biz gəzən.
Ayrılıqdan nalə çəkdim keçdiyim yollar boyu,
Fikr edirdim, bu səsi canan eşitmir bəs nədən.
Qəlbimin istəklisin mən göylər altda gəzmişəm,
Sən demə, tərk eyləmiş bu məclisi nazikbədən.
Qəlbimin tutdum yarasın, dünya döndü zülmətə,
Parçalanmış qəlbim imiş bu cahana nur verən.
Dünyanın hər möhnətindən qurtarasan, bəlkə də,
Kəbənin ol şah yolunda züvvara döndükdə sən.
O nigarın gözləri almışdır əqlü dinimi,
Meypərəstlikdən axır, Saib, nələr çəkdi bu tən.

* * *

Ölüm ilə aramız bircə nəfəs, çoxmu qalıb?
Sel gəlir, himmət elə, qarşını kəs, çoxmu qalıb?
Vaxt çatıb, ayrılaraq tərk eləyir ruh bədəni,
Düşəcək dam qırağından bu qəfəs, çoxmu qalıb?
Bir payız yarpağıtək gör necə də soldu ömür,
Başqa bir fikrə daha düşmə əbəs, çoxmu qalıb?
Bu qədər nalə edibsən, əsəri oldu ona?
Hələ o odlu həvəs bitmədi, bəs çoxmu qalıb?
Hanı Xosrov, hanı Fərhad, hanı Şirin, de görək!

Hanı o odlu məhəbbət, o həvəs, çoxmu qalıb?
Hanı şəkkər ləbinin şəhdi, düşür bir də yada,
Onu qarət elədi hansı məgəs,[1] çoxmu qalıb?
Vaxt çatır, ey günəşim, gəl başım üstündə otur,
Qorxuram gəlməyə bir də bu nəfəs, çoxmu qalıb?
Bu geniş göylərin altında qalan kimdi daha?
O Məsiha ilə Saib, iki kəs, çoxmu qalıb?

* * *

O qədər incədi, baxsan, yanağı al qan olar,
Kim ki, bir dəfə görər, gül üzünə heyran olar.
Bir sapand tək daşı yüngülcə alıb fırladar o,
Çox ağırdır yuxusu, kim ki, görər, candan olar.
Asiman göz kimidir, yersə onun boz giləsi,
Dünyanı viran edən bu iki səf müjgan olar.
Dodağı öylə lətifdir ki, o dinməzsə belə,
Görünər hansı kəlamlar orada pünhan olar.
Gül üzündə qara xal yandırar odsuz adamı,
Bəzi də kirpiyinin fitnəsinə qurban olar.
Bu qara torpağın altında neçə ayna yatır,
Çün tamaşaya gələnlər axırı peşman olar.
Çəkə bilmir gözünü Saib o ayüzlərdən,
Dünyadan çəksə əlin, bəlkə, ona asan olar.

* * *

Qönçənin saflağına şahid olan şəbnəmdir,
Məryəmin paklığının aynası da Məryəmdir.
Bir ovuc su səpələr, yatmış olanlar oyanar,
Zülm evin viran edən göz yaşı bir aləmdir.
Uşağa öz atası örnək olar qeyrət ilə,
Bəşərə örnək olan da o qoca Adəmdir.
Minnətə tab eləməz şan-şan olan parə könül,
Çün könül yarasına öz qanı da məlhəmdir.
Özünü nazlı gözəllər kimi bu bağda öyən

[1] Məgəs – milçək.



O, gülün dizləri üstə oturan şəbnəmdir.
Baharın növrağı çox tez dağılar, var səbəbi,
Şah Süleymandan üzün tez çevirən hatəmdir.
Arif insan bu cahanda daha yüksək ad alıb,
Saibə, bəlkə də, hatəm deməyin çox kəmdir.

* * *

De görüm, məskən olub Kəbə, ya bütxanə sənə?
Ey evi bərbad olan, hardadı bəs xanə sənə?
Nə qədər çox ola yer mehrini artırmayacaq,
*Yaxşı bax, aydın ola Kəbə və bütxanə sənə.*
Yaxanı cırmasan, arxanca uşaqlar qaçmaz,
Qışqırıb söyləməz onlar axı divanə sənə.
Eşqə təklif eləmirlər ki, buyur, gəl ürəyə,
Sel də elan eləmir, gəldim, a viranə, sənə.
Gülü rəna nədi, o aləmi-vəhdət haradı?
Birdimi qəndil ilə şişə, ya peymanə sənə?
İkilik yox, gözümüzdə bütün aləm birdir,
Fərq edir zünnar ilə təsbehi-səddanə sənə?
Başa sal Saibi, pərvanə o şamda nə görüb,
Sən ona bənzəmisən, yoxsa o pərvanə sənə?!

* * *

Fələyin çərxi hələ dövrə vurar,
Başımız üstə onun aynası var.
Hədəfə layiq o sakit sinədir,
Ən uca zirvə isə zirveyi-dar.
Göy otun bəxtinə bax, tapdalanır,
Tikan isə divarın üstə durar.
Səhərin ağzı qızıl qanla dolu,
Belədir, hər kəs əgər düz danışar.
Etibarsız tanınan insan da
El gözündə qarışqa boyda olar.
İlk daşı əyri qoyublarsa əgər,
Yer ilə yeksan olar onda divar.
Teləni torpaq ilə örtərlər,

Ceyranı ovçular etdikdə şikar.
Sən mülayim deyilsən, ey Saib,
Yoxsa dünya elə həmvar dolanar.

* * *

İnsanı məst eyləyən saçlar, o nemət kimdədir?
Ay camala nur saçan nurlu o surət kimdədir?
Arxası mehraba kimlərdir ibadət eyləyən?
Qaşları qiblə olan o qoynu cənnət kimdədir?
Güllərin açmış yaxasın hər səhər sübhün yeli,
Bəs bu sübhün köynəyin cırmış o qüvvət kimdədir?
Qaşlarından öyrənib əysin belin göydə hilal,
Bir günəşdir gözlərin, de, bunca şöhrət kimdədir?
Aynanın da cövhərin ataş yaxıb zülfün kimi,
Bu günəş üzlü gözəl kimdir, bu cürət kimdədir?
Bayram ayın axtaranlar çün itirmiş başını,
Bəs hilalın gəzdiyi atəş, hərarət kimdədir?
Rişəsi torpaqdadır sərvin, çün adi haldı bu,
Qumru nəzmə çəkdiyi o sərv qamət kimdədir?
Qeyri-mümkündür ürəkdə gizlənə ayla günəş,
Bəs bu sinə, bəs bu ayna, bəs bu vüsət kimdədir?
Asdılar Mənsuru, ancaq o, fənaya getmədi,
Hər kəsə məlumdu, bu güc kimdə, qeyrət kimdədir?
Bu qəzəl, Saib, cavabdır Qafilin o şerinə:
Can boğaza gəldi, hey sordum, o afət kimdədir?

* * *

Mişk ətirli o şəvə saçlar, o nemət ondadır,
Dan yerində nur saçan o lalə surət ondadır.
Zənn edərlər, göylərin köksündədir zümrüd çəmən,
Göylərə naz eyləyən o sərv qamət ondadır.
Gözlərimdən dərbədər salmış o dilbər röyamı,
Çünki dil-dil yüksələn şölə, hərarət ondadır.
Əqlə sən etmə ümid, burda naçardır əql özü,
Dərdə dərman o hilal qaşlar da, əlbət, ondadır.
Bu sınıq qəlbimdə hey yarın xəyalı canlanar,



Xəstəyəm, pəjmürdəhalam, bil ki, illət ondadır.
Saib, heç saymaqla bitməz nazlı yarın nazları,
Bir baxışla ovlayar qəlbi, bu xislət ondadır.

* * *

Mey haramdır o zaman, ortada bir hüşyar ola,
Yuxu getməz gözə, evdə birisi bidar ola.
Çün pərişan görərəm aynada mən öz-özümü,
Onu tez sındıraram ya ev ola, bazar ola.
Hər cümə tezdən uşaqlar yığışır, adətdir,
İstərəm qışqıram, ey kaş həmişə bazar[1] ola.
Xızr dərdin soyudur bəzən o gülgün mey ilə,
Kəbə düşməz yada o evdə, əgər azar ola.
Həmişə tər-təzədir cövhəri bəxt aynamızın,
Heç solar, Saib, o ayna, baxanı dilbər ola?

* * *

Xatirin xoşsa əgər, badə nə lazımdır daha?
Qəlbin aydınsa sənin, səhra nə lazımdır daha?
Sərvəti neylər o kəs ki, ürəyi varlı ola,
Etiqadın yoxdusa, dünya nə lazımdır daha?
Bağı seyr eyləyər insan ki, onun könlün aça,
Nə zaman xoşdu ürək, onda nə lazımdır daha?
Sənə mən etibar etdim evimin sərvətini,
Xəlvəti girmək ora amma nə lazımdır daha?
Göz ki, dostlar üzünə baxmaq üçün lazım olur,
Yəqubun yoxdu gözü, olsa, nə lazımdır daha?
Buludun yelkənə yox ehtiyacı, göydə üzər,
Aşiqə yarı gərək, başqa nə lazımdır daha?
Dağ əgər ləl yetirə, qırmızı lalə nə gərək,
Bir adam ölmüş ola, xülya nə lazımdır daha?
Sabahın dərdi bu gündən çox olar, şübhəsi yox,
Bu günün dərdini çək, sonra nə lazımdır daha?
Xəncərin əks eləyir halımı aydın su kimi,

[1] Bazar – həftənin günü.

Ərzi-hal eyləməyə ayna nə lazımdır daha?
Saibi məşğul edib eşqi bu ay üzlülərin,
Bu camal təşnəsinə dərya nə lazımdır daha?

* * *

Bu həyat çeşməsi o gül üzünün şəbnəmidir,
Zülfünün ətri yayılmış, elə ənbər kimidir.
O xumargöz bizi meydən də betər məst eləyər,
Bir gözəl çöhrə də bir bağça çiçək aləmidir.
Alnının xətlərini yaxşı bilir xətt oxuyan,
Hər qırış ömrün itən illərinin bir şəmidir.
Nöqtədirmi ağ üzündə düzülən qara xalın?
Yox, o ki, ətir saçır, canımızın məlhəmidir.
Əlinə, çöhrənə hər dəm toxunan sübh yeli
Ümidin yelkənidir, arzum isə bir gəmidir.
Saçının bir ucu birçəkdə gəlib halqalanar,
Halqanın hər biri zülfündə bir aşiq qəmidir.
Bu həyat çay tək axır, öylə ki, qəddin əyilər,
Bu təzə ömrün üçün körpüyə dönmək dəmidir.
Saib, ol gül yaxasında görünən düymə deyil,
Bülbülün şölə çəkən cəh-cəhidir, ya bəmidir.

* * *

Əql bir körpə fidandır ki, xəzan qəmdir ona,
Eşq bir sərvidi, güllər hamı həmdəmdir ona.
Hər kəs öz əsli ilə daxil olur meydana, bil,
Kimə xoş keçsə, o, dövran sürəcək, dəmdir ona.
Dünyanın dərdi nədir, qəm elə eşqin qəmidir,
Hər qəmi çəkməz aşiq, eşqin özü qəmdir ona.
Eşqə düşmüş ürəyə vəsl ilə dərman nə gərək?
Kim məhərrəmdə tutar bayramı, matəmdir ona.
Kim açıq gözlə baxar dünyaya, dövran sürər o,
Bu həyat nəşə dolu, bal kimi aləmdir ona.
Hüsnümün aynasıdır əks eləyən hər nəzəri,
Gül gülən üz kimidir, ayna da şəbnəmdir ona.
Hər kimin qəlbi ilişmişdi o zülfün toruna,
Ömrünə nəşə verər, çünki bu məlhəmdir ona.



Kim yumub ağzını sakit çəkilə bir tərəfə,
Bu susub durması bir dövləti-hatəmdir ona.
Saib, hər qəlb ki, paxıllıq oduna yandı, inan,
Düşsə cənnət bağına, bil ki, cəhənnəmdir ona.

* * *

Dostluğun möhkəmliyi ilqardadır, peymandadır,
Dövranın zülmün nə bilsin, ta toxum xırmandadır.
Mehribanlıq eylə sən namehriban insanlara,
Yusif olmaq bir dözümdə, bir də ki, imkandadır.
Hər kəsin əqli çox olsa, çox olar sinə dağı,
Ev çıraqla nurlanar, əsli səbəb də bundadır.
Arzularla çırpınan qəlb eşqə minnətdar olar,
Sap kimi incəlmisənsə, eşq odu, bil, candadır.
Kim gülün ətrin sevirsə, əllərin vurmaz gülə,
Yusifin də köynəyi o gül kimi meydandadır.
Kim yumar, söylə, gözün meyxanada məst olsa da,
Kuzə bir yanda durur, mey camı da bir yandadır.
Arpaya eylər əsər, Saib, bulağın saf suyu,
Qəlbi nazik kəslərin həssaslığı çün qandadır.

* * *

Olub ol qara saçın, gör, necə heyranı odun,
Hindliyə məskən olubdur həmişə yanı odun.
Kim gözün alsa bulağın, suyu rahat axacaq,
Verdi pərvanəyə can çeşməyi-heyvanı odun.
Laləni tilsimə saldı sənin atəş nəfəsin,
O özü getdi ola, bəlkə də, qurbanı odun.
Çün Süleymana çətir etdi o pərvanə özün,
Canıma lərzə salıbdır yenə tüğyanı odun.
Kababın göz yaşı düşsə, alovu qalxar odun,
Duzlu göz yaşım ilə coşdu çün ümmanı odun.
Qıvrılıb yanmağımız eşqə təzə şölə verir,
Çör-çöp atsan, bəzənər çünki gülüstanı odun.
Biqərarlıq tikana döndü, batır köksümə, bax,
Bürünüb tüstü ilə indi biyabanı odun.
Şölələr tüğyan edib yüksəlir hətta buluda,

Bu gecə kimdi görən yanmağa mehmanı odun?
Əqltək eşq özünə açmadı bir yaxşı dükan,
Mayası çör-çöp idi, olmadı cövlanı odun.
Eşq mənim dəftərimi açdı, mənə verdi həvəs,
Sildi pərvanəni ol dəm daha divani odun.
Qəlbi hifz etmək üçün tarnı yaratmış bədəni,
Gözü hifz etmək üçün güldü nigəhbanı odun.
Sevginin mehri yamandır gözəlin qəhrindən,
Şadlığın artırır hər dəm kababın qanı odun.
Bəndəyik biz ulu eşqə, nə ki, çərxi-fələyə,
Gör, möhürləndi mum ilə neçə fərmanı odun.
Saibin söhbəti eşqin odunu şöləledir,
Dükanı bağlanacaq, gəlməsə əfğanı odun.

* * *

Eşq gər örtülüdür, amma yenə məşhurdur,
Hüsn açıq olsa belə, gözlə görünməz nurdur.
Yarım aynaya baxar, baxmaq ilə doymaz, inan,
Aynanın gözlərimi, ya suyu bilməm şordur.
Söz ilə haqqı sübut eyləmək asan da deyil,
Baş qoşa kim bu işə, bil ki, elə Mənsurdur.
Canımı gözləyənin ömrü yetər tez də sona,
Yayı çox tez qırırlar hansı kaman çox zordur.
Hər qarış torpağı qanla boyayıb çərxi-fələk,
Torpağın qəlbinədək qazsan əgər, hey gordur.
Saibin şövqü gəlibdir, yenə də şeir yazır,
Təzə sözlər deməyə sanki o da məmurdur.

* * *

Arif nəzərində bu kiçik lanə[1] böyükdür,
Nadan nə bilir ki, axı divanə böyükdür!
Kim göz yaşıtək sildi gözündən bu cəhanı,
Əhsən o kəsə, hər işi mərdanə, böyükdür.
İçsən nə qədər mey, yenə eşqin qəmi qəmdir,
Kim hövsələsizdir, ona bir danə böyükdür.

[1] Lanə – yuva (Burada: ürək).



Saxlar sədəfin bağrı o su qətrəsin, ancaq
Hərçəndi ki, ol gövhəri-yekdanə böyükdür.
Hər zərrə bir aləmdi çün arif nəzərində,
Hər qətrəyə məskənsə bu meyxanə, böyükdür.
Peymanədə qan verdi sənə saqiyi-dövran,
Çox fəxr eləyib içmə ki, bu xanə böyükdür.
Hər kəs yerini tutsa, daha xırda sayılmaz,
Bayquşsa əgər sahibi-viranə, böyükdür.
Aşsan fələyi, orda pərişan olacaqsan,
Bir özgədir o aləm, o əfsanə böyükdür.
Bütxanəyə, ya Kəbəyə Saib gedər olsa,
Həm dost deyəcək, həm də ki, biganə, böyükdür.

* * *

Zülfünün hər teli axır məni saldı əzaba,
Bu qəmim xət-xət olub döndü axırda kitaba.
Ürəyin dərdini gülmək ilə qovmaq olmaz,
Gülməyin əcri budur, gül dönür axır gülaba.
Sinəmin atəşi pünhandadı, görmür heç kim,
Tüstüsüz, odsuz alışdı daha döndü kababa.
Kəsilib səbri-qərarım, qəmim indi min olub,
Dalğa dalğaya qovuşsa, daha gəlməz hesaba.
Mən üçün fərqi nədir, qətrə ya da ümman ola,
Söndürüb atəşimi, çatmadı heç kəs savaba.
Saibin yüz qapı açdı üzünə bəxti əgər,
Bir qapı açmadı o, qəlbi düşə iztiraba.

* * *

Yatmağa meyl eləyir ol göz ki, giryan olmayır,
Nəfsinə quldur o kəs ki, qəlbi nalan olmayır.
Əbədi ömr qazanmaq istəsən, keç ömrüdən,
Əbədi ad-san qazanmaq, bil ki, asan olmayır.
İşlərim müşgül olubdur, təqsir öz əqlimdədir,
Püstəni sındırmayınca ağzı xəndan olmayır.
Mərhəmətlə, rəhm ilə işlər yetəndə hasilə,
Mərhəmətsiz qardaş heç bundan peşiman olmayır.

Söz demə dünya işindən ölüyə, bilməz onu,
Qızmasa təndir çöräklər orda büryan olmayır.
Günəşə naz eyləyər ol gün ki, bədr oldu hilal,
Ay üçün göylərdə hər dəm böylə meydan olmayır.
Sıxdı zindantək məni həsrət də, qəm də doğrusu,
Ayrılıqdan kimlərin qəlbi pərişan olmayır?
Bu qoca vaxtımda düşdüm mən də sərvət eşqinə,
Bilmədim, hər qocalan kəs də Süleyman olmayır.
Saibə xoşdur bu səhrada qala tək, tənha o,
Çünki bu səhrada bir ahu da mehman olmayır.

* * *

Biz olardan deyilik, dillə əyan axtarasan,
Ya da heç tapmayasan, nami-nişan axtarasan.
Ürək əhlin sən ürəkdə, nəzər əhlin gözdə,
Dildə dostluq edəni dildə hər an axtarasan.
Sevgi bir zərrədə gizlənməz, ona şübhən var?
Nəyə vardırsa əgər səndə güman, axtarasan.
Bir nişan olmadan heç kəs çata bilməz hədəfə,
Kəbəyə çatmaq üçün yolda nişan axtarasan.
Hər sədəfdə gövhəri, ya da çəmənlikdə gülü,
Ya xərabat piritək bəxticavan axatarasan.
Arzu etməklə işıqlanmaz otaq, yoxsa baca,
Nigaran qəlb olacaq gözdə əyan, axtarasan.
O duyan qəlbə əsərsiz qala bilməz naləm,
Atmaq üçün oxunu öncə kaman axtarasan.
Bunu Saib o Seyid Yəzdiyə yazmışdı cavab,
Arif aşiqlər olur qəlbdə nihan, axtarasan.

* * *

O qədər heyran olub indi o dildar özünə,
Baxsa da aynaya, o qalmış intizar özünə.
Hər ürək nazik ola, zərrə ona dağ salacaq,
Necə ki, lalə salıb yüz belə dağlar özünə.
Bu gözü qanlı adamlar hər ovu ovladılar,
Meşədə səyyad olub indi hər şikar özünə.



O dodaqdan od alıb düşdü şamın qəlbi oda,
Necə ki, təşnə dodaq olmuş abidar özünə.
Nə gözəldir ki, tamaşayla tapa hər kəs özün,
Çünki hər hüsnün özü pərdədi aşkar özünə.
Bu gözəl bağçada hər sünbülə kim salsa nəzər,
Sanki bir şanədi hər zülfdə gəzir yar özünə.
Nə şikayət yeridir, Saib, edirsən fələyə?
Hansı məclisdə alıb badə ixtiyar özünə?!

* * *

Nə qədər çox ola şadlıq, yenə qəm kamil olar,
Bir kəsin xərci gəlirdən çox ola, aqil olar?
Dövranın qəlbi kədərlənmədi göz yaşımıza,
Çürümüş toxmu əkib gözləmə ki, hasil olar.
Ona aşiq deyərəm, eşqi üçün dara gedə,
Dəyməmiş meyvə düşərsə, yeməyə qabil olar?
Zülfünün həlqəsi bu qəlbimi yandırdı mənim,
Kim tamaşaya dura, qırpsa gözün, qafil olar.
Könlünün arzusu birdir sənin heyranlarının,
Gör, o zülfündə neçə aşiq üçün mənzil olar?
Göz önündən bu həyat girdabı qalxarsa əgər,
Bu yolun yolçuları məqsədinə nail olar.
Yedi qəlbin qanını hər söz üçün Saib də,
Parçalanmazsa ürək, gözləmə söz hasil olar.

* * *

Qoysa əvvəl kərpici torpağa bir memar kəc,
Asimana dəysə də, axır olar divar kəc.
Bir qapağa bənzəyər, sanki qoyubsan boş qaba,
Çün beyinsiz bir başa qoysan əgər dəstar[1] kəc.
Aciz eylər hər kəsi, bir dar cığırla getsə o,
Vay o gündəndir yolun olsun uzaq, həm dar, kəc.
İnsana nöqsan olar, ötsə xəsislik həddini,
Toxunar tez çör-çöpə, olsa əgər paltar kəc.

[1] Dəstar – əmmamə, çalma.

Bir mədar vardır, ona tabedi cümlə kainat,
Eyb tutma, gər cıza öz xəttini pərgar kəc.
Çün təvazölə azalmaz rütbəsi heç bir kəsin,
Kəcdi şəmşir, heç zaman etməz onu, bil, xar kəc.
Əyridir həm dimdiyi, həm caynağı vəhşi quşun,
Əyri eylər insanı çün tutduğu hər kar kəc.
Düzlük et, Saib, çün əyri işdən olmaz yadigar,
Kölgəsi əyri olar, olsa əgər divar kəc.

* * *

O fitnəkar gözləri *kim bimar eyləmişdir*?!
Aldanma ki, bu işdə kələk var eyləmişdir.
Əqiqdə su görünməz, əqiq dodaqlarında,
Təbəssümü o yar da lap naçar eyləmişdir.
Hər kəs baxır cahana öz qəlbinin gözüylə,
Mey məst üçün cahanı bir gülzar eyləmişdir.
Rəftarına olubdur hər kəs özü cavabdeh,
Nə fərqi, məst edibdir, ya huşyar eyləmişdir.
Surətə mayil olma, mənanı axtarıb tap,
Biri çiçək yaratmış, biri xar eyləmişdir.
Vahid saysız deməkdir fələk dəyirmanında,
Fələk korun gözündən sellər car eyləmişdir.
Bu dünya qaşqabaqlı, xallı pələngə bənzər,
Xəsislərsə hər xalı bir dinar eyləmişdir.
Çətin deyil o yol ki, səni çəkər fənaya,
İnsan tək yol gedəndə yol azar eyləmişdir.
O kəs ki, mən onunçün bu dünyanı dolandım,
Saib qəlbində tapıb, onu yar eyləmişdir.

* * *

Sübh o vaxt qəlbə yatır ki, üzü xəndan olsun,
Zülmətin qəlbini yarsın o, nümayan olsun.
Dodağın qoy dodağın üstünə, sakitcə otur,
İstəmirsənsə əgər qəlb evi viran olsun.
O qiyamət səhəri dəryamın ağ dalğasıdır,
Hansı məcnundu bu gün sahibi-fərman olsun?



Yusifin surətinə bənzəri var bəxtimizin,
Ümidim vardı, mənə qardaşım həyan olsun.
O qiyamət odunun dağı kimi cilvələnər,
Eşq sirri hər ürəkdə necə pünhan olsun?
Aləmi-qeybə açıq pəncərə olmuşdur ürək,
Bəlkə, divanəliyim orda firavan olsun.
İnsaf əhli deyərəm xalqa yaxınlıq edənə,
Əsl Kəbə odu, ətrafı biyaban olsun.
Bu qızıl ilə gümüş qəlbini şad etməyəcək,
Nəyə lazım yığasan, sonra da ehsan olsun?!
Buludun göz yaşı nemətdi, fəqət şimşəklər
İstərəm çaxamaya, ta kəndli də nalan olsun.
Bil, qənaət eyləyor süfrədəki nemət ilə
Hər o kəs ki, gözü tox, qayğılı insan olsun.
Hörmət ilə yad olar mərd kişilər ölsə belə,
Əsl insan da odur, qəlbdə mehman olsun.
Hər qarışqa ürəyin şad eləyər bir dən ilə,
O dənin sünbülü qoy taci-Süleyman olsun.
Ney dinən dəmdə məni naləsi hüşdan eləyir,
Şir də istər yer üzü cümlə neystan olsun.
Ürəyi daş olan insan hara, kövrəklik hara?
Sana hər qəlbdə bu ləli-bədaxşan olsun.
Dil danışmazsa, yanar, amma başın salim olar,
Dinmə, qoy dinməməyin başına dərman olsun.
Gülməsən, ağzını yum, çünki bu dünya belədir,
Yeyər öz başını hər püstə ki, xəndan olsun.
Kim görüb şimşək ilə tarlada dərz bağlayalar?
Nə edər mey o kəsə, ömrü pərişan olsun?
Yeri vardır bu qəzəl divanının tacı ola,
Saib, hər kəs oxusa, bir daha heyran olsun.

* * *

Qəlbi kövrək olanın göz yaşı da oldu rəvan,
Bənzəyir bir bulağa qaynaıb axmaqda hər an.
Məclisi-vəslidə məhrəm, ya da naməhrəm olar?

Aramaz mehrabı hər kim hərəmə[1] düşsə, inan.
Uşağa barmağının hər birisi bir mənədir,
Bir uşaqtək sorar öz barmağını heyran olan.
Qocalar gəncliyini yad eləyər həsrət ilə,
Necə ki, yad edirik biz baharı fəsli-xəzan.
Qədd əyildikdə, demək, çatdı səfər vaxtı daha,
Ox uçar çox uzağa, möhkəm əyilmişsə kaman.
Eləmə ömrüdə qəflət gecə söhbətlərinə,
Xoşdu qədr axşamı heç sübhə kimi yatmayasan.
Bir həyat ki, bıçağın dəstəsinə bənd olacaq,
Dilini saxla ki, Saib, hər işin olsun asan.

* * *

Qorxağın axsa qanı, cümlə cahan haya düşər,
San, qiyamət gününün tufanı dəryaya düşər.
Fərhadın qanı çıxıb torpağın üstə qızarar,
Elə bil, lalədən atəş düzə, səhraya düşər.
Günahı yoxdusa, məhbus niyə üzr istəməli?
Yaqubun gözlərinin cürmü Züleyxaya düşər.
Saibin bircə təmmənnası budur ki, nə zaman
Yolu Hinddən Nəcəfə, bir də ki, məvaya[2] düşər.

* * *

Bu səmanın altında kim şadiman olubdur?
Bu bağçanın gülləri nə vaxt xəndan olubdur?
Zəmanənin selindən haray düşüb cahana,
Sel çağlayıb gələndə, hardan aman olubdur?
Bir qəlb ki, coşmayırsa, qəbrə gömülsə, xoşdur,
Qızıl sikkə deyilsə, yerdə nihan olubdur.
Sən incimiş ürəkdən dözüm umma nahaqdan,
Oxa dönəndə hər ah özü rəvan olubdur.
Saralmış çöhrəmizdir sən istəyən o məktub,
Nə söyləyim ki, orda hər şey bəyan olubdur.

[1] Hərəm – müqəddəs yer.
[2] Məva – yer, məskən.



Sən aşiqin yanından uzaq getmə, amandır,
O gülləri dərələr, yeri meydan olubdur.
Şad olma sən baharın sübh vaxtı gülməyindən,
Vaxtsız gülən o başda beyin haçan olubdur?
Kimə nəzər salırsan bir qönçətək büzüşmüş,
Səhər yeli bu bağda görən haçan olubdur?
Ürək dərdin əlindən solub gedər, ol agah,
Bir yerdə toz görünsə, bil, karvan olubdur.
Acizlərin əlindən tutmaq savab bir işdir,
Özgəsinə sığınmaq hər vaxt asan olubdur.
Minlərlə bülbül ötmüş bu bağçada, bu bağda,
Saib kimi ürəkdən nəğmə qoşan olubdur?!

* * *

Susanda sanma ki, dərdin nihandır,
Bu solğun çöhrəmiz bir tərcümandır.
Çıraqlar sübhədək sönməz o evdə
Ki, dərd orda qonaqdır, mehribandır.
Sümüyə işləyən dərdə əlac yox,
Onu vaxtında kəs, tulla, amandır.
Qalıb al lalənin bağrında dağlar,
Məgər dərdi sağaltmaq çox asandır?
Yenə, Saib, qan ilə doldu qəlbin,
Hamı dərddən sənin dərdin yamandır.

* * *

Meyi tök cama ki, gül soldu daha, lalə gedər,
Bu nə karvandı ki, çöldə elə bil halə gedər.
Yolunu azma bu dünya bəzəyindən ötəri,
Gövhər əvvəl yox olar, sonra uçub jalə gedər.
Gecənin qəlbinə dağ çəkdi səhər şöləsi,
Soyuyar göz yaşı, qəlbdən çəkilib nalə gedər.
Səni görmək həvəsimlə gedir əldən bu ürək,
Şeh necə lalə yanağında dönür xalə, gedər.
Qəlbimin yox qərarı, ta yorulunca ayağım,
Yenə o afətin ardınca düşüb yola gedər.

Ürəyi pak olan insana açır yar üzünü,
Ay da göydən baxaraq yardakı bu hala, gedər.
Bir səhər Saib əgər töksə o göz yaşlarını,
Lalənin al yanağında o qara xal, a gedər.

* * *

O adam ki, fəxr üçün ecdadını yad eyləyər,
Bir sümük tapmış o, it tək könlünü şad eyləyər.
Çün ilahi eşq həqiqi eşq üçün ilk pillədir,
Aşiqə doğru yola getməkdə imdad eyləyər.
Gül elə tutmuş qulağın ki, eşitməz heç nəyi,
Xamlığından bülbül hey bağlarda fəryad eyləyər.
Sanki on illər keçib, sal bir yada öz halını,
Fikr elə, keçmişləri kimlər neçin yad eyləyər?
Eşq ustadlıq edən məktəbdə şagirdlər yəqin
Məşq yazmaqçün qələmdanın da polad eyləyər.
Kim paxılsa, bir paxıllıqdır qazancı dünyada,
Çün kərəm əhli həmişə qullar azad eyləyər.
Sözlə Saib Qaf dağında çox pərilər ovlamış,
Çün belə ov etməyi ən usta səyyad eyləyər.

* * *

Kaş günəş üzlü o yar indi xiridarım ola,
Gövhərəm, bir alanım, yaxşıca bazarım ola.
Gövhər olsam da, həyadan dönürəm çün suya mən,
Su olam, yolda axam, ordan ötən yarım ola.
Çün ağıldandı, bəla sellərinə qərq oluram,
Yoxdu bir kəs ki, mənim evdə pərəstarım ola?
Pozulan ordunun əsgərləri yüz yolla qaçar,
Yoxdu bir qüvvə ki, o, qafiləsalarım ola.
Eşqimin iqbalına bağlamışam taleyimi,
İstəməm ki, daha göylərlə mənim karım ola.
Ovcunu ümman açıb, bənzəyir o, ağ sədəfə,
Qələmim inci tökə, dərya qədər barım ola.
Eşqidə göz yaşıdır, bir də ki, ah, şam sayağı



İstərəm sinəmin üstündə odum, narım[1] ola.
Yuxuda, həm də ayıqlıqda elə qəm çəkirəm,
Saib, olmazmı mənim özgə cürə varım ola?

* * *

O xumar gözlərin hər bir baxanı heyran edər,
De, qiyamətmi qopub, bəs nə üçün meydan edər?
Bu yanan sinəmə rəhm eyləməyir ləli-ləbin,
Onu məşşatə, nədəndir, bu qədər əlvan edər?
Məni göz açmağa qoymaz ürəyin dərdi-qəmi,
Üstəlik fitnə gözün də sinəmi nalan edər.
Çevirə arxasını güzgüyə bir tuti əgər,
O, könülsüz deyilən sözləri heç dastan edər?
Günəşə yüksəli şeh damlası lap gözləmədən,
Düşdüyü aynanın üstən nə qədər imkan edər?
Şir ilə üz-üzə yatsan, bu qədər dərd olmaz,
Onu ki, cövrü cəfasiylə bizə dövran edər.
Ruhlara verdi qida şerimiz hər yerdə bizim,
Necə xoşbəxtdi o kəs, hər işini asan edər.
Bir cavabdır bu qəzəl, Sədi buyurmuş, Saib,
Muzdu ol kəs alacaq ki, işini candan edər.

* * *

Qəm ki məndə qoymayıb can, daha qəmxarlıq nədir?
İndi ki, can yoxdu, bəs, söylə, bu dildarlıq nədir?
Dağ da dözməzdi bu qəmlər mövcuna, mən dözmüşəm,
Bilmirəm ki, sel gələn vaxtda bu xuddarlıq[2] nədir?
Dövranın şəmşiri açmışdır sinəmdə lalələr,
Söylə, bu qalxan, dəbilqə, ya zireh artıq nədir?
Küt olarsa bir qəmə, onda yeyə lazım olur,
Orda ki, kütlük gərəkdir, onda hamarlıq nədir?
Saçına qatran da yaxsan, yoxdur artıq faydası,
Qəlb əgər gənc olmasa, bilməm, siyahkarlıq nədir?
Bir ölü qəlbə nə təsir eyləyər yaxşı, yaman?

[1] Nar – od
[2] Xuddarlıq – özünü kənara çəkmək.

Qəbrə çün girdi bədən, bilməz daha varlıq nədir.
Sel gələndə baxmayır daşdır, kəsəkdir, ya ağac,
Sel üçün yox fərqi, bu düzdür, ya da bağlıq nədir.
Fürsətin varkən boşalt gözdən yaşı, qəlbdən qəmi,
Vaxt keçib getdi daha, etsən də dildarlıq, nədir?
Yarı hiyləylə ram etmək heç zaman mümkün deyil,
Çün tərəf əyyar olarsa, onda əyyarlıq nədir?
Sən cavanlıqda götür, Saib, həyatdan kamını,
Gənclik ömrün yazıdır, yazda bu bikarlıq nədir?

* * *

O xalın göz yaşı içmiş ki, belə tər göyərib?
Ya ona xidmət edib hansı bəxtəvər, göyərib?
Reyhan hardan çənənin üstünə yol tapdı sənin,
Su verib, bəlkə, canından ona gövhər, göyərib?
Qurumuş toxmu şoran torpağa səpmiş çox adam,
Canu dildən ona çün xidmət ediblər, göyərib.
Qəlbini bağlama dünyaya ki, Saib, bu fidan
Ayrı yerdən su içib, sanki bir əxtər göyərib.

* * *

Üzünün atəşi dəysə, su yanar,
Dağ civətək əriyib laxtalanar.
Peşimanlıq suyudur gözdən axan,
Duz dəyəndə yaraya tez sulanar.
Gecələr göz yaşı töksə birisi,
Səhəri müjdəli gözlə oyanar.
Kim atar razılıq üçün qədəmin,
Qəlbinin əmrini o, arxa sanar.
Sel gələndə aparar kol-kosu o,
Əhli-zövqün özünün aləmi var.

* * *

Bu fələk bir kimsədən əsla xəcalət çəkməyib,
Göy üzü heç vaxt tutulmaqdan əziyyət çəkməyib.
Divarın üstündə bitmişdir beli əyri tikan,



Ömrümün sərvi qalıb torpaqda, qamət çəkməyib.
Hökmüdarlıq ləzzətin hardan bilər Misrin şahı?
Bircə gün Yusif kimi ömründə qürbət çəkməyib.
Haq divanı, sən güman etmə, qiyamətdə olur,
Haqq-hasab burda olur, sözdü qiyamət, çəkməyib.
Kim meyi öz qaydasınca içsə, məst olsa belə,
Ya özü, ya özgəsi bundan əziyyət çəkməyib.
Fərhad öldürdü özün eşqində ortaq görcəyin,
Hansı aşiqdir ki, o, eşqində zillət çəkməyib?
Eylə bir əyyamdasan, Saib, səbrli olginan,
Kim səbrli olmuş, o heç vaxt məzəmmət çəkməyib.

* * *

Hüsnün görsə bir aşiq, o gülüstana baxar?
Nərgizə, yasəmənə, laləyə, reyhana baxar?
Əsl məclisə gedərsən, bəzənər söhbət ilə,
Orda kim lal oturar, qüssəli mehmana baxar?
Aşiqin qorxusu yox, ruzi-qiyamət də ola,
O haçan boş sözə, ya əmrə, ya fərmana baxar?
İndi ki, bülbülümüz başqa həvəslə oxuyur,
O daha bir də bu kol-kosluğa, bostana baxar?
Burda söz qeydinə yoxdursa qalan bircə nəfər,
Bil ki, Saib, daha kim sən təki insana baxar?!

* * *

Xalının dövründə zülfün çün nigahbanlıq edər,
Tora düşmüş nə qədər qəlbi o viranlıq edər.
Kirpiyin sanki tikandır, dalayar gül dərəni,
İnci tərlər üzünü təzə gülüstanlıq edər.
Əmrə kim ki, baş əyər, hökmü gərək icra edə,
Yuvada çünki qarışqa da Süleymanlıq edər.
Hər qonaqlıqda bu şərtdir ki, gözəl nemət ola,
Sadədil insana yoxsa hamı mehmanlıq edər?
Qədd əyilmişsə əgər, ömr yetişmişdi sona,
Kim qıyar ki, bu atı bir daha meydanlıq edər?
Davudun nəğmələri pərdədə qalmışdı daha,
Orda ki, Saib oxur şeri, qəzəlxanlıq edər.

* * *

Bir ürək ki, şad ola, dərdi də olsa, kəm olar,
O ürək nalə edər, dağ qədər onda qəm olar.
Dünyanın şadlığına sən dəxi aldanma nahaq,
Kim ki, aldandı, onun qisməti çün matəm olar.
Sinəmin yarasına məlhəmini qoyma hədər,
Qəfəsin gözlərini örtmək üçün məlhəm olar?
Gülmə sən dan yeritək dünyaya, aldanma ona,
Gülüşün ömrü bu dünyada fəqət bir dəm olar.
Qədəmin qoyma kənar, həlqeyi-ülfətdə dolan,
Kim bu ülfətdə qala, Saib, axır hatəm olar.

* * *

Kim ola guşənişin, göylə o, həmsöhbət olar,
Fikri göylərdə gəzən qəlbi dolu həsrət olar.
Bacadan nur görünər evdə əgər yansa çıraq,
Qəlbi aydın olanın varlığı bir hikmət olar,
Açsa hər qətrəmiz ağzın, nə qədər dür tökülər,
Hansı dəryada onu bəsləməyə vüsət olar?
Tutitək dil açar hər yarpağı qəlbin bağının,
Hər budağında neçə aynasifət nemət olar.
Kim onun surətinə baxsa, gözü qanla dolar,
Günəşə baxmağa ulduzda məgər cürət olar?
Qəlbinin qanını içsə çoxu illərlə yenə,
Mövləvi səbki fəqət Saibə tək qismət olar!

* * *

İsti göz yaşın axar səf-səf, o müjgan incir,
Ayağın olsa qabar, xari-muğilan incir,
Hir kiçik dürrə sədəf qoynun açar bir anatək,
Bəs nədəndir ki, sıxar Yusifi zindan, incir?
Aynaya cövhəri çəksən, qaralar qəlbi onun,
Kirpiyi kölgə salar, yar üzü bundan incir.
Yuxulu gözlərini yüz gözə verməm mən, inan,
Nə edib qəlbimə o nərgizi-məstan, incir?



Qayçı ot üstə açar ağzını hey qəh-qəh ilə,
Püstə ağzın açaraq olmasa xəndan, incir?
Kim giley eyləyərək danlasa bəxt ulduzunu,
Sanki dəryada batır, amma yağışdan incir,
Yaxşı dərman budu ki, dərdə boyun əyməyəsən,
Dərd əgər əysə səni, onda da dərman incir.
Çürümüş toxmu şoran torpağa əkməz dehqan,
Torpağın qəlbi yanar, sonra da dehqan incir.
Sən acı söz də desən, incimərəm ömrümdə,
De, şəkər versə qarışqaya bir insan, incir?
Heyrət ilə baxıram yarın ala gözlərinə,
Çünki Saib o gülə olmasa heyran, incir.

* * *

Fitnəsindən o xumar gözlülərin eylə həzər,
Fitnəkar insan əlindən həmişə fitnə gələr.
Məzaci-eşqi edib körpü sən öz eşqin üçün,
Bu bahar selləritək körpüdən et sonra güzər.
Sel çox istər ki, o da aynaya bənzətsin özün,
Yaxşıya bənzəmək axır adamı yaxşı edər.
Sıyrılıb dursa başın üstə şəhadət qəməsi,
Əymə sən başını, çün boynunu acizlər əyər.
Yumuşaq torpaq ilə ovçular örtər tələni,
Yumuşaq sanma sən öz düşmənini, gözlə xətər.
Gündüzün ömrü gödəkdirsə, yarı böl gecəni,
Gündüzün ömrünə qat, qoyma gedə günlər hədər.
Kişi ol, yum bu cahanın malına gözlərini,
Arzuya çatmağa, Saib, çalışır mərd kişilər.

* * *

Arifin sözləri divanələrə etməz əsər,
Necə divanədi o, qaçmasa səhraya əgər?
Qocalıb çərxi-fələk, çox şeyi tez-tez unudur,
Heç unutmur ki, yetirsin bizə hey təzə xətər.
Bu qılınc zərbəsinə dözməyimi eşqə yazın,
Yaramı sanma ki, yüngüldü, qanım axmır əgər.
Qəlbimi nöqtə kimi qəmlər alıbdır araya,

Çevrənin mərkəzini arif olan harda gəzər?
Hay-harayla kim uçurda bilər Ünqa quşunu?
Nadanın atdığı daş Məcnuna dəysə, nə edər?
Daha çox qıvrılar, hər vaxt yuxuya getsə ilan,
Harunu narahat etmir nə xəzinə, nə də zər.
Özünü dərk edə bilməz hər o kəs, qafil ola,
Hər kimin yatsa ayağı, o necə yol yeriyər?
Yarının zülfünə bağlanmış o dərdlər, Saib,
Bir şikəst körpədi, göz qoy ki, fəraq paymal edər.

* * *

İmkanın vardısa, nadan ilə söhbət eləmə,
Söz ki, bir ayinədir, sən onu zülmət eləmə.
Bu bağın qönçəsinin al dodağı qandı tamam,
Nə işin olsa, açıq gör, onu xəlvət eləmə.
Başda zərrin tacı, hey ömrü boyu ağladı şam,
Sərvətə etmə tamah, zərdədi zillət, eləmə.
Gəmi boş olsa, onu dalğalar hey oynadacaq,
Qəm ilə dolsa sinən, sən buna xiffət eləmə.
Gözünün küncünə düşmüş o xalın fitnəsi var,
Ehtiyat eylə, ona çox da məhəbbət eləmə.
Tükü-tükdən seçən o Saibə bax, dərsini al,
Zünnarı vermə əlindən, daha qəflət eləmə.

* * *

Hər adam ki, kişitək eybini söylər üzünə,
Öp onun gözlərini, həq ver onun sən sözünə.
Yaxasın verməz o, əlbəttə, qəmin pəncəsinə,
Bir adam ki, gecəni qatmış ola gündüzünə.
Sahibi-xırman olubdur o adam dünyada,
Səpib öz göz yaşını buğda kimi yer üzünə.
O kəs hörmətlidi ki, milçəyi də incitməz,
Dünyanın varı-yoxu gəlməyir əsla gözünə.
Sən çalış yaxşılığın toxumunu ək torpaqda,
Kim nə əkmişsə, axır qismət olur da özünə.
O hilal Saibə bənzər, necə əymiş belini,
Başını qoymuş üfüqdə bu səmanın dizinə.



* * *

Mən kiməm ki, meyl edib alsın bazardan yar məni?
Çünki qiymətdən salıbdır indi bu bazar məni.
Gövhər olsam da, həyadan dönmüşəm qətrə suya,
Yarımın kuyində torpaqdan tapar əğyar məni.
Mən ki əqlin babətində xanəmi verdim selə,
Hümmət eylər, kim bu qəmdən hifz edib saxlar məni.
Məğlub olmuş bir qoşuntək yüz yerə ayrılmışam,
Hanı ardıyca çəkən bir qəhrəman salar məni?
İstədim bu dünyanın nazın çəkəm Saib kimi,
İstəyir o eyləsin ömrüm boyu ağlar məni.

* * *

Lütf ilə bir bizi saysan, nə olar?
Məni məndən də ayırsan, nə olar?
Xaraba yerdə cavahir tapılar,
Qədəmin kuyimə qoysan, nə olar?
Ümidim var bir-iki busə alım,
Bunları sayma, ya saysan, nə olar?
Yalvarıb vədəni aldım mən axır,
Gəl elə lütf ilə ehsan, nə olar?
Göstər o gül yanağın, şadlıq edək,
Demə ki, sən mənə taysan? Nə olar!
Ey dənizdən ucalan yaz buludum,
İncini bağçama yaysan, nə olar?
Kim həya sahibidir, o utanar,
Üzümə söyləmə, zaysan, nə olar?
Qonağın olduğumuz dəmdə bir an,
Aynanı bir yana qoysan, nə olar?
Dəryanın səyi nahaqdır, Saib,
Fikr elə, dalğalı çaysan, nə olar?

* * *

Üzündəki ol niqab hüsnünə verməz zərər,
Günəş səni görəndə puçur-puçur tər tökər.
Gülüstanda olmağın nədir bizə faydası?

Nərgiz kimi xumarsan, ömür keçir, gün keçir.
Xırmanımın olmamış ildırımdan qorxusu,
Ay işığından mənə dəysə, dəyər hər xətər.
Tövbəliyəm, tövbəimi sındıracaqdır yəqin,
Bahar belə tez gəlib, tez də ötərsə əgər.
Söylə, kim heyran deyil çəmənlərin seyrinə?
Lalələrin dalğası qalxıb kəmərdən ötər.
Keçər həyat suyundan, Saib olarsa təşnə,
Fəqət gül mövsümündə çətin şərabdan keçər!

* * *

Baxışların qəlbimi, vallah, viranə eylər,
Əksin düşər aynaya, aynada xanə eylər.
Qəlbim qəmin əsiri, mənsə onun əsiri,
Divanəyə dildarlıq yenə divanə eylər.
Azədələr ürəklə hesablaşar çətində,
Bəzən də bu hesabı təsbeh-səddanə eylər.
Zülfün elə dağılmış, elə pərişan olmuş,
Görüm əli sınaydı, kim ona şanə eylər.
Aşiqlər biqərardır, hüsnün bundan xəbərsiz,
Şam fanusda, nə etsə, yanan pərvanə eylər.
Saib təzə mənalar gətirəndə şerinə,
Çoxu, üslub gəzirəm, deyib bəhanə eylər.

* * *

Heç görübsən birini, çirkin üzə heyran ola?
Kor elə kordur, nə fərqi ev ola, meydan ola.
Ölümün qüdrəti çatmaz soyuda eşq odunu,
Bu mahal işdi, avam röya görə, loğman ola.
Dünyanın qibləsi eşqin evidir, eşqə inan,
Məskənin səhra ola, sahil ola, ümman ola.
Sil kədurət tozunu sən gözünün yaşı ilə,
Çün yağış yağsa, yuyar ya dağ ola, orman ola.
Ucalar göylərə fəryadı Züleyxanın o dəm,
Yusifin başının üstündə əgər böhtan ola.
Xəstə qəlbim sevinər, halımı sorsan, Saib,
Elə gəl başımın üstə, gəlişin dərman ola.



* * *

Düşmənə rəhm eyləyən qəlbdə fəqət sevda olar,
Daşı atsan oda, axırda dönüb mina olar.
Canladıb dostu xəyalda söhbət etmək yaxşıdır,
Bir xəyal et ki, bu aləm özgə bir dünya olar.
Şövqü düşmüş xalının, çöhrən münəvvərdir tamam,
Kimdə olsa böylə xal, bil ki, günəşsima olar.
Ey xəzanın yelləri, əl çək bu cövlandan axır,
Qönçəni xəndan edər, hər vaxt nəsim peyda olar.
Xudpəsəndlikdən düyün düşmüş bütün işlər belə,
Qətrə öyməzsə özün, axırda o, dərya olar.
Çün çıxar bağdan o gül köynəkli Yusif hər zaman,
Hər gülün başında bir məşuqətək xülya olar.
Varlığın səhrasını təklikdə keçmək şərt olub,
Tez gedər ol yolçu ki, yolda əgər tənha olar.
Fikrini gəl çəkmə, Saib, o qara zülfün daha,
Çox qalarsa qəm ürəkdə, axırı sevda olar.

* * *

Qəm dolu sinəni açsan, nə qədər qan tökülər,
Kasıbın başına torpaq da damından tökülər.
Daşı ləl eyləyən ancaq o şəhidlər qanıdır,
Yəhərin quşqunu kəsməzsə, qan hardan tökülər?
Buxağından axan ol inci tərin həsrətiyəm,
Bənzəyər ulduza o, sanki səmadan tökülər.
Mey dolu sən o yaşıl küzədəki himmətə bax,
Çün edər başını meyxanada qurban, tökülər.
Bunu kim bilmir açıq, söz ürəyə tez toxunar,
Qəlb əgər titrəsə, gözdən dəxi mərcan tökülər.
Xızr bilsəydi o gül rəngli şərabın dadını,
Abi-heyvana o baxmazdı ki, hardan tökülər.
Badəni Saibə, tərk eylə, deyən zahidə de,
İnsanın idrakına məna şərabdan tökülər.

* * *

Sinəmin dağı ürəkdən od alıb, dad eləyər,
Yelləyər sinəmi atəş, o da fəryad eləyər.
Hər daşın köksünün üstündə bitən laləni gör,
Fərhadın tişəsinin atəşini yad eləyər.
Eşqidən qurtara bilməz canını aşiq olan,
Eşq abad olan hər xanəni bərbad eləyər.
Tək onun surəti düşmüş sinəmin aynasına,
Qəlbimi Qaf dağıtək mülki-pərizad eləyər.
Səy edər çün dağıda öz evini hər ləhzə,
Qönçə tək bu əməlilə ürəyin şad eləyər.
Qəlbinin dərdini aşiq gətirərmi dilinə,
Bülbülün olmasa həsrət qəmi, fəryad eləyər?
Elə bil, balta vurur öz qıçına hər kəs ki,
Gülər ustadına, Saib, ya da irad eləyər.

* * *

Mənim bu görkəm ilə çün qılınca bənzərim vardır,
Gülə qonmuş şehi, valeh edən bir bəstərim vardır.
Həyat bir dəryatək coşdu, mən isə səbrilə dözdüm,
Foqət bu dəryadan coşqun içimdə qəmlərim vardır.
Mənimtək yar bəzmindən olan varmı cida, söylə,
Özüm təşnə dolansam da, sanarlar kövsərim vardır.
Bu görkəmdə gedərsəm mən, qiyamətdən də yox qorxum,
Mənə ondan xətər dəyməz, kimə dərdi-sərim vardır?
Məni öldürsə də hərgah göyün köksü, durulmaz heç,
Onu pak etməyə ancaq mənim xakistərim[1] vardır.
Mahaldır incisin məndən qarışqa da bu aləmdə,
Fəqət zalim fələkdə nə kərəm var, nə kərim vardır.
Gözün Saib açanda mey küpün gördü bu dünyada,
Mənimsə al şərab ilə dolu bir sağərim vardır.

[1] Xakistər – gül.



* * *

Yar bağa qoysa qədəm, serviləri xar eləyər,
Nərgizi məst eləyər, laləni bimar eləyər.
Qəlbimin dərdinə məndən daha çox eşq qalır,
Xəstələnsə bir uşaq, dayəyə azar eləyər.
Nə qədər qəm çox olar, bir o qədər can üzülər,
Dilə gəlməz neçə söz, qəlbi biqərar eləyər.
Kim salıbdır məni yarın nəzərindən, onu da
Bilirəm, haqq özü bu dərdə giriftar eləyər.
Bircə göz qırpımına Misrə çatar hər kəs ki,
Yusifin eşqi ilə qəlbini gülzar eləyər.
Saibə kim qulaq assa, o bilər qiymətini,
Köksünü açsa sədəf, gövhəri aşkar eləyər.

* * *

Bu gözəllər ki, təkəbbürlə hey ətrafa baxar,
Bilməyirlər, yarımın qar kimi ağ gərdəni var?
Yığılıblar ki, qiyamət səhərin seyr edələr,
Yaxasın açsa nigar, onda qiyamət də qopar.
Çünki ustad qələmi çəkdi sənin surətini,
Qələmə bənzəri var qamətinin, nazlı nigar.
Ahu ol gözlərini gördü xəcalət çəkərək,
Leylinin xeyməsinə getmək üçün verdi qərar.
Cənnətin meyvəsini vəsf eləyənlər bilmir,
Yoxdu o bağda bu qamətdə, gözəllikdə çinar.
Səni Xızrın o həyat çeşməsinə təşbeh edən
Ləbinin ləlini görsə, bu cahanı unudar.
Qəlbi korlar səni dərk etməyə acizdir, inan,
Qəlbi kor insana yox fərqi, bu qışdır, ya bahar.
O lətif ləblərinin çün əqiqə bənzəri var,
Bir təmasdan o əqiqin qanı torpağa damar.
Dövranın gözlərinin ərşə çəkilmiş yuxusu,
Nə zamandan ki, o məst gözlərin olmuşdu xumar.
Xəcil etmişdi, inan, laləleri al yanağın,
Quş qanadın eləyib özlərinə güllər hasar.

Sən bu qamətlə qədəm qoysan əgər bağa, o dəm
Qumrular tuba[1] budağında tutarlarmı qərar?
Bu çəmənlikdə sənin lalə üzün dağsızdır,
Fəqət o lalələrin cümləsinin min dağı var.
O sənin fitnə gözün yer üzünün şəbnəmidir,
Belə bir ahu baxış görməmiş əsla ruzgar.
Yusifə yoxdu gözəllikdə bərabər bir vaxt,
Sən bu hüsnünlə edərsən nə qədər Yusifi xar.
Saibin təbi bu aləmdə çoxun heyran edib,
Mənanı dərk eləyənlər bunu etmiş iqrar.

* * *

Sən fikir vermə mənim ahıma, ey nazlı nigar,
Ud yanar odda, nə tüstü, nə də ki, nalə çıxar.
Cənnətin hansı xiyabanı sənə məskən olub,
Mən sənin kölgən olum ömr boyu, əhdim var.
Sən bu gücsüzlərə, gəl baxma həqarətlə belə,
Bu elə bəsdi ki, tale olara olmadı yar.
Mən iki həftə bu gülşəndə ki, mehman oldum,
Gül nədir, şəbnəmi də nalələrim eylədi zar.
Üstünün torpağına baxma o bədxasiyyətin,
Arı torpağa bulansa, daha da bərk sancar.
Bu qəzəl Moləviyə oldu cavab Saibdən,
Bir yaşıl günbəzin üstündə günəş tutdu qərar.

* * *

Bizim bu ağzımızı ol dodağı lalə tutar,
Necə ki, ağzını məstin fəqət piyalə tutar.
Ümid edirdi nəsim ki, tutar ətəklərini,
Misirdə köynəyini Yusifin vüsalə tutar.
Qəmi qəm üstə yığıb qəlbimin yolun tutdum,
Necə ki, daş daşın üstə düşər, şəlalə tutar.
Ucalsa ahı onun, yüz qapı açar üzünə,
İşarəsi bəs edər, hətta bir mahala tutar.

[1] Tuba – (dini) cənnətdə hündür ağac.



Cavabdı Bülbüli-Nişapura bizim bu qəzəl
Ki, lalənin qiyasın hər zaman cəmalə tutar.
Bitən deyil bu cahanın işi, inan, Saib,
Zəmanə hümmət edən kəsləri cidalə tutar.

* * *

Kim deyir, səpsən əgər toxmu, şoran yer göyərər?
Bəlkə, alnından ora töksən əgər tər, göyərər?
Nə zaman qırmızı qar yağsa səmadan, o zaman
Şairin bəxti gülər, sözləri bir-bir göyərər.
Şadlığın toxmu göyərməz bu cahanda, bunu bil,
Kədərin toxmu əgər düşsə sərasər, göyərər.
Məni kol-kos bürüyüb, qorxmayıram bundan da,
Haraya düşsə bu beynimdəki sözlər, göyərər.
Xoş olar qırmızı rəng ilə naxışlansa libas,
Bax, payız vaxtı ağaclar da geyər zər, göyərər.
Tutinin balu pəri sadə göyərmir, Saib,
Acı göz yaşı tökər, tapmasa şəkkər, göyərər.

* * *

Eşq düşməndi cana, eyləsən həzər, neylər?
Zəmanə çəksə qılıncı üstünə, sipər neylər?
Bu ahu nalə ilə bəxtimiz açılmayacaq,
Belə ağır yuxuya sübh yeli dəyər, neylər?
Cəhənnəmin oduna şəbnəm eyləməz təsir,
Bu qəlbin atəşinə hər xumar nəzər neylər?
Hədəfə düz dəyə bilməz bir ox ki, əyri ola,
Bəsirət əhli deyilsə, ona sədəf neylər?
Ata öz oğluna yüz yol məhəbbət eyləsə də,
Zəmanə öz işini görməsə əgər, neylər?
Cahanda yanmağa bir şey tapılmasa, Saib,
Yanıb daşın sinəsin, çıxsa da şərər, neylər?

* * *

Bilsən kim, bu gözəllər sənə ülfət edəcək,
Onda bəxtin quşu da uçmağa cürət edəcək.
Şahidə ehtiyacım yoxdu qiyamətdə mənim,

Lalə ruxsarlar özü qətlə şəhadət edəcək.
Yol kəsəndən ayıq ol, Xızr əgər yüz də desə,
O kəsin vay halına, doğrusu, qəflət edəcək.
Bu gözəllik elə nemətdi asan gəlməz ələ,
Payimal etsə zəmanə, ya da qürbət edəcək.
Aşiqin arzusu eşqində şəhid olmaqdır,
Təşnəyə kim su verərsə, ona hörmət edəcək.
Saibin başını istərsə mürüvvətsiz adam,
Nə təəccüb, nə tərəddüd, nə də minnət edəcək.

* * *

O odun şöləleri qəlbimizə ram olmaz,
Yansa pərvanə oda, pak olar o, xam olmaz.
Günəşin göz yaşı şəbnəm kimi endi başıma,
Nə xoş əyyam idi o, heç belə əyyam olmaz.
Dan yeri güldü, şəfəqdən qana döndü göy üzü,
Şadlığı qəm doğurur, çünki sevinc tam olmaz.
Quru ot tək od alıb yandıracaq dünyanı,
Hər kəsin qəlbi məhəbbətlə yanan şam olmaz.
Cənnətin, Saib, açarlar qapısın da üzünə,
Kim cəfa çəksə bu dünyada, o, bədnam olmaz.

* * *

Məhəbbətin yolunda neylər sənə muğilan?[1]
Aşiqlərin yanında nədir təxti-Süleyman?
Bu məğrur eşq bir vaxt Yusifi məhbus etdi,
Yüz-yüz Yusif ömürlük olubdu əhli-zindan.
Sübhün yeli gətirdi uzaq Çindən hədiyyə,
Mişk ətrinə büründü tamam zülfi-pərişan.
Nədir bu qara torpaq, bu işrətli naxışlar?
Bu aləmi yaratmış ətriylə, bəlkə, reyhan?
Qəflət içrə yatanlar, Saib, ölüblər əlan,
Bu bülbülün səsindən onlar olarmı heyran?!

[1] Muğilan – dəvə tikanı, qanqal.



* * *

Etməyib nə ay, nə ulduz, nə Günəş dünyanı ağ,
Bir yığın insan sümüyü etdi bu zindanı ağ,
Sinədən oxtək çıxar ahlar, fəqət yox rəngi heç,
Vay o səyyada, olar daim oxu, qurbanı ağ.
Yusifin şahlıq sarayın tərk qıldı Misrdə,
Bir otaq saxlar ona Kənanda öz cananı ağ.
Qar kimi ağ namə istərlər, qiyamət başlasa
Faydası yoxdur qoyubsan süfrəyə sən nanı ağ.
Qeybətə açma ağız, pəhriz elə sən hər zaman,
Çox da ki, misvak[1] ilə sən etmisən dəndanı[2] ağ.
Şahlara sən ev tikirsən, öz evində yox çıraq,
Sadəlikdən can qoyub, etdin fəqət divanı ağ.
Tinətin pak olsa, ölsən də, yenə xeyrin dəyər,
Ud yanıb kül olsa da, eylər külü hər yanı ağ.
Eşq yolundan yüksələn tozlar şəfəq dəryasıdır,
Zəncinin rəngin edib bir anda eşq meydanı ağ.
Bircə gündə, gör, necə dümağ olub sübhün saçı?
Ay da istər eyləyə axşam çölü, ormanı ağ.
Ay camallı nazəninlərlə dolubdur İsfahan,
Saib, onlar eyləyib başdan-başa İranı ağ.

* * *

Getmə sən dərdin üçün hər adama dərmana,
Yusifi qardaşının məkri salıb zindana.
Zəncirin halqasına bənzəyir o ahu gözü,
Məni zəncirləyərək etdi axır divanə.
Bir tikansız gülə bənzətdi cahan gözlərimi,
Güldü nərgiz, dedi bu göz yaşıma şehdanə.
Arifin qorxusu yox gərdişi-dövrandan, inan,
Gəmini tapşırıb ümmandakı o tufana.
Sən bizə baxma, qarışqa dil açıb dinsə əgər,
Şah Süleyman gülüşün muzd verər, bil ki, ona.
Odlu ah, qanlı sinə, göz yaşı, Saib, dilədin,
Bunu da verdi sənə, varmı sözün dövrana?!

[1] Misvak – diş təmizləyən fırça.
[2] Dəndan – diş.

* * *

Saralıb-solmadı, birdən-birə o, pir oldu,
Ağaran saçları öz boynuna zəncir oldu.
Onun eşqi nə qədər evləri viran elədi,
Hicrinin dərdi neçə sinəyə şəmşir oldu.
Zamanın dövrü azad qəlblilərə etməz əsər,
Sərv üçün qış da, bahar da həmişə bir oldu.
Ölü canlarda olar kafurun[1] ancaq qoxusu,
Kafura döndü kimin saçları, dilgir[2] oldu.
Kim ki, xam gəldi cahan mülkünə, Saib, səntək,
Zamanın hadisəsindən ona təsir oldu.

* * *

Hər vaxt ki, sevincdən boğazında qəhər oldu,
Sanki o qəhər döndü sənə bal-şəkər oldu.
Qəflətdə olan ömrünü işrətdə keçirtdi,
Biçarə o kəsdir ki, fəqət baxəbər oldu.
Adətdi bu, dərman çox içərsən, əsər etməz,
Ol qədr mey içdim, axırı bisəmər oldu.
Qumru oturub sərvidə boynunda da həlqə,
Bu görkəm ilə bağda o sərv cilvəgər oldu.
Hər arzunu sən həbs elədin köksün içində,
Fikr eyləmədin ki, axırı bir xətər oldu?
Bir küncə çəkilməklə minər qiymətə qətrə,
Qətrə sədəfin qəlbinə düşdü, gövhər oldu.
Cənnətdə belə qövr eləyər sinədə dağım,
Saib, sorağın özgə məkandan gələr oldu.

* * *

Necə ki, gül budağı sarmaşıb divara, gələr,
Öz ayağıyla aşiq də yol alıb dara gələr.
Yoxdu iş sahibinin verdiyi pullarda gözüm,

[1] Kafur – ağ rəngli, spesifik qoxulu yağ. Müəyyən vaxt ərzində yayılan iyin qarşısını almaq üçün ölünün cəsədinə çəkirlər. Sonrakı sətirdə «qar kimi ağ» mənasında işlənmişdir (Red.).

[2] Dilgir – ürəyi tutulmuş.



İş əgər zövq verə, mən gedərəm, hara gələr.
Nəşəyə zəhr qatan işlərə meyl eyləməyin,
Bir cəhənnəmdi bu işlər, gününüz qara gələr.
Torpaq açmış qucağın gözləyir hər anda bizi,
Beşiyi tərk eləyən axırı məzara gələr.
Gəlmədin, Saib, əgər sən bu cahanın işinə,
Vaxt gələr, qəm eləmə, nəğmələrin kara gələr.

* * *

Bizi məftun eləyə bilməyəcəkdir dünya,
Yusifi Misrin ayı salmadı çün sevdaya.
Elə möhkəm dayanıb torpağın üstə ayağım,
Qeyri-mümkündü məni sel apara dəryaya.
Varlı öldükdə min həsrətlə gedir dünyadan,
Çünki uymuşdu yazıq ömrü boyu xülyaya.
İndi o piri-xərabatdan əziz bir kəs yox,
Kim çağıra, hamıdan tez gəlir o çünki haya.
Kaş bu sınmış gəmidən sahilə bir taxta çıxa,
Verə o xalqa xəbər ki, gəmimiz batdı suya.
Şirinin şəklini əmr etdi silinsin qayadan,
Xosrovun əmri ilə silmək olarmış guya?
Saib, ahəstə apar sən bu cahanda işini,
Qafil ol kəsdi, şirin pəncəsinə pəncə qoya!

* * *

Bu dəli könlümü zəncirləmək asan olmaz,
O qısa zülfə düyün vurmağa imkan olmaz.
Pərdə ardında keçib ömrümüz heyrətdə tamam,
Torpağın aləminə, söylə, kim heyran olmaz?
Sənsiz o mehraba yüz tutsam, ibadət eləsəm,
Qəlbimə qaşın oxu dəysə, pərişan olmaz.
Gücsüz idim, məni eşq qaldıra bildi yerdən,
Yoxsa, viran ürəyin təmiri asan olmaz.
Səddi-İskəndər olubdu bu dönük taleyimiz,
Qurumuş çay kimi südsüz belə püstan olmaz.
Dəlilik zəncirinin dairəsin aşmış, inan,
Yoxsa Saib kimi bun naləd̈ə insan olmaz.

* * *

Bu naz ilə yerişin canımı pünhan aparar,
Dağ seli, hər nə çıxar qarşıya, asan aparar.
Hər kimin yoldaşı olmazsa münasib yolda,
O özüylə, elə bil, ah ilə əfğan aparar.
Xacə, zər yığma daha, *bir yada sal son gününü,*
Arını gör, pətəyindən quruca can aparar.
Butədə işdi qızıl pullar əritsə bir adam,
Xeyri olmaz bu işin, axırı böhtan aparar.
Əyri ox, əyri adam dövrüdü, Saib, indi,
Düz adam düz oxu hardan tapıb, hardan aparar?

* * *

Əsl aşiqlərə bu daği-məhəbbət nə edər?
Qırmızı laləni o dəşti-qiyamət nə edər?
Gövhərə fərqi nədir dəryada su çoxdu, ya az,
Kim quraqlıqda suya etsə qənaət, nə edər?
Göy igid qalxanıdır, düşmüş əlindən burda,
Bu döyüşdə silahın yoxsa, şücaət nə edər?
Oğlunun ətrini köynəkdən alar idi Yəqub,
O kəsin ki, yox əlində belə fürsət, nə edər?
Yusifin qiyməti qürbətdə daha artıq olub
Kim, əziz oldu ona bu acı qürbət, nə edər?
Zəhəri tök qədəhə, bil, dəyişib şərbət olar,
İynəli sözlə bizə eylə nəsihət, nə edər?
Millətin qəlbi qaranlıq gecədən də qaradır,
İndi Saib, daha əfsus, ya şikayət, nə edər?

* * *

O qara gözlərin hardan yenə düşdü yadıma?
Olum o gözlərə qurban, yenə düşdü yadıma.
Qəlbimi parçalayan oxları andım bir dəm,
Səf çəkən ol qara müjgan yenə düşdü yadıma.
*İldırım kolluğa düşdü, alışıb söndü, sənin*
Baxışın bir də, doğrudan, yenə düşdü yadıma.



Qıvrılan telləri gördüm odun üstə, təzədən
Tellərin oldu nümayan, yenə düşdü yadıma.
Qəlbimə baxdım, üzün orda göründü gözümə,
Göydəki ol məhi-taban yenə düşdü yadıma.
Bülbülü gül budağında oturan gördüm mən,
Gülahın baftalı, əlvan, yenə düşdü yadıma.
Saibin xırmanını odladı o odlu baxış,
Bir daha yanmış o xırman yenə düşdü yadıma.

* * *

Ətəyin çəkdi əlimdən nə üçün, bilməm, o yar,
Söyləyin, gül qoxusu güldən haçan ayrı olar?
Allah-Allah, bura sübhün yelimi əsdi belə,
Güllər əhdin unudub, yoxdu vəfa, yoxdu qərar?
Et inayət, gözucu baxsan elə bəsdi mənə,
Yoxsa hicrin məni əzdikcə əzər, nazlı nigar.
Səni bayram ayıtək göstərərəm barmaqla,
İkiqat etsə məni dərd, dözərəm, əhdim var.
Vermişəm çiynimi eşqin yükünə, yoxdu qəmim,
Əymişəm qamətimi, qibləm olubsan, ey yar.
Əriyir buz kimi qəlbim, xəbəri var o kəsin,
Əli yardan üzülüb mən kimi qalmış o da zar.
Mən ki, məstəm, necə bu meyxananı tərk eləyim?
Sahili tərk eləməz, Saib, o kəs təşnə olar.

* * *

Bu günah məndən olub, indi ürək dad eləyir,
Ov özü qafil olur ki, ovu səyyad eləyir.
Naləm o daş ürəyə zərrəcə təsir eləməz,
Ancaq ahımla mənim dağ belə, fəryad eləyir.
Sümüyüm döndü toza, yoxdumu insaf səndə?
Şirini gör ki, necə Fərhadını yad eləyir!
Kim günahsız qanını töksə, tutar qan da onu,
Necə cəllad evini qan seli bərbad eləyir.
Bir səbəb var ki, xarabata gedir Saib də,
Kim ora qəmli gedir, qəlbini tez şad eləyir.

* * *

Saqi gor bir cam ilə xatirimi şad eləyə,
Yüz dəfə xoşdu ki, o meykədə abad eləyə.
Yatmış ahu gözünü yozmaginan şuxluğa sən,
Vay o gündəndi ovun dərdini səyyad eləyə.
Ey gözəllər şahı, bir söylə, nə insafdı axı
Ki, zəmanəndə sənin aşiq hamı dad eləyə.
Yenə divanəliyim düşdü yada, qəmlənirəm,
Bir nəfər varmı məni qüssədən azad eləyə?
Çün yaşıl xəttilə yazmazsa Süleyman əmrin,
Aşiqə, kimdə hünər vardı ki, imdad eləyə?
"Leyli və Məcnun" elə qəm gətirən vaqeədir,
Kim onu dinləsə, istər elə fəryad eləyə.
Allah-Allah, bu necə hüsnüdü, sən xəlq elədin,
Harada olsa, inan, mərəkə icad eləyə.
Saibin fəryadı dağlarda verər əks-səda,
Bisütun dağı kimi Fərhadını yad eləyə.

* * *

Məni pəjmürdə görüb, kim mənə irad eləyir,
Kaş görə ləblərini, gör necə fəryad eləyir.
Eşq tufana verir yanmış ürəklər külünü,
Sən edən zülmü məgər ahuya səyyad eləyir?
O kəsin ki, heç əlindən yerə düşməz təsbeh,
Görmüşəm ağzı ilə şişə açır, dad eləyir.
Şərabın şövqü yarın surətinə düşsə əgər,
Şam kimi şölə çəkib, aşiqini yad eləyir.
Kim deyir pərdədə küfr ilə iman yox əsla?
Hüsnünün şöləsi bu sözləri bərbad eləyir.
Dağıdar idi yəqin səhraya yel zərrəmizi,
Yaxşı ki, yar bizi hər qüssədən azad eləyir.
Yorulub qalmaq ilə heç də qısalmır yollar,
Kəbəyə çatmağa məqsəd bizə imdad eləyir.
Hafizin ilhamı, Saib, yenə yetsin dadına,
Şeridə İsa kimi möcüzə icad eləyir.



* * *

O hüsnün ucundan mənə səhra vətən oldu,
Gül çöhrəni görcək bu düzənlər çəmən oldu.
Şirin gülüşün ağzımızı bal kimi etdi,
Kama çatasan, arzularım mən deyən oldu.
Ahu bu düzəndənmi keçib, ətri qalıbdır?
Bu laləli çöl, fikr elə, Dəşti-Xotən oldu.
Gəl sovməyə[1] bircə kərə sən nəzər eylə,
Yüz zahidi gör ki, dəyişib mey içən oldu.
Bu bağda dünən hər nə bitirdi, acı idi,
Düşdü dodağın şövqünə, şəkkərlə tən oldu.
Camım dolu qalmış hələ də köhnə şərabla,
Məst olmuşam, heç bilmirəm ancaq nədən oldu.
Göz yaşım axıb düşdü gecə aynanın üstə,
Hər qətrə şehə döndü, o ayna çəmən oldu.
Nəğməylə silər Saib ürək dağını bir-bir,
Çünki o da bülbül kimi bağda ötən oldu.

* * *

Sən əgər dinməyəsən, mey dolu sağər verilər,
Bil ki, cənnət bağı da sonra sərasər verilər.
Yar əgər versə qulaqburması, məyus olma,
Səhərin gül dodağından sənə gövhər verilər.
Qəlbinin parəsini ud kimi sən atəşə at,
Ondan hər bir sinədə sözlərinə yer verilər.
Köksünü bal şanı tək eyləməsən göz-göz əgər,
Bu gülüstanda çətin ki, sənə güllər verilər.
Dünyanın şadlığını bihuş olanlar yaşayır,
Sən ayıq olsan əgər, qəm sənə sərvər verilər.
Ocağında qarışıb qaynamasan dövrün əgər,
Dərdinin üstə gələn dərd daha bədtər verilər.

* * *

Sinədən qalxan o ahlar dönər axırda ələmə,
Sahibi-meydan olar sahib olan dərdə-qəmə.
Qarabaxt olmağa layiq ola bilməz hər baş,

[1] Sovməə – ibadət yeri, monastır.

Bu taca layiq o kəsdir ki, vurulmuş qələmə.
Əfsus olsun ki, sınıq bir şişədir təkcə bədən,
Ciyərin qanı onu döndərəcək cami-cəmə.
Fələyin əmrinə kim boynun əyər, şad dolanar,
Fərmana boynun əyən hər kəsə, acizdir, demə.
Kim ki, vurğundu ürəkdən, ona qeyrtli deyin,
Bu pərişan sinəmin bağları gəlməz rəqəmə.
Zamanın dalğaları, bil, səni divanə edər,
Dalğa ləngər daşıdır ancaq o sabit qədəmə.
Keşməkeşli bu həyatda qoru öz səbrini sən,
Ziyanın üçqat olar, anla, şikayət eləmə.
Dünyada qisməti nə olsa, huma şaddı buna,
Kölgəsin salsa kimin üstdə, dönər möhtərəmə.
Bülbülün fəryadı ondan ötəri qalxar ki,
Güllərin həsrəti ilə düşür hərdən sitəmə.
Məst olan öz qəmini nəğmə kimi ötsə əgər,
Bilməz o nəğmə zilə qalxdı, ya da düşdü bəmə.
Tufanı ram eləyər sinədəki eşqin odu,
Çün günəşdir uçuran şəbnəmi mülki-Ədəmə.
Heç rəvadırmı ki, Saib, ürəyin Kəbəsini,
Bu xəyallar çevirə boş yerə beytüssənəmə.[1]

* * *

İki kəs xəlvəti söhbət eləsə, od alışar,
Min ürək sussa əgər, min ürəyin bir sözü var.
Vəhdəti-eşqidə kim sürmə çəkibdir gözünə,
Dərisi xallı pələng ol kəs üçün ahu olar.
Bir ürək ovlamasam, qəlbimi verməm birinə,
Kim məni ovladı, o öncə mənə oldu şikar.
Hansı gülşəndə şəkər ləblərinin şəhdi düşüb,
Tutitək hər çiçəyin yarpağı bir nəğmə qoşar.
O əqiq ləblərini gördü, xəcil oldu Süheyl,[2]
Sanki bir qətrə qızıl qandı, o, göylərdə axar.
Asiman da unudubdur bizi, Saib, deyəsən,
Fəqət ulduz dolu bu göydən uzaq düşmək olar?

[1] Beytüssənəm - bütxana.
[2] Süheyl – cənubda ən parlaq ulduz.



* * *

Gözlərin doğma baxışlarçün olub biganə,
Kafirə, dindara dava yeridir bütxanə.
Qəmədən döndərərsən üz, sinəni parçalayar,
Çün əzəl gündən olub zülf ilə məhrəm şanə.
Məclisi-vəhdəti arif kişilər dərk eləyər,
Dönməz hər şam başına yanmaq üçün pərvanə.
Boyat olmuş çörəyi sən çalış iştah ilə ye,
Üzlülük eyləməyi nöqsan olar mehmana.
Sözü dərk etməyənə söz deməyin faydası yox,
Aynanı vurma daşa, Saib, heyifdir ayna.

* * *

Çox çətin göz yaşını saxlaya bilsin müjgan,
Dəryanın pəncəsinə qarşı durarmı mərcan?
Qala divarın aşar, istəsə divanəliyim,
Təndiri söndürəcək başlasa şiddətli tufan.
Əlimin atəşi dağlar əridibdir civətək,
Bisütun dağını qaldırmağım ondan da asan.
Bu dəli qəlbimizin özgə tamaşaları var,
Vəhşi ahu kimi o, sinədə eylər cövlan.
Necə Məryəm sıxar öz sinəsinə İsanı,
Qara torpaq da bizə köksün açıb verdi məkan.
Dəryanın qəlbinə atəş salar hər nazlı baxış,
Zahid isə kuzəyə baxmasın, hifz et, yaradan!
Əlim o sərv boyun daməninə çatmasa da,
Sinəmi tufana gərrəm, dənizə dəysə ziyan.
Özgənin rəhminə sən arxayın olma, Saib,
Allah hifz eyləsin ay üzlü yarı hər bəladan.

* * *

Bu tikanlıqda nə gül bitdi, nə də lalə qalar,
Yelləri boş yerə çapdı burada nazlı bahar.
Gülüşün axırı çox vaxtı dönür göz yaşına,
Qaydadır ki, gülabı ətr satan güldən alar.

Bu dağı çapdığı vaxt qətlə yetişmiş Fərhad?
Qırmızı lalələr ilə bəzənib burda məzar.
Göyü on dörd gecəlik Ay bürüyər nura tamam,
Ruzigar tutsa əgər səbr ilə bir yerdə qərar.
Qəlbini eşq ilə şad eylə, əcəl gəlsə belə,
Eyləməz eşqilə rövşən ürəyi əsla şikar?
Sədəfin qəlbi elə dardı ki, dərya suyunun
Ora bir qətrəsi düşsə, dəyişib gövhər olar.
Bağbana laləli, güllü bu bağın qalsa əgər,
Ya quru zəhməti, Saib, ya cigər dağı qalar.

* * *

Saldı öz kölgəsini üstümə ol sərvi-rəvan,
Elə bil çiynimə gül yarpağı qondu bu zaman.
O xumar gözləri getmişsə dərin bir yuxuya,
Üzünün inci təri yüz gözü etmiş heyran.
Kölgəsindən yağacaq hər yana rəhmət yağışı,
Gözləri sanki günəşdir, alışar odda cahan.
Məst olub çıxsa əgər, ətr yayar zülfü onun,
Sanacaqsan ki, ətir dəryası olmuş hər yan,
İstəsə səbri, huşu başdan alar bir anda,
Çün baharın yelinə tab eləməz bərgi-xəzan.
O qara gözləri də sürməni salmış gözdən,
Şux nəzərlər onu gördükdə susurlar həyadan.
Susması, sanma, onun çöhrəsinə pərdə salar,
Üzünün nuru ilə kəşf olunar razi-nihan.
O günəş surəti ki, yer üzünü rövşən edib,
Fələyin tacına da şölə saçıb, bil ki, hər an.
Torpağın üstə əgər naz ilə qoymuşsa qədəm,
Ora bir gülşən olub, cənnətə bənzər o məkan.
Dolanıb zülfü onun tük kimi nazik belinə,
Hansı yer olsa zəif, dərd yapışar tez ordan.
Xəncərin altına, Saib, səni bu eşq çəkib,
Üstünə sayə salıb, gör, nə qədər qaşı kaman.



* * *

Ürəyin dərdlərinə əql də imdad etməz,
Bu viran qəlbimi heç kimsə, bil, abad etməz.
Sirrimiz faş olar axır, belə pünhan qalmaz,
Qönçənin ətri də bu qəlbimizi şad etməz.
Neçə söz əhli sənin hüsnünə tərif yazıb,
Xalının tərifini, bil ki, hər ustad etməz.
O xumar gözlərin axır çoxunu məhv elədi,
Düzü, İsa da belə möcüzə icad etməz.
Dünyanın neməti acgözləri doydurmadı heç,
Nəfsiçoxluq o qarışqanı da rahat etməz.
Darvaza halqasının yoxdu həyətdən xəbəri,
Dil ürək sirrini hər ləhzə axı yad etməz.
Göylərin hökmünü rədd eyləmək olmaz mümkün,
İldırım etdiyini şirlərə səyyad etməz.
Mehr ilə versə də süd körpəsinə hər bir ana,
Bu məhəbbət də bizi qüssədən azad etməz.
Pir ilə gənc ola həmsöhbət, uzun çəkməz, inan,
Kaman əyməzsə belin, oxları fəryad etməz.
Bu gülüstanda açan güllərə, Saib, indi
Sən edən tərifi, bil, özgəsi, heyhat, etməz.

* * *

Yarın yanında məni, gör, necə əyibdi bu qəm,
Baharda, diqqət elə, sapsarı xəzan kimiyəm.
Bəzənməyin yeri yox dəryada, bu labüddür,
Çıxanda sahilə, bax, özgədir tamam aləm.
Cahanda varsa qəmim, tək budur qiyamət ola,
Bu dünya əhlini mən qorxuram dübarə görəm.
Bəsirət ilə nəzər sal bu qəsri-möhtəşəmə,
Düşün, bu cahi-cəlalla xarabdı, ya möhkəm?
Hər işdə batini çün görmək istəyər Saib,
Ürəkdə arzu böyükdür, nə fayda, imkan kəm.

* * *

Bu gedən qafilədə mən önə düşsəm, nə olar?
Şad xəbərlə hamıdan öncə görüşsəm, nə olar?
Gözü qorxmuş adama kölgə uca dağ görünər,

Bu səfər vaxtı özümlə mən ötüşsəm, nə olar?
Kim çatar məğzə, qabıq onda dönüb zindan olar,
Kaş mənə məchul ola hər iki aləm, nə olar?
Yansa pərvanə, dönər sürməyə şəmin gözünə,
Sındıra balu pərim sənsiz əgər qəm, nə olar?
Özgənin eyblərin yüz göz ilə axtaranın
Qalsa öz eybləri hər kəsə mübhəm, nə olar?
O pərişan saçına bənzəyirəm illərdir,
Bir gecə cürət edib payinə düşsəm, nə olar?
Ölmüş idim, yararaq daşı yenə çıxdım mən,
Qəlbinin atəşinə bir daha bişsəm, nə olar?
Həsəd ilə baxanı sanma dilənçi, Saib,
Mən də bu baxmaq ilə kamə yetişsəm, nə olar?

* * *

Gör, cahan şahına şövkət ilə izzət verilib,
Mənə bu guşədə bir dünya məhəbbət verilib.
Baxıram dörd yanıma, qorxulu səhra kimidir,
Belə bir yerdə mənə qalmağa fürsət verilib.
Qəlbimin qanıdı dünyada mənə qismət olan,
Şəmşirə bənzəyirəm, çün mənə qeyrət verilib.
Yazıq o sadəlövh insanlara bu aləmdə,
Söykənib bir daşa, sanki ona nemət verilib.
Yequb axtardığını görməsə də, tapdı axır,
Bu da hikmətdi, kora yaxşı bəsirət verilib.
Saib, ol al şərabı hər dəfə mən nuş etdim,
Nə edim, meyxanada dərd mənə qismət verilib.

* * *

Məni bu qönçə dodaqlar yenə bihal elədi,
Ağzı bağlı şişədən mey verərək, lal elədi.
Həsrətindən üzülüb döndüm axır tazə aya,
Məni bədr etmək ilə sonra xoş iqbal elədi.
Bir ömr mən də əqiqtək nə əziyyət çəkdim,
Mən əziz oldum əgər, dövr bu minval elədi.
Qəlbimin qanını içdimsə, şükürlər olsun,



Öz kəlamım məni axır yenə xoşfal elədi.
Ağzını açmadı Saib, o şirin ləblər axır,
Bir şirin busə ilə ləblərini al elədi.

* * *

O firəng dilbəri dindən məni biganə edər,
Kəbəyə üz tuta o, Kəbəni bütxanə edər.
Çox da möhkəm deyiləm, tez dəyişir əhvalım,
Halımı tari-mar etsə, gözüməstanə edər.
Dolanar əldən-ələ torpağımın hər ovucu,
Çərx onu təsbeh edər, ya da ki, peymanə edər.
Heç görübsən ki, gözəl çöhrəni aşiqsiz ola?
Şam əgər tək qala, o, fanusu pərvanə edər.
Məni biganəliyim vəhşətə salmış, Saib,
Qorxuram ki, bu halım dostu da biganə edər.

* * *

İttihad etmək ilə eşq kamiyab olacaq?
Heç inanma böyüyüb, zərrə afitab olacaq.
Ahunun tökmə qanın, axır o da mişkə dönər,
Qönçəni dərmə, açıb axırı gülab olacaq.
Dadıma çat, mənim eşqim, hədərə getdi ömür,
Bu yeyib-yatmaq özü qəlbimə əzab olacaq.
Ay ki, bədr oldu, görürsən yenidən incəlir o,
Acizə rəhm elə kim, axırı savab olacaq.
Bir imarət ucalıb qalxsa buluddan yuxarı,
Gələcək eylə məqam, Saib, o xarab olacaq.

* * *

Heç kimsə mənim namənii canana yetirməz,
Heç kəs sarı bir yarpağı bustana yetirməz.
Göz yaşımın o gül yanağa təsiri olmaz,
Bu kimsəsizi kimsə gülüstana yetirməz.
Divanə açılmışsa əgər həlqədən, heç kəs
Bu müjdəni ol qəlbi nigarana yetirməz.

Hər müşkül olarsa, onu əql ilə açarlar,
Əqlin gücü dərk etməyə insana yetirməz.
Saib, şəhərin sıxdı məni abi-havası,
Kimsə bu dəli qəlbi biyabana yetirməz.

* * *

Aşiqin qanın içən dilbər əgər çəkmir əzab,
Nəyə lazımdı ələ badə alıb içsə şərab.
Mayası qanla tutulmuş, qanı gizlində içər,
Hamıtək badə içəndə elməz əsla hicab.
Özgə aləmdi bu eşq aləmi, aşiq bəzən
Dövranın kəllə tasında çəkir o, başa şərab.
Qaraqəlb insanın heç vaxt ürəyi olmaz işıq,
Günəşin şöləsini mey kimi içsə o cənab.
Yetişib bir bulağın başına bir dəstə adam,
O acı çeşməni nuş eylədilər misli-gülab.
Ölsə aşiq, yenə də eşq, məhəbbət ölməz,
Yuxuda təşnəyə çaytək görünür hətta sərab.
Bu camaat yada salmırmı məgər axirəti?
Bu qədər mey içilər, Saib, hanı həqqi-hesab?!

* * *

Hanı məcnunluq, mənə dünyanı meydan eyləyə,
Oynayam bir körpətək, el səngibaran eyləyə.
Dilbərim, mənə dolu o gözlərim bimarıyam,
İstərəm könlüm evin, etsə, o, viran eyləyə.
Atəşin nəğməmlə məst etdim bu bağda gülləri,
Gülə zülm eylər, məni bağban bu bağdan eyləyə.
Yox gözüm əsla Züleyxaya tamaşa etməyə,
İstərəm, Yusif məni zindana mehman eyləyə.
Tökmərəm mən abrumu, gər töksələr qəlbim qanın,
Qeyri-mümkündür məni gövhər də heyran eyləyə.
Yengi ay tək ləblərin bir gün mənə qismət ola,
Razıyam qaşın məni bu yolda qurban eyləyə.
Pərdələr yandırdı, Saib, qəlbinin şimşəkləri,
Kimdə cürət var onu damənde pünhan eyləyə?



* * *

Hanı o sərvi-rovan ki, məni heyran eləyə,
Mehriban bir baxışa aşiqi mehman eləyə?
Boş təkəbbür gedib acizlik ilə qurtaracaq,
Heç görübsən yana çöp atoşi, tüğyan eləyə?
Bu dəyirmanda kimə növbə verib çərxi-fələk,
Dənini dartmaq üçün bir dəfə imkan eləyə?
Sadədildir o adam kim, çırağın yolda qoya,
Zənn edə, bəlkə, külək yanmasın asan eləyə.
Kim həris olsa mala, bil ki, işi tul olacaq,
Onda ki, əjdahalar xəznədə cövlan eləyə.
Ruzigar alnımızın silməyəcəkdir qırışın,
Od sönən vaxta, bu adətdi ki, əfğan eləyə.
Saibin dərdinə dərman edə bilməz İsa,
Eyləsə, Şahi-Nəcəf, bəlkə də, pünhan eləyə.

* * *

Pərdədən çıxsa o hüsnün bu ürəklər qan olar,
Torpaq atlas geyinər, xəncər əgər üryan olar.
Dünyaya od yayan o eşq də bir gün soyuyar,
Onda İbrahim üçün od da dönüb reyhan olar.
Aşiq ah çəksə əgər, yarı cəfakeşlik edər,
Necə ki, bülbül ötər, gülsə baxıb heyran olar.
Qoymaram eşqimi qət eyləyə bir gün də əcəl,
Çün saraldıqca tikan, dərmək onu asan olar.
Telinin sayəsi gizlətmiş onun gözlərini,
Zalimin xanəsi bir ləhzədə çün viran olar.
Meyə meyl eyləyərəm, mey də minər qiymətə hey,
Eylərəm tövbə o dəm, mey yenidən ərzan olar.
Eşq unutdurdu mənə eşqin o sonsuz qəmini,
Ədl ilə abad olar, hansı bina viran olar.
Məşrub haqda nə desən, zahidə təsir eləməz?
Çirkin üz aynaya baxdıqca ürək nalan olar.
Şadlığı dünyanı tutmuşdu xarabat pirinin,
Göylər əlvan geyinər, dan yeri çün xəndan olar.
Kim paxıldan tikə alsa, uda bilməz, bilirəm,

Vay halına o kəsin, tanrıya bir mehman olar.
Zalim, əldən nə zaman düşdü, özüylə vuruşar,
Çünki qurd dişsiz olar, öz qanına qəltan olar.
Sel axar dağda, düzənlik də dönər batlağa, bil,
Hər kəsi aldada nəfsi, dönüb o, şeytan olar.
İsfahanda yenidən Saib əgər şeir desə,
İsfahan onda iki Zindəruda[1] meydan olar.

* * *

Səni xatırlamağım qəlbimi nalan eləyib,
Gör şəkər ləblərinin eşqi nə tüğyan eləyib.
Huşa gəlməz mey ilə, hər kəsin az olsa huşu,
Məni ahu baxışın əhli-biyaban eləyib.
Neçə məclisdə sənin sözlərinin söhbəti var,
Hər kəlamın nə qədər alimi heyran eləyib.
Qeyrətindən kasıbın göz yaşı olmuş şərabı,
Gör ki, dövran oları bir nəyə mehman eləyib.
Daha qaldır səsini, ağzıgözəllər, bəsdir,
Sənin haqqında deyib böhtanı, dastan eləyib.
Eşq elə ülvidi, mümkündümü gizlində qala,
Şöləni kim ətəyində axı pünhan eləyib?
Nə qədər odlu fikirlər sinədə məhbus olub,
Şəraba darğa niyə kuzəni zindan eləyib?
Heç olubdurmu səhər vaxtı dua eyləyənin
Arzusu daşa dəyib, əksini dövran eləyib?
Sərv himmətlə durar, sərsəri yellər əssə,
Qəlb o vaxt aydın olub, yanmağa imkan eləyib.
Məst gələr, bil ki, qiyamətdə cəza meydanına,
Saibi kim ki, bu dünyada qəzəlxan eləyib.

* * *

Natəvan cismidən hər dəm ucalar ahü-fəğan,
Heç görübsən ki, çıxa ildırımı kolluqdan?
Mən də ümmid elədim aha, fəqət bilmədim heç,

[1] Zindərud – İsfahan şəhərindən axan çayın adıdır.



Çərxi dönmüş fələk ilə o olub həmpeyman.
Təzəcə varlananın könlü, gözü ac olacaq,
Ondan umsan, elə bil, yal umur itdən aslan.
Sadə baxma, zamanın hadisəsi şimşəkdir,
Piltədir çünki çıraqda od alıb ilk alışan.
Gər özündən xilas etsən bütün ətrafını sən,
Bil ki, bayram ayıtək boş qalacaq dövrən o an.
Ehtiyac yoxdu kəmənd ilə şikar eyləyəsən,
Həm kəmənddir o qara gözlərin, həm də kaman.
Çəmənin rəngini almışdı bu şeh danələri,
Bu nə haldır belə, Saib, bu olub bir də haçan?

* * *

Paxıl olsa, xəsisin haləti lap bədtər olar,
Köhnələn bir düyünü açmaq özü məhşər olar.
Güdər öz izzətini kim ki, olar guşənişin,
Qətrə düşsə sədəfin qəlbinə, bil, gövhər olar.
Arzu çox olsa, tamah da tez açar qol-qanadın,
Çör-çöpü atsan əgər şöləyə, balu pər olar.
Əyrilik bilməz o qəlb ki, həmişə aydın ola,
Güzgünü aydın edən seyqəl olar, cövhər olar.
Dövlətə meyl eləmə, hər nə varın bəsdi sənə,
Neydə çox olsa şəkər, onda nəva kəmtər olar.
Üzünü tutma yana, hər qara baxtdan zülfün
O qara görkəm ilə aşiqə də məhzər olar.
Mənim o yarımı Ay görsə, üzə pərdə salar,
Haləsi dövrəsinə şölələnən səngər olar.
Elə sakitdi ürək, gər düşə eşq ümmanına,
Nəğməkar bülbülə hər kəlmə dönər şəkkər olar.
Hansı gülşəndə ki, Saib oxuyar tazə qəzəl,
Orda bülbül susar, hər kəlmə ona neştər olar.

* * *

Dünya dərdindən əgər kim ürəyin etsə uzaq,
Qəlbi eşq aləminin arzularıyla dolacaq.
Elə vaxt gəlsə ki, məstlər də durub rəqs edələr,

Təpik altında fələk tapdalanıb məhv olacaq.
İnanıb etimad etmə bəzənən üzlərə sən,
Bir xəzan yarpağıtək, bil ki, o üzlər solacaq.
Bir dəfə görmək ilə ayna necə qane olar?
Bizə haqq vermək üçün bir də dönüb aynaya bax.
Hüsnünə heyran olubdur, gözə bilmir saqi,
Dolanır çərxi-fələktək başına sanki otaq.
Fələyin arxasını torpağa qoymaq nədi ki,
Çoxunu xar eləyib qoynuna almış torpaq.
Vermə əldən, bu kasıblıq özü bir nemətdir,
Ehtiyacdan görülən hər nahaq iş haqdır, haq.
Ulduz-ulduz göz olur xırdalanan vaxtda fələk,
Sanki gül üstə düşən şehdi, yanır parlayaraq.
Səy elə, Saib, ürək gün kimi olsun aydın,
Sel də səy ilə axır dəryaya çatsın ancaq.

* * *

Saçının kölgəsi çöhrəndə neçə yana düşüb,
Köynəyin altda tikanmı sürüşüb cana düşüb.
Hüsnünü görməyə ariflər hamı səfdə durub,
Sanki səf-səf o yarın kipriyi meydana düşüb.
O şəkər ləblərinin hər gülüşü bal kimidir,
Hər qarışqa bu balın şəhdinə məstanə düşüb.
Ayağın altda düşənlər, demə, acizdi tamam,
Zülfünün ətri damıbdır, hamı dərmana düşüb.
Eşq can gövhəridir, bilməz onu nadanlar,
Zənn edərlər bu da şəbnəmdi, gülüstana düşüb.
Telləri lələnin üstə elə düşmüş, Saib,
Tutilər sanki uçubdur, şəkəristana düşüb.

* * *

Səhərin feyzi sənin ol ləbi-xəndanındadır,
Çünki şəkkər gülüşün şəhdi sənin şanındadır.
Hər ürək ki, suya dönmüş, ya da ki, şəbnəm olub,
Ayağın altda düşüb sərvi-xuramanındadır.



Qönçə sübhün yelini gözləyəcək, yox xəbəri
Güllərin ətri fəqət çaki-giribanındadır.
Az qalıb, aşiqləri nazın tamam candan edə,
Cümləsi çünki sənin valehi-heyranındadır.
Yusifi-Kənan kimi hərraca qoymuş köynəyin,
Ol kəsin ki, gözləri çaki-zənəxdanındadır.
Gördüyün o zərrələr, bil ki, şəhidlər ahıdır,
Dövr edərlər dövrəni, hər ləhzə cövlanındadır.
Xəstələr səndən umarlar dərdinin dərmanını,
Aşiqi rədd eyləmə, çün çeşmi dərmanındadır.
İstəsə göydə fələklər həşr divanın yaza,
Divanın şirazəsi zülfi-pərişanındadır.
Qəlbi zülmət rənglilər, bil, vəslinə çatmaz sənin,
İldırımlar şəmşiri çünki nigəhbanındadır.
Dünyanın hər nemətindən yığginan öz süfrənə,
Bir də gördün ki, bütün aləm sənin yanındadır.
Saibin bu şeri Xosrov Məniyə olsun cavab,
Bu gözəllər öyrənən hər fitnə divanındadır.

* * *

Kim qıydı sənə, söylədi, burdan güzər eylə,
Qəlbə şulaq as, dünya işin müxtəsər eylə.
Nə meynə təki hər küçədə başını aç sən,
*Nə qollarını hər ağaca sən kəmər eylə.*
Həm astarını, həm üzünü gördün həyatın,
İndi təzə bir ayinəyə gəl nəzər eylə.
Gər sübhə kimi qalmağa yox imkanın, onda
Əy başını gültək, gecəni sən səhər eylə.
Bu qan dolu qəlbin başına min bəla gəlmiş,
Bu vaqeədən məşuqəni baxəbər eylə.
Vaxtında açıb ləblərini incə sədəftək,
Göydən enən hər damlanı bir-bir göhər eylə.
Qan almağa neştər ki, baçıqdan da hərisdir,
Düşmən tanınır, dostundan ancaq həzər eylə.
Başdan-ayağa öz-özünə vurğun olub yar,
Söylə ona ki, Saibə də bir nəzər eylə.

* * *

Asimanda sönməsə ulduz günəş taban olar?
Göz yaşı tökməzsə göylər, sübh yeri xəndan olar?
Zalim hər zülm eyləsə, eylə sanar ki, ədldir,
Bu fələk öz tutduğu işdən məgər peşman olar?
Qopsa şiddətli burulğan, eşqə o etməz əsər,
Eşq səhrasında hər bir tufana imkan olar?
Aşiqin köksündə hər dəm baş verər hicran dağı,
Çün kəramət xanəsində hər zaman mehman olar.
Həsrət ilə hər yanan kəs, sanma ki, aşiq olub,
Div üzük taxsa, Süleymantək məgər sultan olar?
İldırımla parçalar göydə bulud zülmətləri,
Hansı dəndir yazda torpaqda qalıb pünhan olar?
Əsl aşiq şəmşiri heç vaxt gətirməz eyninə,
Sel axar dəryaya, öz cananına qurban olar.
Saib öz eşqin fəqət mərdlər yanında faş edər,
Mərd olan yerdə qılınc qından çıxıb büryan olar.

* * *

Dəryanın vüsətinə dalğalar işarə olar,
Yüz yerə parçalanan qəlb də parə-parə olar.
Hey qızıl yığmağa cəhd eyləmə bu dünyada sən,
Aya bənzər o qızıl, bədri ötər, qarə olar.
Vəslidən, ayna kimi, doymamışam ömrümdə,
Bir ömr yara baxam, dərdimə bu çarə olar.
Qayıdar əslinə hər şey, bu səbəbdən mən də,
Qorxuram şişə ürək sonra dönüb xarə[1] olar.
Sən olarsan hamının sevdiyi, bir şərt ilə ki,
Alışan ləblərinin hər biri şərarə olar.
Eşq dağın sinədə gizlədə bilməz heç kəs,
Gün doğar, dan yerinin də sinəsi yarə olar.
Sanki qundaqdayam, iplə sarınıb əl-ayağım,
Fələyin məngənəsindən kimə bir çarə olar?
Günəşin odlu əlindən tuta bilsən, Saib,
Ömrün tazələnər, sübhtək dübarə olar.

[1] Xarə – möhkəm daş, çaxmaq daşı.



* * *

Dinlədim nasehi, divanəliyim artdı yenə,
Xəstəyə sanki zəhər verdi o, şərbət yerinə.
Eşqidə bunca alov-od yox idi ilk günlər,
Elə ki, qəlbə qədəm qoydu o, getdi dərinə.
Kimdi bu dünya işin açmağa qadir olsun?
Hər gələn bir düyün artırdı əzəlki düyünə.
Hər gələn istədi ki, çarə tapa dərdlərimə,
Ancaq heç çarəsi yox dərdlərə düşdü bu sinə.
Oda çör-çöp atılanda daha da şölələnər,
Yaramı tazələdi, dil yarası dəydi mənə.
Vay bu rəsmiyyətə, getdikcə çətinləşmədə iş,
Saib, heç yoxdu bir iş, eşqidən asan görünə.

* * *

Ol vaxt ki, evim səhra kimi sadə yer idi,
Hər dalğa gözümdə, elə bil, balu pər idi.
Bir sərvtək azadə idim mən də bu bağda,
Qəlbimdə olan bəhrələrim bisəmər idi.
Nərgiz kimi bir gün ki, açıldı gözüm, onda
Gördüm ki, ürək qəmli, pərişannəzər idi.
Bir qanlı qılınctək mənə dan gülsə də, ancaq
Çiynimdəki qalxandan o dəm bixəbər idi.
Famusdu edən şəmi də rüsvay bu cahanda,
Bu pərdə ilə söz deməyim bir hünər idi.
Şəbnəm kimi biz qonmamışıq güllərə bağda,
Gül üstə düşən zərrə deyildi, göhər idi.
Ol yar ki, ürəkdən bu qəmi, qüssəni sildi,
Gül ətri yayan dostum o badi-səhər idi.
Qəlbim evinə çün günəşin nuru töküldü,
Ömrüm boyu o, hasil olan xoş bəhər idi.
Saib, yenə dostlar deyəni sən qəbul eylə,
Xacə tərəfin tutmağımız bisəmər idi.

* * *

Yəqin o bal gülüşə süd qatılıb, bir də şəkər
Can alan ləblər isə duzludu, bilsən, nə qədər?!
Zülfünə sünbül hörüb, gül düzülübdür telinə,

Üzünə şölə salan bali-səməndərdi məgər?
Lütf ilə eylə nəzər, harda zəif görsən, ona,
Zəif olduqda şikar ovçu onu azad edər.
Əvf edər mey çəkənin hər günahın Allah özü,
Xahişə Saib ilə saqiyi-kövsər də gedər.

* * *

Xoş o rindin halına, meyxanada olmuş ağa,
Elə məstdir, yıxılır gah sola o, gah da sağa.
Bir əlində guzə vardır, bir əlində dolu cam,
Gah qoyur kuzəni torpağa, durur oxşamağa:
Yan bu meydən ötəri torpağa düşmüşlərə sən?
Bu beyinsiz başımız bəsdi dönüb balqabağa!
Üzünün şöləsi yandırdı məni, soldu üzüm,
Özgələr də belə bir ayna qoyurlar otağa?
İsanın iynəsinə ehtiyacım yoxdu mənim,
Hansı aşiq közəyər yaranı, qoymaz qan axa?
Qəmli söhbət eləsən, təlimə də gəlməzlər,
Kim olar razı, özün məhv edə, kəndirlə boğa?
Sanki möhnət yüküdür Saibə, vallah, bu bədən,
Qorxuram xatirinə dəyməyə, ya danlamağa.

* * *

Nə bizim məstliyimizdən birinə dəydi xətər,
Nə bizim söhbətimizdən bir adam çəkdi zərər.
Açma sən ağzını, əfsus deyə, bu dövran üçün,
Ona dəyməz ki, yana ahım ilə qanlı ciyər.
Eşq bizim gülşənə od saldı, onun şöləleri
İndi aşmışdı buluddan, ucalıb ərşə qədər.
Hərcayı qəlbimə bax, evmizi yaddan çıxarıb,
Özgəyə rəhbər olar, izlərimə baxsa əgər.
Dad çəkib ölməyini söyləyə bilməz ki, ürək,
Yatanı çünki oyadar yuxudan özgə nəfər.
Bülbülü bülbül edən ancaq ulu sevgisidir,
Yoxsa bir çəngə o tük bir belə tərifə dəyər?
Saibin qəlbi yanan qönçəyə dönmüşdü daha,
Onun imdadına çatsa, çatacaq badi-səhər.



* * *

Sübh çağı mey kuzədə dalğalanıb gəldi dilə,
Sanki bülbüldü, səhər vaxtı qoşur nəğmə gülə.
Zülfünün tərifini şanə yenə dil-dil ötür,
Tapa bilməz ona tay, kim gəzə dünyanı belə.
Eşqimin atəşi artdıqca dumanlandı başım,
Elə bil, kakilə bağlanmış ürək min tel ilə.
O, pilәkli papağın əyri qoyarsa, yeri var,
Papağı şam, özü gül, eşqi düşüb eldən-elə.
Saibin halını sorma, o ümidsizdi yenə,
Sənə çatmırsa əli, bil ki, pərişandı hələ.

* * *

Bir ömür səbr elədim, nameyi-canan gəlsin,
Misirin elçisini gözlədi Kənan, gəlsin.
Lalənin dağı ilə gözlərimiz qanla dolub,
Gözləməzdi bu qara kasəni mehman, gəlsin.
Göz yaşım axdı dünən, sel kimi tufan elədi,
İndi bir damlaya həsrətdi bu müjgan, gəlsin.
Dünyanın nəşələrindən çoxunu gördüm, inan,
İstərəm məclisimə yarımı məstan gəlsin.
Bu Zəfər xan kimi söz fəhm eləyən çox azdır,
Saibi dinləməyə kaş belə insan gəlsin.

* * *

Qəlbimin səbrini aldı o günəş üzlü nigar,
Gülü gün altda qoyanda ətri qalmaz, tez uçar.
Məcnun ol qədr baxıb ahuların gözlərinə,
Leylinin gözlərini görsə, onu ahu sanar.
Kimi şəbnəm, kimi gül yarpağı üstə uyuyar,
Başını qönçənin üstə necə də nazla qoyar.
Göz deyər, mən ki şərabda elə qüvvət gördüm,
Sanasan meylə dolu badədə bihuşdarı var.
Nə qədər söhbət uzansa lap o Çin divarıtək,
Axırı zülfi-yarın üstə gəlir cümlə qərar.
Bu qara baxtına Saib nə təəccüb eləsin,
O yarın hindu xalı, söylə, kimi etmədi zar?

* * *

Nə zaman sorxoş olur, onda bizi şad eləyir,
Bax bu duzlu gözələ, gör necə də dad eləyir.
Yaxın olduqda mənə dinməyə imkan vermir,
Uzaq olduqda baxır, fitnələr icad eləyir.
Barışır çərxi-fələkdə nə zaman ulduzumuz,
Xırmanından bu qarışqaya o, imdad eləyir.
Eylə ki, kölgəsini yar götürür üstümdən,
Sanki bir tufan əsir, gülləri bərbad eləyir.
Təkcə yanmış ciyərimdir ona məhrəmlik edən,
Ondan özgə, bu yazıq Saibi kim yad eləyir?

* * *

Xoş o insanlara ki, bərkdə yandı bir-birinə,
İlk sözü, son sözü hər yerdə "can"dı bir-birinə.
Daşa vurmur birisi başqasının gövhərini,
Düşünüb fikrini, qiymət qoyandı bir-birinə.
Məclisə gəlsə biri, hörmət ilə yer verilər,
Çünki məclisdə hamı qədrdandı bir-birinə.
Tutar öz şeirlərin hər biri gül dəstəsitək,
Onların fikri təzə ərməğandı bir-birinə.
Bir hübabdır hərəsi, kövsəri almaz nəzərə,
Çünki tufanda olar bərk dayandı bir-birinə.
Bu cahan rənglərinin bircəsində gözləri var,
Lalənin qəlb dağıdır, bu əyandı bir-birinə.
Ehtiyac yoxdu, hərə gül yığa öz xonçasına,
Fikri gül, özlərisə gül yığandı bir-birinə
Fələyə əymədilər başlarını bir dəfə də,
Çün rəvan təbilə onlar həyandı bir-birinə,
Bu yazıq Saib ilə bir də Kəlimdən özgə,
O qələm əhli tamam mehribandı bir-birinə.

* * *

Mey qədrini ol zahidi-biganə nə bilsin,
Ömründə ələ almadı peymanə, nə bilsin.
Zahid ki, o təsbeh danəsindən də soyuqdur,



Duz dadamadı, mey içmədi məstanə, nə bilsin.
Mən Kəbədəyəm, ancaq o yardır ürəyimdə,
Divanə olan Kəbə, ya bütxanə, nə bilsin.
Fikr eylə ki, yüz meygədə vardır əlimizdə,
Ancaq biz içən meyləri peymanə nə bilsin.
Ol odlu baxışlar yaxar aşiqləri şamtək,
Ancaq nə çəkir şamdan o pərvanə, nə bilsin.
Hər kəsdə ki, Saib, sözə yox ülvi məhəbbət,
Çatmaz ona bu şeridəki məna, nə bilsin.

* * *

Sağalar, xəstə içə sözləri dərman yerinə,
Son nəfəsdə söz ilə dərman edin siz də mənə.
Möminin onda inan ki, duası oldu qəbul,
Qəribə qismət ola, bir də qayıtsın vətənə.
Gördüyün aləm onun hüsnünə bir pərdə olub,
Turidə yanmış odu kim salacaq pirəhənə?
Sanki şam atəşidir bu sinədən çəkdiyim ah,
Duraram, sübh yeli dəysə bu xəstə bədənə.
Haqqımız yoxdu, gülün şaxəsinə əl uzadaq,
Bir tikan versə, bizə bəsdi, bu bağ-bağça yenə.
Bu qədər şükr eləyən dostlar içində, Saib,
Bir badam gözlüsü yox, bal qata o sözlərinə.

* * *

Sözümü aldı, mənə dinməyə imkan verdi,
Sındırıb qıçlarımı, get, deyə fərman verdi.
Bulağın gözlərinə daş basıb aldı hasara,
Bu yanan köksümə o qumlu bir ümman verdi.
Aynaya bənzəri var zahir ilə batinimin,
Bəxt könül aynamı sildi, mənə əlvan verdi.
O günəş ki, nuruna qərq eləyib yer üzünü,
İşığından mənə bir zərrəcə ehsan verdi.
Bağlı gözlər onun ay hüsnünə heyransa əgər,
Mənə göz verdi, demək, baxmağa imkan verdi.
O əqiq ləblərini yar mənə verdikdə nişan,

Qəlbimi aldı əlimdən, mənə o, can verdi.
Qələmim özgə dil ilə sözümə verdi cavab,
Bu dili bilmədim, o öyrənib hardan, verdi?
Sadə insanların ardınca dolandım bir ömür,
Haqq mənim məqsədimi təkcə bu yoldan verdi.
Dodağımdan gülüşü aldı o, ancaq, Saib,
Əvəzində yarına ox kimi müjgan verdi.

* * *

Haçan bu xalq əvəzsiz bir iş görüb, xudaya?
Təzim edib əvvəlcə xudaya yox, tılaya.[1]
Paltar tikib geyər də Kəbədəki hərirdən,
Hörmət edir ürəkdən bu parçaya o guya.
Qarğalara həvəslə şəkər verən adamlar,
Qənaətlə verərlər sümükləri hümaya.
Xəzinənin üstündə ilan kimi yatanlar
Yarım həbbə[2] verəndə, əli əsir, gədaya.
Hər yerdə söz açılsa Məsiha iynəsindən,
Görərsən, iynədən tez cumar ahənrübaya,
Qəlbi qara olanın abrı, həyası olmaz,
Tökər üzün suyunu, düşər özü bəlaya.
Şərəfini qoruyan işıqlı göz təkindir,
Bəsirətsiz insanda nə abır var, nə həya.
Saib, çəkil bir küncə, ol qəlbinlə həmsöhbət,
Guşənişinlik ilə, bəlkə, düzəldi dünya.

* * *

O hünər sahibləri köçdü cahandan, qalmadı,
Sərbəsər boşdur tamam indi gülüstan, qalmadı.
İldırım tək yandı, söndü fikri aydınlar hamı,
Bir ovuc gül də desən, bu karivandan qalmadı.
Bircə qasid gəlmədi Kənana hətta Misridən,
Yəqubun ağlar gözündə yaş nədir, qan qalmadı.

[1] Tılа – qızıl.
[2] Həbbə – ən kiçik pul vahidi.



Nəğməkar quşlar vətəndən uçdular qürbət elə,
Bu yuvada onlara artıq bir imkan qalmadı.
Cənnətə bənzər bu gülşəndə fəqət bayquş ötər,
Çünki soldu gül-çiçək, başlandı tufan, qalmadı.
Çox qələmdanda suya döndü mürəkkəblər tamam,
Nə qələm dindi, nə də dillərdə dastan qalmadı.
Saibin də qələmi susdu qələmdanda daha,
Çün sözə qiymət qoyan vaqif bir insan qalmadı.

* * *

Tər axar, ol gözəlin gül yanağından tökülər,
Sanki hər damla bir ulduzdu, al-əlvan tökülər.
Məlhəm olmazsa əgər gül dodağın qəlbimizə,
Bir xəzan yarpağıtək ömrümüz asan tökülər.
Canda can qoymaz, inan, söhbəti naəhlilərin,
Gülə dəyməz tikana diqqət elə, qan tökülər.
Mövü kəssən, tökülər göz yaşı, mən də eləyəm,
Yardan açsan söz əgər, göz yaşım əlan tökülər.
Mənə nə etsə, edər dil yarası, bəllidi bu,
Yaxamı aç, sinəmin yarası ordan tökülər.
Könlünün aynası, Saib, silinər tozdan, bil,
Nə zaman ki, qələmindən təzə dastan tökülər.

* * *

Neylərəm mən o gözü, gərçi sənə baxmayacaq,
Bir dəfə baxmış idi, bir də yenə baxmayacaq.
Hər daşın altda bahar vaxtı təzə ot göyərər,
Fərhadın ahı o dağlarda çənə baxmayacaq.
Qonağın gəlməsini hər qapıda halqa deyər,
Hansı aşiqdi ki, qəlbi deyənə baxmayacaq.
Əbədi bağlamaq olmaz ürəyi bir qapıtək,
Eşq gəldi, o sənə, ya da mənə baxmayacaq.
İstərəm boş əl ilə, Saib, alam yarı ələ,
Qorxuram, yar ürəyimdən keçənə baxmayacq.

* * *

Görsə bu qamətini, göydə mələklər əyilər,
Yer üzün od bürüyər, gül üzünü açsan əgər.
Sənə tay mən bu cahanda hələ də görməmişəm,
Heyranam püstə kimi ağzına saldıqca nəzər.
Üzümü qara edən təkcə bu eşqin odumu?
Yaqutu tez-tez oda atsalar, axır göyərər.
Qədəhin xətlərinin məzmununu bilməyirəm,
Bilirəm ki, o qədəh kuzəyə hörmət bəslər.
Bilmirəm, od kimi cövlan eləyir, eyləməyir,
Bilirəm, minsə ata, nöqtə kimi gözdən itər.
Mövləvi şerinə, Saib, bu qəzəl oldu cavab,
Şəms Təbrizi eşitsə bu sözü, səcdə edər.

* * *

Hicr dərdindən əgər olsa ürək yara, yetər,
Döyünər qəlbinə vaxt, yar xəbəri yara yetər.
Qəlb evindən çəkilər birdəfəlik qəmlə kədər,
Dilbərin köynəyinin ətri edər çarə, yetər.
Sən də tərk eylə bağı, güllər açıb, ey bağban,
Bəlkə, gül vaxtı əlim bir daha dildara yetər.
Qəlbimin dərdlərinin dərmanıdır – yara çatım,
Kim keçər candan əgər, bil ki, o gülzara yetər.
Külə dönməkliyini sən özünə dərd eləmə,
Günəşin şöləsinin təsiri divara yetər.
Gecələr gözlərini yumma, günəş arzulasan,
Şəbnəmi gör, o, oyaq qalmaq ilə hara yetər.
Ruzi az-az ələ düşsə, daha ləzzətli olar,
Aza qayil olanın əlləri xalvara yetər.
Düyünə düşdü işin, silmə ürəkdən ümidi,
Kim ki, səy etsə, tufandan o, çəmənzara yetər.
Məst olan məstə nəzarət edə bilməz heç vaxt,
Fələyinsə zoru ancaq yenə hüşyara yetər.
Mövləvi rütbəsi, Saib, sənə ol vaxt yetişər,
O zaman Mövləvi də rütbeyi-Əttarə yetər.



* * *

Dünyanın dərdlərini çəkməliyik biz nə qədər?
Nə qədər gövhərimiz dünyada getmişdir hədər?
Sel gələn vaxta bir anlıq bulanır dərya da,
Ümmana bənzəyəcək, kim əzaba dözsə əgər.
Biz ki, Məcnun deyilik, hey dolanaq gözdən uzaq,
Hər kəs öz arzusunun mənzilinə etdi səfər.
Aşiqin göz yaşı bu körpə uşaqlar kimidir,
Bir həvəslə atılar qoynuna axşam, ya səhər.
Saqini, kuzəni arzu eləməz ömrü boyu
Kim ki, mey kollarının kölgəsini məskən edər.
Tər yarın gül yanağında quruyub xət-xət olub,
Sanki bir nəqqaş əliylə bəzənib ağ dəftər.
Aşiqin ruzisi eşqin qəmidir, qəm yeyəcək,
Sahilin qumları üstündə tapılmaz gövhər.
Dünyanın malını minnət ilə almaz Saib,
Ona nə verdisə, ya zəhməti verdi, ya hünər.

* * *

Yaz gəlib keçdi, daha gül o damaqda qalmadı,
Mey qədəhdə qalmadı, nur da çıraqda qalmadı.
İşrət ilə gün keçirənlər cahandan köçdülər,
O sərin arxdan səvay, bir kimsə bağda qalmadı.
Məclis əhli bu hala eylə pərişan oldular,
Nə alov, nə tüstü, hətta bir ocaq da qalmadı.
Zülfə sünbül, tellərə gül taxmağın keçdi dəmi,
Hətta qəlbi oxşayan tazə budaq da qalmadı.
Bu nə sel idi, axıb düzlərə dağdan tökülüb,
Sanki bu dünyada rahət bir bucaq da qalmadı.
Heç kəsin ardınca kaş ki, bəd nəzərlər baxmasın,
Bəd nəzərdən bu yara qəlbimdə yağ da qalmadı.
Göylərin altında bu dövran elə sıxmış bizi,
Bir yana tərpənməyə bizdə ayaq da qalmadı.
Şamtəki şölə saçar, Saib, əlində, bil, qələm,
Orda ki, pərvanə yandı, bir çıraq da qalmadı.

* * *

Dostları tərk etsə, ancaq bivəfa yar eyləyər,
Öncə peyman bağlayır, sonra o, inkar eyləyər.
Bizi tərk etmək ilə düşməni sən şad eylədin,
İnana bilməyirəm ki, bunu dildar eyləyər.
Aşiqə sən etdiyin bu zülmü heç kəs etməmiş,
Eyləməz məşuq bunu, etsə, sitəmkar eyləyər.
İllər ilə hüsnünü görmək üçün qəm çəkmişəm,
Bilmədim, bu iş məni axır bu cür zar eyləyər.
Gözlərin qəsd eylədi axırda Saib könlünə,
Eylə bir dərd yox gözüntək, xəlqi bimar eyləyər.

* * *

Gecələr bu sinəmi qəmli ürək tərk eləyər,
Ucalar ahım odu hər gecəni sübhə qədər.
Bədgüman könlüm azı yüz yeri əldən salacaq,
Bu ümid ilə ki, bəlkə, tuta səndən o, xəbər.
Ətəyi sanki həyat çeşməsidir qəmlilərin,
Bu səbəbdəndi ki, Məcnun dəxi səhraya gedər.
Getmərəm Kəbəyə mən, çünki bu eşqin xumarı
Gedəcək, meylə dolu meyxanadan getsən əgər.
Ey axan göz yaşı, bir söylə, nədir bunca şitab?
Yusif etməzdi bu surətlə, inan, Misrə səfər.
Vəslə mümkünmü silə qəlbdən hicran zəhərin?
Ləkəli şişəyə mey də eləməz əsla əsər.
İki dünyanı kəbab eylədi o gül yanağın,
Tüstüsü çıxmayan ev varmı bu aləmdə məgər?
Salsa Saib başıma bir də vətən kölgəsini,
Vəslə yetmiş kimi xoşbəxt olaram mən o səhər.

* * *

Küpənin ağzını aç, kuzəyə pambıq tıxama,
Cənnətin çeşməsitək ruh verəcək mey adama.
Pərdə ardında oturmaq yaraşarsa qadına,
Mərdə əskiklik olur pərdədə qalmaq amma.



Lalədən don geyinibdir o üfüqlər gözəli,
Yusifə bənzəri var ki, dönə zindanda şama.
Ay kimi almasa hər kim ki, Günəşdən nurunu,
Çox çətindir ki, yetişsin o bu əyyamda kama.
Başını çovqan[1] edə bilməyəsən dövran üçün,
Yoxdu bu dairədən çıxmağa imkan adama.
Ürəyin aynasına düşsə əliftək şəkilin,
İki aləmdə bu düzlüklə çatarsan məqama,
Arzu bir gövhərə bənzər ki, olur gözdə nihan,
Diqqət etsən özünə, onda düşərsən nizama.
Ağ buludlarla susan ləbdə xətər var, ayıq ol,
Sən güvənmə kuzəyə, mey dolu o lalə cama.
İstəsəz, siz bu susan Saibi də dindirəsiz,
Verin insaf ilə qiymət yazılan hər kəlama.

* * *

Bir qəlbi ovlamaqçün, gülüm, tədbir nə lazım?
Bu sadə işdən ötrü daha zəncir nə lazım?
Kimdir iki cahanda eşqi sala hicaba,
Nəqqaşa söyləyin ki, eşqə təsvir nə lazım?
Əqlə sığan deyildir mən tutduğum əməllər,
Əbəsdi röya yozmaq, mənə təbir nə lazım?
Günəş kəbab olubdur camalının odundan,
Kim kölgənə sığınsa, etmə əsir, nə lazım?
Görübsənmi kitabtək xəzəlləri tikilsin?
Aşiqləri azad et sən də bir-bir, nə lazım?
Saib bülbüllük etsə, edər Fərəhabadda,
Daha bu işdən ötrü ona Kəşmir nə lazım?

* * *

Aşiqi məhv eləmək, sanma ki, ehsan olacaq,
Baş qoyub eşqidə o, sahibi-meydan olacaq.
Kimsədən inciməyir, yolçu bunu yaxşı bilir,

[1] Çovqan – at üstündə xüsusi çomaqlar vasitəsi ilə top oyunu, müasir mənada: polo. Orta əsrlərdə cəng meydanında qalib gələnlər bu oyunda top əvəzinə, düşmən sərkərdəsinin kəsilmiş başından istifadə edirdilər (*Red.*).

Kəbəyə getsə, tikandan ayağı qan olacaq.
Qəlbi sınmışlara da eşq olub həsrətdə yaxın,
Eşqi kim bayraq edə, onda hər imkan olacaq.
Hansı bir zərrədi ki, olmaya eşqin əsəri,
Meydana girmə, başın zərbəyə qalxan olacaq.
Kim düz iş görməyi etmiş özünə indi peşə,
Sındırıb sanki qolun, axırı nalan olacaq.
Fitnəkar gözlərə gər düşsə Günəş şölələri,
Çəkilib kirpiyin altında o, pünhan olacaq.
Bəbəyə bənzədirik işgüzar insanları biz,
Çün bəbəktək o da hər ləhzədə cövlan olacaq.
Qorxudub xalqı qiyamət günü, qaçmış yuxu da,
Nə olar, bir-iki gün olsa o tufan olacaq.
Seyyidin şerinə, Saib, bu qəzəl oldu cavab,
Yazdı yarın şəkilin, qəlbə çək, asan olacaq.

* * *

Çəkilib bir yana nərgiz də baxar gözlərinə,
Gəldi gül fəsli, çələng qoy başına taç yerinə.
Eşqə düşmüş başa sən ayrı nəzərlə baxma,
Mey dolu küpdü havadar o başın hər birinə.
O dua eyləyən əllər çatacaq sərvətə, bil,
Bir çıraqtək uzanıblar fələyin göylərinə.
Hər kəsin ki, sinəsindən çıxar o odlu ahı,
İldırımtək tökülər mən yazığın xırməninə.
Xəstə ahunu şikar eyləməz heç vaxt səyyad,
Gözlərin etdi şikar qəlbimi, rəhm eylə mənə.
Qarışıb sinə dağımla ahımın şölələri,
Sanki arğac ilə boy ilmələnib bir-birinə.
Saib, ilham verən o gözdən uzaq düşməginən,
Dolan ahu baxışın dövrəsinə bir də yenə.

* * *

Dinməyə qoymayalar ortada sözlər yayanı,
Qələm hey ömrü boyu çəkmədi sözdən ziyanı?
Faydasız olsa səfər, yaxşıdı heç getməyəsən,



Misrə Kənanlı gedər, söylə görüm, xeyri hanı?
Kim ki, zülfündə qaranlıq gecəni sübh eləməz,
O, ürək şadlığına qərq edə bilməz cahanı.
Bir hədəf istəsə dövran seçə öz oxlarına,
Bu sinəm olsun onun oxlarının ilk nişanı.
Gəlməsin sevgi olan məclisə yadlar əsla,
Qismət olmaz hamıya, qaydadı, eşqin məkanı.
Nə deyib qönçəyə Saib yenə xəlvətdə, görən?
Saya salmır daha o, bağda bu gün gül yığanı.

* * *

Hanı bizdə elə can, zülfi-pərişana dözə,
Ümidim yoxdu, ürək bir də bu hicrana dözə.
Kim təkəbbürlülüyün sındıra bilmirsə əgər,
Aşiqəm, – söyləməyə, çıxmaya meydana, dözə.
Burda işrət meyi dönmüş yenə qəlbin qanına,
Süd üçün körpə gərək başlaya əfğana, dözə.
Bu cahanda nəyimiz vardı ki, həsrət də çəkək,
Təkcə arzum budu, qəlbim dara mərdanə dözə.
Qıvrılan telləri sakit kecədə titrər onun,
Aşiq istər o telə hər toxuna şanə, dözə.
Yusifə çatmaq əgər istəsə dünyada biri,
Yeyə qəlbin qanını, bir də ki, zindana dözə.
Kim çörək dərdini çəkmir, o yeyir burda çörək,
Kim çörək dərdi çəkirsə, o gərək yana, dözə.
Eşq sərgəştəliyi Saibə məxsus ki deyil,
De, hanı öylə gəmi, düşsə bu tufana, dözə?

* * *

Bu şərab kuzəsinin kölgəsi bəs etdi mənə,
Daha möhtac deyiləm özgəsinin kölgəsinə.
Hansı sınmışlarımı mən yenidən bərpa edim?
Qəlb sınıb, qol da sınıb, yox köməyi bir-birinə.
Sel gələn vaxtda xəbərsizləri birdən aparar,
Vəhdət əhli bu xətlərdən qorunar səylə yenə.
Hər zaman eşq cavanlarda daha həssas olur,
Tər budaq qorxuludur ki, toxuna gözlərinə.

Həmsəfər vədə xilaf çıxdı, fəqət mən yenə də,
Razılıq eyləmişəm ki, bu səfər xoşdu mənə.
Meyə az meyl elə, çox içsən, olar çox zərəri,
Qan damarda çox olan vaxtda zərərdir bədəndə.
Saibin fikrini həbs etməyə yox ixtiyarım,
Özgə aləmdə yetir arzuları çün yerinə.

* * *

Nə səbəbdəndi mənim qədrimi dövran bilməz?
Gövhərin qiymətini heç zaman ümman bilməz.
Üzdə aydın görünür, hər nə desən, ayna kimi,
Ürəyin yanmasa, bil, qədrini canan bilməz.
Harda divanə saçın tacə bərabər bilsə,
Orda şahla gədanın fərqini insan bilməz.
Pis ilə yaxşını ancaq düşünən baş ayırar,
Bu qəmə ağzıdı, ya camdı, o nadan bilməz.
Həkimin fikrini məşğul eləyir balla zəhər,
Qarpız ilə şəkərin fərqini sorsan, bilməz.
Qəlbə dərmandı yarın səf-səf olan müjganı,
Damarın dərdini neştər kimi, dərman bilməz.
Sədəfin qoynuna düşmüş su dönər gövhər olar,
Məqsədə çatmağı Saib bilər? Hardan? Bilməz!

* * *

O qədər sinədə oxlar qarışıb bir-birinə,
Hər nəfəs çəksən, inan, ox çıxacaq ah yerinə.
Ruzini gec tapırıq, tez veririk əldən onu,
Heç təəccüb eləməm, gec verilir ruzi mənə.
Hər kimin yoxsa o zülfün kimi tədbir tökəni,
Çox çətindir, o çata arzusuna, məqsədinə.
Bir baxışla bu dəli könlümü ram eyləmisən,
Ova bax, düşmüş o öz səyyadının zəncirinə.
Arzunun yollarını qət eləmək olmur asan,
Çox həvəs eyləyəni istəyi saldı çətinə.
Sonu yox kainatın, fikrini çəkmə, Saib,
Hünərin yoxsa, güvənmə oxuna, şəmşirinə.



* * *

Bu gözəl gün də keçər, dərd də keçər, qəm də keçər,
Həyatın şadlığı da, hətta bu matəm də keçər.
Belə rahat yuxu da, mənasız ömrün günü də,
Səni heyran eyləyən hər nə var aləmdə, keçər.
Nə veribdir sıxılan qəlbimizə boş səhra?
Ürəyin nalələri zildə, ya da bəmdə keçər.
Bil ki, ayla günəşi əks eləmir eşq seli,
Paranın hökmü dinarla yenə dirhəmdə keçər.
Bir adam yoxdu ki, yansın belə qəlbin halına,
Bir dinarçın o, başından, desən, hər dəmdə keçər.
Sənin o ləl ləbin əksini salmaz sulara,
Hökmüranlıq nədi ki, Hatəm ilə Cəm də keçər.
Bu necə gözdü ki, bir işvə ilə baxsa əgər,
Ahular qərq olar o işvəli aləmdə, keçər.
Saibin qəlbinə də təsir edər əhli-həsəd,
Aynaya dəysə nəfəs, tar da olar, nəm də keçər.

* * *

Sərvi o, işvəli rəftar ilə heyran eləyər,
O qədər nazla gəzər, kəkliyi yoldan eləyər.
Gözünün hökmünə bax ki, dinimi əldən alıb,
Nə evim var, nə şeyim ki, məni ondan eləyər.
Bu fənaya aparan yolla gedə bilməz hamı,
İsa öz iynəsini, sanma ki, pünhan eləyər.
Bizə nisbət nəyi artıqdı bu dövlətlilərin?
Var-yoxuyçun özünü gündə o, nalan eləyər.
Nəyə lazımdı şikayət, günahım əfv oluna,
Axı kol-kos aparar, dağ seli tüğyan eləyər.
Heyf, yüz heyf ola, Saib, bu gözəllərdə tamam
Eləsi yoxdu, sənin qəlbini heyran eləyə.

* * *

Siz uğursuz deməyin, sevgi səmərsiz olmaz,
Sevgi dünyası elə pakdı, səhərsiz olmaz.
Eşqimin sirri üçün nanə kimi əsmədəyəm,

Kuzədə mey çox olanda o, xətərsiz olmaz.
İndi bağlansa ürək bir də o nazlı gözələ,
Çıxaram mən şikara, sevgi hünərsiz olmaz.
Eşqidə qaydadı, susmaqla fikir bəlli olur,
Axı hər zərrə günəşdən ki, xəbərsiz olmaz.
Qumrunun nəğməsi ilə bəzənər sərv ağacı,
Eşqə yanmış sinənin ahı kəsərsiz olmaz.
Dərbədər aşiqi yad etmək özü şərtdəndir,
Bu səbəbdəndi, yanar şam da şərərsiz olmaz.
Gülə düşmüş nəzərindir səni qəflətdə qoyan,
Tikanı harda görüblər ki, zərərsiz olmaz.
Saib, aldanmaginan, getmə o ümman səsinə,
Burda susmuş sədəfin, bil ki, gövhərsiz olmaz.

* * *

Zahid yol alıb Kəbəyə, bax, başında dəstar,
Sərxoş nə bilir, yolundakı o daşdı, divar.
Öldün, bu ölümlə qurtarır canın sualdan,
Həşrin əzabın bu dünyada görübdü bimar?
Kim aşiq olub, o, eşqidən çəkib ziyanı,
İşdən sovudur hər aşiqi məhəbbət aşkar.
Canın üzülər bu canüzən diyarı gəzsən,
Üzdü canını söz üstə, bax, qələm də zinhar.
Baxdı gözünə, o ağciyər, nə qorxaq oldu?
Yoxsa yeriyər xar üstünə bu güllər aşkar,
Əmmamə gedərsə, qərq olar kədərdə vaiz,
Mənsuru düşün, o, haqqı heç edərmi inkar!
Saib, qəzəlində Mövləvi gözəl deyibdir:
Söz-sov dalına düşüb yenə bu nəfsi-biar.

* * *

Bəxti vardır o kəsin, dünyada ancaq qəmi var,
Dalıb öz aləminə, öz kədəri, matəmi var.
Sən ürək əhli deyilsən, bunu hardan biləsən,
Ürəyi duymaq üçün də hərənin dir cəmi var.
Bəllidir, biz yaşayan çöldə hələ az ev var,



Qəribə dağ ətəyi bəsdi, onun, de, kimi var?
Min müqəddəs can əgər qaşlarına qurban ola,
Yeri var, çünki onun qəlbə yatan görkəmi var.
Şadlığından qədəhin ağzı yumulmaz burda,
Meyxana torpağının üstə meyin şəbnəmi var.
Elə qərq olmusan öz fikrinə, öz aləminə,
Axı hardan biləsən, Saibin öz aləmi var.

* * *

Necə xoş olar, bu naləm ucalıb nəvaya çatsın,
Bu sınıq, bu xəstə qəlbim barı bir dəvaya çatsın.
O zaman sevincim artar, nəfəs allam öz kamımca,
Kədərim, qəmim və qüssəm toz olub həvaya çatsın.
Gecələr qərarım olmur, səhər intizar içində,
Elə qorxuram ki, könlüm yol azıb bəlaya çatsın.
O kəsə olar müəyyən, haradır bu mülki-vəhdət,
Oturub evində fikrən, o gözəl saraya çatsın.
Yarıda qalar mələklər, edə zahid ilə söhbət,
Nə kəsir ki, zahid əqli, ta gedib haraya çatsın?
Gözəlin o gül cəmalı bizi eyləmişdi heyran,
Yəqin heyrət eyləyər ki, belə bir səfaya çatsın.
Hər kəsin kəm olsa əqli, ona bir həyan gərəkdir,
Yolu düz gedər o kor ki, əli bir əsaya çatsın.
İki gün çəkir, cəfadan əlini çəkərsə dövran,
Hanı bir belə bəla ki, dediyim bəlaya çatsın.
Tapılarmı bir xəbərdar, necə odlanır bu Saib,
Sümüyüm nədir, şad ollam, iliyim hümaya çatsın.

* * *

Bu göyün altı yenə əhli-duayla doludur,
Kəbə Allah evidir, indi gədayla[1] doludur.
Xalq avamdır, çevirib mehraba öz arxasını,
Məmləkət mövc vurur, qiblənümayla doludur.
Bürüyüb göyləri heyrət, ya tərəddüd keçirir,

[1] Gəda – (burada) yoxsul, dilənçi.

Yerdə hər qətrə özü nuri-xudayla doludur.
Mənsuru dara çəkiblər, o başı, bu bədəni,
Yellənir darda odur, köynək havayla doludur.
Heyranam ki, necə olmuşdu tikansızdı o gül,
Axı bu sinə tamam xari-cəfayla doludur.
Sümüyü yemdi hüma quşlarına mən yazığın,
Nəzər et dörd yanıma, indi hümayla doludur.
Elə ki, mən çıxararsam başımı mavi sudan,
Görəcəksən, ətraf tiği-bəlayla doludur.
Saibin çarəsi yoxdur, o gərək təslim ola,
İş çatıbdır o yerə, dünya cəfayla doludur.

* * *

Elə ki, ahım odu hərdən ürəkdən ucalar,
Dağ döşündən, elə bil, yazda duman, çən ucalar.
Bir həyat mənbəyidir udduğumuz odlu nəfəs,
Bu gözəl sübh yeli hansı çəməndən ucalar?
Qəlbimin mehmanı olsa əgər ay üzlü pəri,
Demə, bu şölə nədir indi bədəndən ucalar?
Pərdəyi-qəflət əgər elmilə qalxmaz gözdən,
Doldurub bir-iki cam, nuş elə mey sən, ucalar.
Bədnəzərdən uzaq olsun o uzun silsilə saç,
Ona göz dəysə, neçə qəlbdə şivən ucalar.
Qadağan eyləməyin Saiə bu fəryadı da,
Qəlbi əldən gedənin naləsi birdən ucalar.

* * *

Sanma, Məcnun dağının qədrini fərzanə bilər,
Sor, Səməndər nədir? Bu od dolu peymanə bilər.
Ayrıla bilməz, əgər ov inana səyyadına,
O kamanlar məni də ovçuya həmxanə bilər.
Günaha batmış ürək eyləsə peşmanlıq əgər,
Bu günah sahibinin sirrini bütxanə bilər.
Saçların cazibədardır, ürəyindən xəbər al,
Çünki zəncirdə olan siqləti divanə bilər.
Nəğməkar quşlar uçub körpə budaqlarda yatar,



Balış üstə tökülən inciləri danə bilər.
Yoldakı daş toxunar körpələrin xatirinə,
Yoxsa səhra yolunu hər dəli-divanə bilər.
O qara baxtlı mənəm ki, yolumu tapmamışam,
Bacanın yollarını tüstütək, aya, nə bilər?
Kim ki, Saibtəki hər mənaya vaqifsə əgər,
Doğmadır gözdəki məna, ya da biganə, bilər.

* * *

Elə ki, gül dodağın meydən uzaq bir dəm olar,
Cam batar matəmə, hər yan, elə bil, matəm olar.
Fələk heç yerdə hənə qoymur igidlər əlinə,
Ol səbəbdən yarama isti qanım məlhəm olar.
Nərgizə bənzər o gözlər, mey ilə hüşyar olub,
Ahunun gözlərinə sürmə çəkilsə, ram olar.
Şimşəyi həbs eləmək, söylə, kimə mümkün olub?
Aşiqin sirrinə, ulduzdu, gecə məhrəm olar.
O pərişan saçının özgə cürə aləmi var,
Qorxuram, meh toxunar tellərinə, tez cəm olar.
Qaşının qurbanıyam, hökmüdarımdır o mənim,
Dözürəm səbr ilə, bir gün gələr, hökmü kəm olar.
Çəkdiyim ahdan axır gəldi fələklər də zara.
Dünya matəmsəradır, kim burada biqəm olar?
Qıçını yığ ətəyin altına sən, rahat otur,
Sən belə etsən əgər, onda, inan, aləm olar.
Can veribdir qayada Şirinə Fərhad hünəri,
Eşq əgər salsa nəzər, daş da dönüb adəm olar
Hər kərəm əhli bu çöldən belə asan keçməz,
Kim keçə bilsə əgər, Saib, o kəs hatəm olar.

* * *

Neyin o odlu səsi könlümü pərvanə edib,
Bəndi bənddən ayırıb, onları biganə edib.
Çıxarıb eşq başımdan daha xudbinliyimi,
Döndərib məskənimi, axırı bütxanə edib.
Şəkərin qiymətini sındıran o ləblər üçün,

Neyə bax, ağlayaraq fəryadı tifanə edib.
Elə ki, naz ilə durdun yuxudan, diqqət elə,
Müjganın ayinəni gör necə də şanə edib.
Kimi torpağa yıxarsan, səni torpağa çəkər,
Şam da pərvanə külündən özünə xanə edib.
Saib, eşq odlanaraq qəlbi yolundan çıxarır,
Qonağı danlama, ev sahibi etmiş, nə edib.

* * *

Zülfünün ətriylə şanə sərbəsər ənbər olar,
Gözlərində sürmələr dil-dil ötən dilbər olar.
Kim deyir, yoxdur qiyamət, hardadır, gəlsin yaxın,
Baxsa bu kirpiklərə, qəlbində min məhşər olar!
Şəbnəm həsrətdə qalıbdır gül cəmalı görməyə,
Şəbnəmə gül daməni atəş dolu bəstər olar.
Ud yanıbdır xamlığından, bir daha məhşər günü
Yansa, məhşər üstünə gəlmiş təzə məhşər olar.
Sinəyə vermiş sığal, nuri-həqiqət ordadır,
Qaydadır, gün doğmamış əvvəlcə göylər zər olar.
Dayə şəkkər də qata, təmi zəhərdir ki, zəhər,
Çünki laqeyd hər baxış qəlbimdə bir neştər olar.

* * *

Mey olan yerdə şüur tab eləyər?
Kim buluddan aya niqab eləyər?
Hansı yer batsa şəhidin qanına,
Lalə o torpağı sirab eləyər?
Günəşin aynasına daş vuralar,
Asiman, sanma, inqilab eləyər!
Saibin naləsinə kal oyanıb
Yar, yəqin ki, ona cəvab eləyər.

* * *

Söz qanadlı quş kimidir, o uçar, sinədə qalmaz,
Yusifi-Kənanı salsan sən əgər kəməndə, qalmaz!
Niyə hay salır o bülbül, niyə yırtır öz boğazın,



Gül əgər açılsa bir gün, o daha çəməndə qalmaz.
Kamala çatanda övlad onu saxlamaq nahaqdır,
Qan əgər dönərsə mişkə, o daha bədəndə qalmaz.
Qaça bilməz heç gözümdən, deyin o Süheylə, bilsin,
Hər əqiq ki, ad çıxartdı, o yəqin Yəməndə qalmaz.
Sədəfi edibdi heyran yenə gövhərin kəlamı,
Söz əgər şişərsə, gec-tez axır o, dəhəndə qalmaz.
Hamı öz hayındadır, bax, hamının gözü özündə,
Yusifinsə taleyindən danışıb dinən də qalmaz.
Sinəm od tutub yanırsa, nəfəsim də oddu, şəksiz,
Qara qarğa bağça-bağda, nə də ki, çəməndə qalmaz,
Qəribə danışdı Saib, qərib oldu hər kəlamı,
Hamıya qərib deməzlər, o əgər vətəndə qalmaz.

* * *

Məcnuna xoşdu o dəmlər, onu səhraya çəkər,
O, şəhər sevdasını bir yeni sevdaya çəkər.
Yüz tikansız gül açıb çöldə tikanlar, görürəm,
Kim tikan çəksə ayaqdan, varını zaya çəkər.
Qanlı yaşlar tökənin xırmanı hardan olacaq?
Yüz qədəh mey məni, bəlkə, yenə röyaya çəkər.
Çəkməz hər kölgə məni, mən də gedim kölgələnim,
Qucağımdan ucalan sərv boyun aya çəkər.
Saib hərçənd xarabati-muğandan çəkilib,
Şərabın şövqü məni bir də o dünyaya çəkər.

* * *

Bu təzə ayda da bir təzə xəbər gəlmədi, yox,
Nə zaman baş tutacaqdır bu səfər, gəlmədi, yox.
Açılan dan yeri də dinməyə tapmışdı macal,
Hərcayı qəlb gecə getdi, səhər gəlmədi, yox
Kəsilən meynə töküb göz yaşı, axır susdu,
Gözlərim bir qərara gəldi məgər? Gəlmədi, yox!
Dünyanı təng elədi başıma bu çərxi-fələk,
Sübhün o gül nəfəsindən də səmər gəlmədi, yox.

Səbəbi olmasa, qəlbdən dilə gəlməz bir söz,
Sahilə öz-özünə gəldi göhər? Gəlmədi, yox!
Elə zənn eyləmə, Saib, qələmin könlüm açar,
Neyşəkər bəndini kəsməklə şəkər gəlmədi, yox.

* * *

Hər səhər məstlik edər, yarım olar sonra xumar,
Yaxşı, ya pis ola, axır keçəcəkdir rüzgar.
Hər tərəfdən düzəsən dövrənə sən ayinəni,
Nə kədər yol tapacaq qəlbinə, bil ki, nə qubar.
Gəl ki, gül fəslidi, güllərlə öpüş, qol-boyun ol,
Getmə, ömrüm baharı, bilmərik, ha ötsə bahar.
Tellərin dərdini çəksən, dilinə alma onu,
Qəlbinin sirlərinə vaqif olar onda nigar.
Açılan dan yerinə bənzəsə də taleyimiz,
Yenə də hər günün öz qayğısı, öz həsrəti var.
Ümmanın gövhəri, Saib, qələmindən tökülür,
Belə bir söz buludu, söylə, cahan harda tapar.

* * *

Eylə ki, qəmzən oxu yara mehriban oldu,
Qəlbimin qanı coşub, sinədə cövlan oldu.
Çırpınan könlümə bax, bircə aramlıq bilməz,
Canfəşanlıq eləyir, bəlkə də, heyran oldu?
Bir libasım var, onu geymişəm üryan canıma,
Yusifin köynəyini geymərəm, o, qan oldu.
Leylini, zənn eləmə, qalmadı Qeysin halına,
Girib ahu donuna, çöldə nigəhban oldu.
Asimandan düşə bir damçı, sədəf gizlədəcək,
Saibin sözləri, gövhər kimi, ehsan oldu.

* * *

Ümidim vardı, o ay üzlü səfərdən qayıda,
Gözümün nuru mənim o şəmi-rövşən qayıda.
Açmışam qoynumu, açmış sinəsin sanki sədəf,



O əziz gövhərimi gözləyirəm mən, qayıda.
Olar İsa nəfəsindən də yəqin təsiri çox,
Aça yarım qapımı ork ilə, birdən qayıda.
Kağıza hicran odundan taxaram mən qanadı,
Qasidim namə alıb getdiyi yerdən qayıda.
Zülfünün seyri mənim əqlimi başdan almış,
Ümidim yox, başıma bir də o əslən qayıda.
Saibin ömrünün üstə təzədən ömr gələr,
O boyu sərvi-xuraman, üzü gülşən qayıda.

* * *

Dərdi yox qasidin, o, dərdimi hardan bilsin,
Yalnız Allah biləni, sanma ki, insan bilsin.
Səy edirsən ki, samantək ola ruhun yüngül,
Cazibə qüvvəsini, bəlkə, o, asan bilsin.
Hər kəsin vardısa Fərhad kimi mərdanəliyi,
Tişənin zərbəsinə başını qalxan bilsin.
Tikanı caynağına alsa əgər çöldə külək,
Ürəyim sədd çəkəcək yollara, tufan bilsin.
Gahi məst, gah yuxulu, gah da xumardır gözəlim,
Bu qədər işlə mənim dərdimi hardan bilsin?
Güllərin beş gün olur ömrü, bu gül üzlülərə,
Saib, aldanma ki, o, əhd, ya peyman bilsin.

* * *

Qəlbimi şad edən aləmdə bu sözlərdi mənim,
Sədəfəm, köksüm içi incidi, gövhərdi mənim.
Lələ o rəngi verən sadəcə boz torpaqdır,
Özgələrçin yanıram, varlığım əxtərdi mənim.
Gövhəri parladan o al günəşin çeşməsiyəm,
Rəngim od şöləsidir, ləl kimi əhmərdi mənim.
Sübh çağı ağ çiçəyə bənzəyən ağ əldi üfüq,
Əllərim dan yeritək, gör, necə də tərdi mənim.
Saibi etdi kabab nəğmələrin, ey bülbül,
Necə də nalələrin naləmə bənzərdi mənim.

* * *

Atəşi-eşqə yanan qaldı bu aləmdə? Hanı?
Bizlə həmsöhbət olan qaldı bu aləmdə? Hanı?
Yoxdu insanlıq edən, ya da ki, dostluq eləyən,
Ürəyi odlu cavan qaldı bu aləmdə? Hanı?
Kim polad tişə tutar əldə, olar tez narahat,
Şirini yada salan qaldı bu aləmdə? Hanı?
Hey tikandır ki, görürsən ilişib paltarıma,
Özgə yerlərdə tikan qaldı bu aləmdə? Hanı?
Düz bina möhkəm olar, əyri olan tez dağılar,
Əyri taclarda nişan qaldı bu aləmdə? Hanı?
Saib, Amul ilə getdi, nə qədər incə şeir.
İncidən şeir qoşan qaldı bu aləmdə? Hanı?

* * *

Sürünər torpaq ilə, zülfü yerə şanə çəkər,
Açar hərdən yaxasın, gərdənini yanə çəkər.
Teli alnında əsəndə ürəyim qana dönər,
Hərdən o, əllərini zülfi-pərişanə çəkər.
Eşq gülzarı təzə rəngə salanda xəzanı,
Bülbülün dağlarını, bil ki, gülüstanə çəkər.
Bizi lalə yanağın ətridi heyran eləyən,
Könlümü abi-həyat çaki-zənəxdanə çəkər.
Cənnətə düşsə də Saib, qala bilməz, ordan
Bu gözəllər yenidən zorla İsfahanə çəkər.

* * *

Gözüm qalan deyildir mülki-malında Hindin,
Toz-torpağa bələndim mən ki, yolunda Hindin.
Ey sürmələr diyarı,[1] fəryadıma haray ver,
Sümüyüm oldu sürmə qeylü qalında Hindin.
Gündüzlər yanmışam mən, tüstüm qalxmış səmaya,
Örtübdür həm ulduzun, həm hilalın da Hindin.

[1] Sürmələr diyarı – İsfahanın obrazlı adıdır.



Bəsdir qənaət etsəm öz qəlbimə bu yerdə,
Qoy gözlərim kor olsun, qalsa şalında Hindin.
Min gözlə ağlayırsa arxamca hindli dostlar,
Mən qala bilmərəm yox, heç mahalında Hindin.
Saib, sənin dilindən şəkər dadıb Hindistan,
Yoxdur belə şirinlik, hətta balında Hindin.

* * *

Qara zülf ay üzünə düşsə, onu ram eləyər,
O mənim gündüzümü döndərib axşam eləyər.
Yar təvazölə salam verməyə açmaz dilini,
Gözucu baxmaq ilə, bəlkə də, eyham eləyər?
Bəxti mey şişəsitək qoy uca olsun o yarın,
Şişəyə etsə itaət, yenə də cam eləyər.
Sərvsən, gör nə qədər quru yatır sayəndə,
Su ayağından öpər, hər yana iqdam eləyər.
Ümidim vardı, bu sinəmdəki eşqin yarasın
Zülfün ilə gözəsən, təkcə o, aram eləyər.
Şanətək yüz dili də olsa əgər aşiqinin,
Çox çətin, saçlarının vəsfini itmam eləyər.
Gecə mümkündü onun surəti çox sirri aça,
Kim ki, xatirdə onun surətini cəm eləyər.
Düşmüşəm sadəcə şeir aşiqitək dillərə mən,
Ümidim var, kömək etsə mənə, ilham eləyər.
Yaxanı açma ki, birdən görünər ağ bədənin,
Həsrətində yananın çoxları bayram eləyər.
Ad-sana çatmaq üçün cəhd eləyənlər çoxdur,
Saibə etsə kömək, təkcə Zəfər xan eləyər.

* * *

Nədi bir busə, yarın qəlbini sındırmaginan,
Araya söz sal, əzizim, aranı vurmaginan.
Çeşmənin zümzüməsin kim eşidə, axtaracaq,
Təşnəsən, çeşməni gəz, sən yarıda durmaginan.
Bu ki pünhan deyil, hər qara xala söz qoşular,
Aynaya baxmaq ilə sən özünü yormaginan.
Sən gülüstanda gülün atəşinə yanmamısan,

Bülbülün naləsinə gülmə, səsin qırmaginan.
Mənlə yarın davası çox uzun olmaz, Saib,
Çox uzatma sözü sən, aya, ilə vurmaginan.

* * *

Hər badə yəqin ol ləbi-xəndana yetişməz,
Hər təşnə ürək çün abi-heyvana yetişməz.
Ölmək nədi ki, döndərə bilsin bizi yoldan,
Tufan qopa hər dəryada, bu cana yetişməz.
Xoş günlərinin qeydinə qal, qədrini bil sən,
Misrin küləyi əssə də, Kənana yetişməz.
Aciz özüməm, zərrəcə yox təqsiri yarın,
İş ötmüş, əlim bir daha canana yetişməz.
Dilsiz gecənin qəlbinə ahım əsər eylər,
Əfsus, bu şikayətlərim heç yana yetişməz.
Bir busə umar qəlbi yanan yar dodağından?
Gövhərdəki su axsa, biyabana yetişməz.
Aşiqlər haçan xalqı edib eşqilə diltəng?
Məcnun harayı səhrada karvana yetişməz.
Bir ölkədə ki, qəlbi satıb pul ala insan,
Satsa üzüyün, xeyri Süleymana yetişməz.
Bayramda ürək şad olur, ancaq yenə, Saib,
Bu şadlıq, inan, hər duyan insana yetişməz.

* * *

Kim ki, nadanlıq edər, arifə bu bir qəm olar,
Dərdi-dünya çəkənin ömrü-günü matəm olar.
Təzə bir kimiya vardır hələ qoynumda mənim,
Tikanı alsam ələ, gül açar o, xürrəm[1] olar.
Kim sənə olsa əsir, dil yarası etməz əsər,
Qanı axmaz aşığın, yüz belə neştər cəm ola.
Hər gözəl misranı şair yazacaq başda, fəqət
Adəmiyyət qazanan kəslər elə adəm olar.
Hər sınıq qəlbə elə lalə özü dağ kimidir,
Saibin qəm dolu qəlbində sevinc bir dəm olar.

[1] Xürrəm – şad.



* * *

Kimə ki, tanrıdı eşq, dərdinə dərman neylər?
Odlanan sinəsinə çağlayanümman neylər?
Əriyib şəbnəmə dönməzsə bu bağda ürəyi,
Bilmirəm mən, günəşin təşnəsi insan neylər.
Bu nə dövrandı, çəyirtkə kimilər yol da kəsir,
Eşidə böylə halı, gör ki, Süleyman neylər!
Tikanın imkanı yoxdur, tuta aşiq ətəyin,
Bu gözəllərdən uzaq düşsə, bəs orman neylər?
Elmi alim yazar öz sinəsinin dəftərinə,
Əqldən kəm olan insanlara loğman neylər?
Saib, o varlı ki, yoxsul adama pay verdi,
Ürəyin, minnət ilə etsə əgər, qan neylər?

* * *

Sənə dünyada nə zər, bil, nə də zivər qalacaq,
Hər nəyin vardı, xəyal etmə, sərasər qalacaq.
Bu gülüstan ki, ona baxmaq ilə məğrur idin,
Bir ovuc torpaq ilə bir də ki, yellər qalacaq.
O şirin arzular ilə ürəyi şad elə sən,
Ancaq ümmid eləmə, arzuların tər qalacaq.
Qəlbini bağlama dünyaya, səfər vaxtı çatar,
Gedəcəksən əliboş, sanma, bu şeylər qalacaq.
Nə veribdirsə fələk, cümləsini verməlisən,
Səndən, ey xacə, fəqət qalsa, xeyir-şər qalacaq.
Eşq də tərk edəcək qəlbimizi birdəfəlik,
Elə bil, tərk edəcək dəryanı gövhər, qalacaq.
Başının altına kərpic qoyacaqlar o zaman,
Evdə yüz pərqu balınc, üzləri məxmər qalacaq.
Bu cahan ayinədir, əks eləyibdir bizi o,
Sanma ki, ayna ilə əks bərabər qalacaq.
Gördüyün lalələrin yoxdu bu gülşəndə dağı,
Ciyərin dağlanacaq, sənsiz o dilbər qalacaq.
İmkanın varsa əgər, uçmağa səy et, Saib,
Tufana düşsə də ömrün, sözün əzbər qalacaq.

* * *

Nə qədər dilbərimin zülfü pərişan olsun?
Nə qədər sinəm evi arzuma zindan olsun?
Gözümün yaşı quru səhranı gülzar elədi,
Məcnun harda gəzəcək, səhradan asan olsun?
Hansı divanədi, səhrada gəzər tufantək,
Niyə divara şəkil çəkməyin asan olsun?
Paltarın yoxsa, yapışmaz ətəyə çöldə tikan,
Ətəyi tutmaq üçün əldə bir imkan olsun.
Daşın altında bitən ot necə boy atsın axı,
Bar verər onda ümid ki, ona meydan olsun.
Saib, əsrin əzabın dərk edə bilməz hər adam,
Tikan hardan yapışar, gər adam üryan olsun.

* * *

Gəldi yenə gül fəsli, bu əyyam təzələndi,
Camın dodağın öp, yenə də cam təzələndi.
Açdı üzünü bağdakı güllər, yenə güldü,
Gülşəndə yenə başladı bayram, təzələndi.
Şəbnəm öpərək gül yanağından xumar oldu,
Bir busə üçün qəlbdə ilham təzələndi.
Qönçə açaraq ləblərini güldü nəsimə,
Kim gördü bunu, sinədəki kam təzələndi.
Mey içmək üçün bir də həvəsləndi ürəklər,
Gül açdı bütün bağ boyu badam, təzələndi.
Sanma ki, hamı seyrə çıxıb çöldə, çəməndə,
Gül üzlü bahar gəldi, həyət, dam təzələndi.
Bülbüllər üçün Kəbəyə döndü yenə güllər,
Kəbə təzələndi, demək, ehram təzələndi.
Dövran nə qədər göstərə sərt üz sənə, Saib,
Qəm çəkmə, bahardır, yenə ilham təzələndi.

* * *

Hind axşamıtək burda həyatım qara oldu,
Ömrüm şama döndü, əriyib min para oldu.
Fikr eylər idim, bəxtimə gün doğdu bu yerdə,



Gəldim, ürəyim həsrətə düşdü, yara oldu.
Şamtək burada göz yaşı tökdüm gecələr mən
O sübhi-vətəndən mənə, bəlkə, çara oldu.
Keçmə o gözəl üzdəki xaldan, nədi cənnət?
Adəm babatək sirlərimiz aşkara oldu.
Sındı qanadım, yarın üzü döndüsə məndən,
Hər nə elədimsə, yenə meylim yara oldu.
Mehrab özü də səcdə edər qaşın önündə,
Səcdə edilər qibləyə, qiblə hara oldu?
İbrət daşını atdı uşaqlar, mənə dəydi,
Sinəmdəki Məcnun dağı ondan sora oldu.
Saib, de, necə qardaşıma arxalanım mən,
Yusifin ipi qardaş əliylə para oldu.

* * *

Eşqin həvəsi tək yarı görməklə qutarmaz,
Bir güldü ki, o, bil, onu dərməklə qutarmaz.
Zülfündən uzun, bəlkə də, ondan gileyim var,
Ancaq bu nə susmaqla, nə dinməklə qutarmaz.
Əmsən əqiqi, təşnə ləbin sakit olar, bil,
Qəlbin atəşi min dava verməklə qutarmaz.
Lütf ilə əgər söndürəsən, şam kimi sönnəm,
Dil kəsmək ilə, ya ağız hörməklə qutarmaz.
Bu çərxi-fələk gərdişini saxlamaz heç vaxt,
Divanəliyim çölləri gəzməklə qutarmaz.
Saib, elə sıxmışdı məni indi zəmanə,
Qaçmaqla, ona ya sinə gərməklə qutarmaz.

* * *

Gördüm o yarı, gözümdən yuxumu aldı daha,
Yuxu gəlməz gözümə, yatmağım mahaldı daha.
Əfv edib təqsirimi, sonra da güldü üzümə,
O məni bir də xəcalət oduna saldı daha.
İsatək var nəfəsin xalqa əgər can verəsən,
Onda sən çəkmə nəfəs, susmağın kamaldı daha.
Bir tikə alsa dilənçi, yenə də istəyəcək,

Çün dilənmək onunçün adicə bir haldı daha.
Yaxşılıq etdi qarışqaya Süleyman da əgər,
Yaxşı bir ad qazanıb o, əbədi qaldı daha.
Saib, ud sən qəzəbi, üz-gözünü turşutma,
Bizə də indi həyatda bu ad ənam oldu daha...

* * *

Şəbnəm et qəlbini, yarın o gülüstanına ver,
Demirəm, göz yaşını çöhreyi-xəndanına ver.
Torpaq olmuş bədənə vəsl müyəssər ki deyil,
Əcələ vermə asan canını, cananına ver.
Sən bu meydanda əgər bir topa dönmüşsən axır,
Başını sevgilinin əmrinə, fərmanına ver.
Hasili yoxsa yerin bəhrə üçün, fikr eləmə,
Qaytar o torpağı sən sahibinə, xanına ver.
Kim ki, insaf ilə mizanla görür öz işini,
Nə alıb-satsan, onun insafı vicdanına ver.
Hər nə etmişsə bu aləm, çətin islah oluna,
Vaxtını məhv eləmə, özgənin imkanına ver.
Saibə faydası yoxmuş bu axan göz yaşının,
Naməni sən buludun tökdüyü ehsanına ver.

* * *

Bahar keçir, gözəlim, badə yoxdu, lalə götür,
Bu lalə qəlbi yetir mey ilə vüsala, götür.
Əgər tovuz qanadı zövq verməyirsə sənə,
Gəl onda qövsi-quzeh naminə piyalə götür.
Dönübdü ildırıma ömrümüz, ötüb-gedir hey,
Öpüb camın ləbini, indi dalbadala götür.
İçib bu al şərabı üz tutub gülüstana,
Bax orda lalədəki hüsnə, o camalə, götür.
Gülün ləçəkləri çox incədir, aman, bülbül,
Qanadın ilə qoru, düşmüş olsa jalə, götür.
Nəsihət etdi mənə bir zaman o piri-muğan,
Qəmin başından aşan vaxtı sən piyalə götür.
Nahaqdı Xızra həsəd çəkməyin sənin, Saib,
Kamınca ömr elə sən, cami-laməhalə götür.



* * *

Gəl, tamaşa elə sən bir də nobahara bu gün,
Gör bahar çıxdı necə burda aşikara bu gün.
Ağ çiçək ulduz olub indi düzülmüş budağa,
Özgə aləmdi, gəlib sanki bu gülzara bu gün.
Lalələr boy çəkərək, az qala, çatmış yəhərə,
Bəlkə, bir altını onlar salacaq tora bu gün?
Bürünüb indi çəmənlər təzə əlvan çiçəyə,
Hər ağac qoynun açıb, bənzəyər nigara bu gün.
Hava meyxoşdu, gülün tacı dolub jalə ilə,
Sanki mey içmiş hamı, oxşayır xumara bu gün.
Göylərin rəhməti enmiş yerə, hər yan göyərib,
Tökülüb gül ləçəyi bağdakı yollara bu gün.
Gündüz ilə gecənin zövqü bərabərdi daha,
Ruzigar gəlmiş özü ədl ilə qərara bu gün.
Ağ buludlar düzülüb göydə üzür cərgə ilə,
Onlar ağ yelkən olub sanki nobahara bu gün.
Dağ dolub lalə ilə, bənzəri var mey küpünə,
Al şərab çeşməsidir, baxsan əgər hara, bu gün.
Cənnəti dünyada görmək həvəsin varsa əgər,
Saib, aç sən yaxanı, çıx bu çəmənzara bu gün.

* * *

Aşiqi yarın xəyalı dərbədər eylər yenə,
Gözləri yolda qalan aşiqləri neylər yenə?
Zərrəcə əksilməyib o dilbərin məğrurluğu,
Minnətin çəksin onun yerlər yenə, göylər yenə.
Gəlsə məstanə, əlindən taqətin, səbrin gedər,
Baş əyib bu hüsnə dağlar, afərin söylər yenə.
Lalezara gəlsə şəbnəmlər, qalar heyran ona,
Bağrını hər qönçənin bir naz ilə teylər yenə.
Zülfünün məğrurluğu başdan aşıbdır indi də,
Öz yolundan Saibi ovsunlayıb əylər yenə.

* * *

Kimi bu gülxanaya çəkdilər, görən, yenə də?
Baxır ardınca onun bir dəfə görən yenə də.
Qırdı zəncirdən olan bəxyələri köhnə yaramı,

Bu təzə bəxyəni bəs qoydular nədən yenə də?
Hər kəsin məskəni dardırsa bu dünyada, bilir,
Nə əzablar verəcək qəbrdə məskən yenə də?
Ayağı olsa qabar, gəlməyəcək kimsə bura,
Boz tikanlar görünür yol boyu hərdən yenə də.
Əcəlin qorxusu yoxdur, bizi öldürdü həyat,
Xeyri yox, Saibi öldürsən əgər sən yenə də?

* * *

Kipriyə göz yaşını içməyi sən öyrətmə,
Buluda ağlamağı gəl yenidən öyrətmə.
Zülfünə söyləmə ah ilə hörülsün hər gün,
Gözümü dəryalara etmə vətən, öyrətmə.
Olma taqətsiz, amandır, üzülərsən bu qədər,
Sust olar onda, doğrudan da, bədən, öyrətmə.
Özünü dərk eləmək elmini zahid nə bilir?
Ağacı görmüsən heç nalə edən? Öyrətmə!
Gəzmə zahiddə duyub dərk eləmək nemətini,
Ölünü sən diriyə eyləmə tən, öyrətmə.
Tanrı həm işvə verib ol gözələ, həm də camal,
Saib, insaf eləməz, yüz də desən, öyrətmə.

* * *

Saçların da uzanar, ey nazlı canan, qəm yemə,
Xızrı da sirab edər ol abi-heyvan, qəm yemə.
İnsaf eylər yarına bir cüt qara gözlər yəqin,
İndi kafərdir, olar bir gün müsəlman, qəm yemə.
Rəhmisiz hüsnün qalar aşiqlərin də fikrinə,
Onda ədl ilə olar dünya gülüstan, qəm yemə.
Karivan yol alsa, getsin qönçə hüsnün kuyinə,
Dərdli qəlb azad olar, qalmaz o zindan, qəm yemə.
Yusifin olmaz Misirdə köynəyindən bir nişan,
Şad olar onda ürəkdən piri-Kənan, qəm yemə.
Töksə şəbnəm gül yanaqlar, hər tərəf ümman olar,
Teşnə qəlbi qərq edər dəryayi-ehsan, qəm yemə.
Tellərin ətrilə heyran eyləyəndə zülfünü,



İntəhasız dərdinə eylər o dərman, qəm yemə.
Atəşə bənzər üzü tutmuşdu zülfün haləsi,
Natəvan qəlbə olar atəş gülüstan, qəm yemə.
Atdı tufan dəryalardan sahilə yelkənləri,
Çox uzun çəkməz, susar, əlbəttə, tufan, qəm yemə,
Eşqi yüksək insana nə eyləyər dünya qəmi?
Yusifi-Kənan çıxar zindandan asan, qəm yemə.
Könlün istərsə yarın odlu ləbindən busələr,
Çox da müşkül iş deyil, Saib, sən ondan qəm yemə.

* * *

Zahid ki aşiqlərə verə bilməz nəsihət,
Bayquşu kim görübdür, gülə etsin məhəbbət.
Ariflər ilə dövran hər dəm küdurət eylər,
Necə ki, ayna ilə çirkin edər küdurət.
Çıxdıq isti-soyuqdan bu insafsız cahanda,
Yemək üçün həyatdan çəkmədik əsla minnət.
Zəmanənin əlindən dağlar yatır sinəmdə,
Bir şahanə təbim var, bəsdir mənə bu miknət.
Bu ülvi hümmətimlə daim səfərdəyəm mən,
Kimsəyə bağlı olmaz, kimdə olsa bu hümmət.
Bu gülşəndə boy atmış bir qönçə idi Saib,
Fəqət nə qayğı gördü bu bağda, nə inayət.

* * *

Məni tərk eyləməyib indi də divanəliyim,
Daş ilə oynayıram, bax, budu tifanəliyim.
Xəncər ilə qanımı tökməyə verməz o, riza,
Hələ çox tezdi ola qəlb evi meyxanəliyim.
Əhli-biganə qalan ömrü boyu, bil ki, mənəm,
Eşqə bəndə eləmişdir məni biganəliyim.
Bir ömür meyxanadan düşmüşəm indi uzağa,
Getməyib başdan hələ indi də məstanəliyim.
Yanmışam, badi-fəna güllərimi verdi yelə,
Şəmi görcək uçaram, yaddadı pərvanəliyim.
Xəyalım baş alaraq indi buludlardan ötür,

Xatirə düşdüyücən gəncliyim, əfsanəliyim.
Qocalıq əyyamıdır, yoxdu daha qol-qanadım,
Qəlbdən getməmiş ancaq hələ tifanəliyim.
Saib, aşmış su başımdan, daha dönmüş dənizə,
Suya həsrətdi yenə eşqidə viranəliyim.

* * *

Məcaz qanad olubdur həqiqətə hər zaman,
Bu qanadı qırarmı, deyin, ağıllı insan?
Kim Mahmudun qəlbini almaq istəsə ələ,
Qoy kəsməsin lütfünü heç bir zaman Ayazdan.
Gülgün mey ilə bir də ürək açan o avaz,
Biri günah selidir, biri şimşəkli tufan.
Yorğanına görə sən ayağını uzat ki,
Qənaətdən ömründə çəkməmiş heç kəs ziyan.
Qızılla gül şadlığı, beş gün də olsa, bəsdir,
Bəhərsizsə, nə fayda ömrün uzunluğundan!
Uzağa atmaq üçün dərdi-qəmi ürəkdən,
Sapand kimi həmişə öz məhvərində fırlan.
Sədi əgər yarandı Şirazın palçığından,
Saib doğdu Təbrizin müqəddəs torpağından.

* * *

Vəfasızdan vəfa? Yox, gözləmə əsla!
Tikandan sən səfa? Yox, gözləmə əsla!
Zəmanə pis keçəndə yüksələr nalən,
Sən hər neydən nəva? Yox, gözləmə əsla!
Bu xalqdan kim uzaq olsa, uzaq ondan,
Olardan aşina? Yox, gözləmə əsla!
Otur məclisdə sən göylər kimi dinməz,
Ürəksiz kəsdə məna? Yox, gözləmə əsla!
Danışmaq ya xətadır, ya səfa, şəksiz,
Susarkən bir xəta? Yox, gözləmə əsla!
Məhəbbət könlünün dərdin silər səssiz,
Sudan hər dəm səda? Yox, gözləmə əsla!
Edər cəzb aşiqi məşuqə hüsnüylə,

* * *

Hanı məşşatədə cürət, bəzəsin hüsnü-azadı,
Salıbdır boynuna xalxal, olubdur qumru ustadı.
Zəifdir, natəvandır, qoy məni silsin o, yaddaşdan,
Ağırlıq eyləyər, bəlkə, ona hər aşiqin adı.
Çətin ki, mən bu qürbətdə edim taqət bu hicrana,
Qəfəsdən eyləyər azad, eşitsə kim bu fəryadı.
Daraq çəkdikcə zülfündən töküldü mişk torpağa,
Deyərsən, sərvin ətrafı ətrdən sanki dəryadı.
Əgər Saib edərsə bağı-cənnətdə, inan, məskən,
Çıxarmaz, bircə an olsun, yadından mülki-Bağdadı.

* * *

İz salar gül yanağında o yanan inci təri,
Əriyər buz kimi, təqib eləsə yad nəzəri.
Nəfəsi sanki ətr səpmədədir ətrafa,
O qara tellərinin çoxdu şərabdan əsəri.
Lütf ilə sərv kimi geysə yaşıldan donunu,
Sanki firuzəyə tutmuşsan həqiqi qəməri.
Bir badam danəsinə bənzəri var gözlərinin,
Nə zaman yumsa gözün, artırar o dəm şəkəri.
Saibi salmış oda, yandırır hər an, ancaq
Sanki bu gizli yanan oddan onun yox xəbəri.

* * *

Sübh olub, saqi, götür kuzəni, dübarə gətir,
O günəş camını gözlər bu üzüqara, gətir.
Meynətək qoysam ayağım mən ədəbdən kənara,
Kəsginən bəndlərimi, bir də ixtiyara gətir.
Nə qədər ki, qanını tökməmiş o qanlı əcəl,
Onu tök cama özün, şəst ilə dildara gətir.
O kimin qəlbidi, olmuşdu yarın həmsəfəri?
Sən yenə aynanı al, bir də aynadara gətir
Yorulub dağ ətəyində dayanan kimdir elə?
Biqərarəm, mənə sən səbrin ilə çarə gətir.



Keç bu atəşdə yanan çöldən o şimşək sayağı,
Qəlbimin qanını tök su əvəzi, xara gətir.
Xızra nöqsan ki deyil, tapdı həyat çeşməsini,
Canını inci tərə qurban üçün yara gətir.
Məst o kəsdir ki, ola həm yaxa, həm başı açıq,
Sən meyə vermək üçün börkünü bazara gətir.
Bir cavabdır bu qəzəl Hafizə, Saib, o yazır:
Dəryadan zərrəni al, sən bu xakisara gətir.

* * *

Bir kəs ola ruh düşgünü, ondan həzər eylə,
Qəlbi yananın yanına etsən səfər, eylə.
Eşqin qəmini çəkməyən insan əziz olmaz,
Tozdan nə çıxar, arzu edirsən – göhər eylə.
Viranədə, axtarsan əgər, çoxdu xəzinə,
Xalqı diləsən, xalqa tərəf sən güzər eylə.
O nöqtə ki, sən örtülü huşyara deyibsən,
Nadan onu şərh eyləyəcək, sən nəzər eylə.
Saib, həyatın səxt keçir, etmə şikayət,
Kəklik kimi uç dağa-daşa, sən hünər eylə.

* * *

Al şərabtək dodağın oldu yenə cana ləziz,
Qəlbimi saldı fərağın daha əfğana ləziz.
Hara baxsamsa, yarın əksi göründü gözümə,
Necə söylərdi Züleyxa qara zindana ləziz.
Ox sözü qəlbimə bilsin nə qədər şirin olur,
Demişəm kipriyinin atdığı peygana ləziz.
Gərçi, Saib, bizə xoşdur yarın o əyri qaşı,
Xoşdur ondan da deyək səf-səf o müjgana ləziz.

* * *

Zənn eyləmə, əks eyləyər hər yer təranəni,
Münbit deyilsə torpaq əgər, səpmə danəni.
Göyçək deyilsə çöhrən əgər, ayna neyləsin?
Etmə şikayətinlə günahkar zəmanəni.

Gültək ikicə həftədi ömrün, hədər etmə,
Çox da bəzəmə zövq ilə sən aşiyanəni.
Dünyanın işi yas tutanın zülfünə bənzər,
Salma bu bəla girdabına sən də şanəni.
Şamtək gözünün yaşlarını tökmə hər axşam,
Bu ağlamağa tapmısan hardan bəhanəni?
Yüz xəznə ola, dərdimə qiymət ola bilməz,
Verməm zərə bu solmuş üzü – aşiqanəni.
Qəm karvanının zərrəsidir ömrüdə anlar
Qəmsiz görürəm mən vəli hər an bu xanəni.
Divarə acıqdan dilini surtsən əgər, sürt,
Tərk etməginən sən evini, bu viranəni.
Yusif kimi zindan ola hərgah ata yurdum,
Kim dərdi verib, aldı fələkdən xəzanəni.
Azadəliyi xoşdu, kasıb olsa da Saib,
Girməz qəfəsə, səpmə ora sən də danəni.

* * *

Yansan, elə yan ki, sən axırda hədər olma,
Məğrurluğunun həddini bil, o qədər olma.
Cam ilə Cəmin axır adı dillərə düşdü,
Gəldin cahana, sən də çalış bisəmər olma.
Bir qəlbi nahaq yıxma, tikə bilməsən hərgah,
Məlhəm ola bilmirsən əgər sən, zəhər olma.
Xoşdur olasan alnıaçıq xalq arasında,
Qəlbin daralarsa, sədəf olsan əgər, olma.
Qalxmırsa əgər ney kimi hərdəm göyə nalən,
Ariflərə yoxdur əsəri, neyşəkər olma.
Şər işdə meyin var günahı, saxla yadında,
Hər yerdə şərab içsən əgər, bixəbər olma.
Şəbnəm kimidir ömr, qonub güllərin üstə,
Saibə soyuq olsan, olar, dərbədər olma.

* * *

Götürdü sərpuşu küpdən o piri-badə satan,
Şərab nuruyla işıqlandı sanki köhnə dükan.
Məlamət eyləyənin sözlərin eşitməzdi,
O kəsləriyki, həvəslə şərab içərdi o an.
Nə qədər cübbə alıb, mey verərdi məstlərə o,
Görürdü insaf ilə öz işin o badə satan.
Hər əsən yel ilə sönməz bu çırağım, bilirəm,
Günəş Aya edər şölələrindən ehsan.
Yanmaz həşrin oduna dünyada o kəslər ki,
Həyatda xalqa o kəsdən yetişməyibdi ziyan.
Nə qədər coşdu ürəklər, boşaldı gözlər, gör,
İkicə həftə bizim dərya etməmiş tüğyan.
Danışıb dinməyənə söyləməyin laldı yəqin,
Bu sükutun özü də bir qılınca bənzər, inan.
Sükutla öt bu yeri, gör necə buludlar ötür,
Olma sel sən dərədə, düzdə eyləmə cövlan.
Edəcəkdir necə təsir sənə mey, bilməyirəm,
Saibi dinləmədin, qəlbini etdin nalan.

* * *

Gülşən olsa, bülbül ol, od olsa, dön pərvanəyə,
Harda bir tor qursalar, çevrilginən sən danəyə.
Küfr ilə imanı sən aşiq üçün bir pərdə bil,
Mehman ol ya Kəbəyə, ya getginən bütxanəyə.
Laübalı hüsnüdə harda görübsən nur ola?
Bülbül ol ya bağlara, ya bayquş ol viranəyə.
Özünü dərk eyləmək insanlığın ilk şərtidir,
Mərdi-meydan olmasan, arvad kimi gir xanəyə.
Hər gülə meyl eyləmə, sən dönmə şamın başına,
Tut qəriblərlə sən ülfət, həmdəm ol fərzanəyə.
Daş uşağın əllərində bənzəyər saxsı qaba,
Nəşə almaq istəsən sən, onda dön divanəyə.
Dünyanın dürdanəsi olmaq dilərsən gün kimi,
Paltar ol sən yoxsula, ya fərşə dön viranəyə.
Məstlərin söhbətləri təkrar olunmaz sübhlər,
Məclisi tərk eyləsən, döndün, demək, peymanəyə.
Biz şikayət etmərik, sürmə içib susduq tamam,
Ey mürüvvətsiz fələk, cövr etsən, et biganəyə.

Xızr rəhm etməklə, bil, çox-çox ürək almış ələ,
Sən də körpə qəlblərə dön şirniyə, əfsanəyə.
Hər məhəbbətsiz könül ömrün keçirmişdir hədər,
Sən baharda bülbül ol, payızda dön dürdanəyə.
İstəsən tale şamı, Saib, alışsın, sən də gəl,
Hər yanan qəlbi görəndə bir də dön mərdanəyə.

* * *

Gah onu cübbədə, gah mən kəfəndə axtarıram,
O girib qəlbimə, mən pirəhəndə axtarıram.
Qəlbimi, fikrimi min söhbət ilə məşğul edir,
Mən çıraqla gəzirəm, əncüməndə axtarıram.
O pəri üzlü düşüb qürbətə, yad eldə gəzir,
Düşmüşəm dağa-daşa mən vətəndə axtarıram.
Bir cavabdır bu qəzəl dostlara, Saib, dedilər,
Kimiyadır o göhər, indi mən də axtarıram.

* * *

Tikanlı çöldə görünmə, nə də pərişan ol,
Nə nəfsə boynunu əy sən, nə sonra peşman ol.
Tutulma dərya kimi, bəxtidən gileylənmə,
Nə də yanıq yeritək hər dəqiqə giryan ol.
Götürmə minnəti hər kəsdən, əymə qamətini,
Bəhərsiz ol, vəli o sərvtək nümayan ol.
İki-üç həftədi ömrün çəməndə güllərtək,
Alışma sirr oduna, misli-meypərəstan ol.
Bu xalqın eybini paltarla örtə bilməzsən,
Çalış bu xalq arasında eybsiz bir insan ol.
Nə vaxtdı Xızr kimi düşmüsən bu çöllərə sən,
Özün öz halını gör, sən də mərdi-meydan ol.
Evində rəiyyət, inan, sanki bir şahənşahdır,
Hər işdə həddini bil, öz yerində sultan ol.
Bu gül bağında ötənlər içində, Saib, sən
Çalış ki, Hafizi-Şirazitək qəzəlxan ol.



* * *

Tərifə sığmayacaq qaməti-rənası onun,
Torpağa dəymədədir zülfünün halqası onun.
Göyləri lalə kimi qırmızı rəngə bürüyür,
Görünür aytək üfüqdən haçan aynası onun.
O keçən yollara kim düşsə əgər kölgə kimi,
Əbədi ömr verir kölgəyə sevdası onun.
Məni də cənnətə, Saib, o olub sövq eləyən,
Yoxsa olmazdı mənə, bəlkə də, mənası onun.

* * *

Sən ora basma qədəm, harda qənaət var əgər,
Quşa dən, çöp kimi sən hər yuvaya qonma hədər.
Güllərin ətrinə dön ki, gəzəsən eldən-ələ,
Olma çöllərdə bitən ot ki, təpiklə əzələr.
Bülbülün söhbətinə sən qulaq as, ey qönçə,
Qorxma bağbandan, əgər tutsa da, tutsun o, xəbər.
Bir nəsihət eləyim, yaxşı qulaq ver ona sən,
Az danış, çox qulaq as, etsən əməl, xeyri dəyər.
Yara kim mən edəcək, Saib, əgər cilvələnə,
Günəşə, yanma, deyə əmr edən olmuşmu məgər?!

* * *

Qəlbimi ovladı o çeşmi-xumarın, nə edim?
Qaraquş caynağıdı kirpiyi yarın, nə edim?
Elə məğrurdu, dönüb baxmayır öz kölgəsinə,
Kölgəyəm, pozmayır ancaq o, qərarın, nə edim?
Baxıram hüsnünə, bir tifltək artır marağım,
Hər xalı cəzb eləyir sanki şikarın, nə edim?
Qamaşar gözləri, kim baxsa o güntək üzünə,
Aynada əksi qalar aynaüzarın, nə edim?
Hüsnünün tərifinə söz də kifayət eləməz,
Saibi heyran edən indi o yarın, nə edim?

* * *

İztirabi-qəlbdən zülfün səhər, şam oynayar,
Vəhşi quş düşsə tora, olmaz o, aram, aynayar.
Gün düşəndə güzgüyə, güzgüdə oynar şölələr,
Sadədillikdəndi, bil, mərmətrək əndam aynayar.
Hər ürəkdə şövq var, rəqqasəlik lazım deyil,
Diqqət et, neysiz-qavalsız dövri-əyyam oynayar.
Bir xəta etdin əgər aqil önündə, qorxma sən,
Nadana olma əsir, eylər səni xəm, oynayar.
Xamlığından xumda mey sakit oturmaz, hey coşar,
Sufiyi-kamil susar, oynarsa, bil, xam oynayar.
Durmayır dövri-fələkdə rəqsimiz bir an belə,
Vaxt xoş olsa, alar mütrüblər ilham, oynayar.
Eşqidə gücsüzlərə imdad edər güclü külək,
Sahilə çırpan dəniz ta olmasa ram, oynayar.
Zərrələr gündən alıb qüvvət cahanda, rəqs edər,
Odlu çöhrəndən alan olsa əgər kam, oynayar.
Ol günəş üzlü hara üz tutsa, xoş tale olar,
O bədəndə zərrələr başdan-başa tam oynayar.
Şam girər, fanusda şaldan pərdə örtər başına,
Şam da ulduzlar kimi oynarsa, axşam oynayar.
Sel gələr, Saib, harayla oynayar daşlar belə,
Hər ürəkdə şövq var, eylər o, bayram, oynayar.

* * *

Məhəbbətin ürəyə verdi bu qubarı əvəz,
O torpağın yerinə göndərib baharı əvəz.
Kimin ki, vardı bəsirət gözü, bu məclisdə
Ayıqlıq aləminə eylədi xumarı əvəz.
Məni talan eləyən qafil, hey deyir, zər ver!
Görür ki, müflisəm, etmir yenə qərarı əvəz.
Bu könlümün barını bir kəsə əta etdim,
İnan ki, razıyam, hərgah verərsə yarı əvəz.
Yəqin behiştə gedər mey satan bu insafla,
Edə kitabımı bir kuzə meylə barı əvəz.
Fəqət bu eşq ilə şad eyləyir özün Saib,
Edərmi ömrü məgər dünyanın bu varı əvəz?



* * *

Odlu göz yaşı töküb, ağlama hər yanda, çıraq,
Salacaq atəşə pərvanəni pünhanda çıraq.
Ürəyi daş olana göz yaşı təsir eləməz,
Necə pərvanə dözər, ağlasa meydanda çıraq?
Görünər yazda çəmənlikdə bitən lalə kimi,
Şəhidin qəbrinin üstündə yanan anda çıraq.
Gecəni sübhə kimi qalsa da pərvanə oyaq,
Ulduz-ulduz axıdır göz yaşı eyvanda çıraq.
Hər qara baxtlıya, idrakı verər, versə nicat,
Eyləmir öz dibinə şöləni ehsan da çıraq.
Çırağın düşmənidir sübh yeli əvvəl gündən,
Öldürür qəsd ilə pərvanəni tufanda çıraq.
Saibin dərdini gördükdə tökür göz yaşını,
Boğulur tökdüyü yaşdan olan ümmanda çıraq.

* * *

Güllər hamısı bir yana, canan da bir yana,
Mişk ətri bir yana, saçı reyhan da bir yana.
Yüz ox atarsa yarım əgər, yoxdu qorxusu,
Düşdü ürəyim bir yana, peykan da bir yana.
Musa əlində oldu əsa kirpiyin sənin,
Yoxsa düşübdü qəmzən oxu canda bir yana?
Kəbə evinə diqqət ilə eylə sən nəzər,
Şahini-ədl bir yana, Mizan da bir yana.
Saib, bu təşnə ləblərə sən etmə imtina,
Bir gün axar bu gördüyün ümman da bir yana.

* * *

Aşiqi-sərgəştənin ormandan olmaz qorxusu,
Dalğanın, yağmur nədir, leysandan olmaz qorxusu.
Bir günahı yoxdusa, qəlbində min-min arzular,
Yusifin, böhtan nədir, zindandan olmaz qorxusu.
Şam zəifdir, yel əsəndə qorxudan tir-tir əsər,
Şöləyə, yellər nədir, tufandan olmaz qorxusu.

Yelkəni varsa, gəmi azad gəzər dəryaları,
Dalğanın, dərya nədir, ümmandan olmaz qorxusu.
Adicə bir işdi ölmək, qorxusu yox arifin,
Ulduzun şahlar verən fərmandan olmaz qorxusu.
Eşqə sədd çəkmək çətindir, əql min tədbir çəkə,
Sellərə, məcra nədir, meydandan olmaz qorxusu.
Sərvi də badi-xəzan salmış gözəllikdən fəqət,
Saib, azad insanın dövrandan olmaz qorxusu.

* * *

Nə qədər dövr edəcək Kəbəni pərvanə könül?
Nə qədər daş vuracaq sinəmə divanə könül?
Dərbədər oldu qalıb yollar arasında daha,
Kəbədən oldu yenə azimi-bütxanə könül.
Sahilin yox xəbəri, dərya təlatüm keçirir,
Zahid hardan biləcək, döndü necə qana könül.
Eşqə düşmüşsən əgər, dərdə-qəmə batma nahaq,
Alışıb pak olacaq eşqə yana-yana könül.
Harda məğlub olur o, orda tapır, bil ki, zəfər,
Hər məlamət daşını etmədə peymanə könül.
Bir uşaq şıltaq ola, dayəni candan eləyər,
Nadan ol kəsdi, çəkir hər işi dərmana, könül.
Doldurub kuzəyə Saib ürəyin al qanını,
Məstə ancaq dolu bir kasədi meyxanə, könül.

* * *

Sən elə güldün, gülüstanda gəlib həycana gül,
Sanki od qalxıb başından, az qalıb ki, yana gül.
Göy açılmazsa, günəş də çöhrəsin etməz əyan,
Gör qəfəsdə nə edibdir bülbüli-nalana gül.
Qoymuş odla su arasında yazıq bülbülləri,
Şəbnəmin göz yaşları, xəndan olan məstana gül.
Ey ölüm tufanı, sən badi-xəzanla birgə gəl,
Bülbülün yox taqəti, dözsün daha hicrana, gül.
Saib, o əyyam olaydı kaş ki, bağban bağladı
Mənlə qönçə damənin, çəkdi məni pünhana gül.



* * *

Öylə məstəm, bilmirəm, orman, ya mənzil hardadır,
Səhra hardan başlanır, ya qumlu sahil hardadır.
Kim görür, heyrət edir, vallah, mənim əhvalıma,
Öz halından mən kimi vardırmı qafil, hardadır?
Öylə yöndəmsiz şikaram, kimsə dönməz dövrəmə,
Bilmirəm, səyyadım harda, indi qatil hardadır.
Göyləri məmur ediblər ki, mənə təlim verə,
Qoy gəlib öyrətsin, o ustadi-kamil hardadır?
Qəlbimin sirrindən özgə sirrə vaqif olmadım,
Mən açan müşkül də varmı? Bəs o müşkül hardadır?
Bir seləm, axsam, tökülləm könlümün dəryasına,
Ondan özgə varmıdır bir ayrı mənzil, hardadır?
Sehrilər icad edər, Saib, əlində hər qələm,
Varmı bir kəs, eləyə bu sehri batil, hardadır?

* * *

Xamlığımdan deyil, atəşdə yanıb dad elərəm,
Belə bir nemət üçün dostları da yad elərəm.
Olsa insafı əgər zərrəcə xublar şahının,
Hər nə divan eləsə, sanma ki, fəryad elərəm.
Rəhm görsəm, mən onun istəyinə ram olaram,
Yoxsa vəhşətlə onun qəlbini bərbad elərəm.
Əgər azad olam hər dərdi-bəladan, o zaman
Neçə min bəndəni azadlıq ilə şad elərəm.
Elə divanəyəm, hərgah bir ovuc zər tapsam,
Verərəm mollaya, şagirdləri azad elərəm.
Gül budağında qonub bülbül oxur həsrətlə,
Yetişən olsa dada, mən də elə dad elərəm.
Qorxuram, Şirini qəmləndirərəm, Saib, mən,
Yoxsa Fərhad ilə bir mərəkə icad elərəm.

* * *

Əqlimi aldı başımdan yenə gül rəngli şərab,
Başımı söykəmişəm kuzəyə mən xanəxarab.
Ümidin əsdi yeli, dəryada açdım yelkən,

Bağladım taleyimi dalğalara, sanki hübab.
Bir ömür qünçə kimi qəm yemişəm dünyada,
Kim dönüb aşiqə mey vermiş ola bunca əzab?
Təzə at minmiş uşaqtək gəzirəm meydanda,
Öz gözümdə səvaram, əslinə baxsan, bu sərab.
Gövhərin qiyməti əskilməz, əgər düşsə yerə,
İki gün düşmək ilə mən niyə oldum, de, xarab?
Saibi məst eləyib mey kimi yarın dodağı,
Dərdsizin heç yadına düşməyir ömründə şərab.

* * *

Heyrət əhli olmuşam, indi pərişan deyiləm,
Mən fanusdan çıxmışam, şamtəki heyran deyiləm.
Hökmüdari-eşq əlində tutduğu bir qəməyəm,
Buludam, fəsli-bahar olsa da, giryan deyiləm.
Abi-heyvan nədi, İskəndər olub heyran ona?
Suyu asan taparam, zülmətə mehman deyiləm.
İldırımlar başının üstünü almış xalqın,
Mən pərişanam əgər, bil ki, peşiman deyiləm.
Şəbnəməm, hümmət ilə qalxıram ancaq yerdən,
Mənə əmr etsə Günəş, göylərə qalxan deyiləm,
Özgənin süfrəsinə dünyada göz dikməmişəm,
Hilala bənzəmirəm, qaili-ehsan deyiləm.
Vermişəm eşqə könül, təkcə ümidim onadır,
Hər iki aləm əlimdən çıxa, üryan deyiləm.
Göz yaşım hümmət ilə lələ dönər, Saib, inan,
Sədəfə oxşamıram, talibi-leysan deyiləm.

* * *

Mən necə eyləməyim dərdlərimi xalqa bəyan,
Saralan rəngim özü dərdlərimi eylər əyan.
Qalmadı heç nə mənə dünyada qəmdən özgə,
Min nəfər düşmənə qarşı bir oxum vardı, inan.
Təşnənin qəlbinə bu çöldə sərabdan nə xeyir,
Mən xəcalət çəkirəm öz qonağımdan, nə yalan.
Ölmərəm mən o, atan oxla, buna var inamım,
Ümidim vardı sümükdən yenə qüvvət ala can.



Hər kəsin var günahı, rəhmətə yoxdur ümidi,
Mənə rəhm eyləyəcəkdir, bilirəm, o canan.
Bu qədər naz ilə məhv etmə məni, bəsdi, gülüm,
Qapına səcdə üçün vardı hələ məndə güman.
Saib istər bu şoranlıqda təzə güllər əkə,
Var ümidim, bu təzə güllərə olsun bağban.

* * *

Sübh gözün açmamış idi hələ, bidar olduq,
Gecə məst idi qara dəryada, hüşyar olduq.
Şikara gəlmiş idik biz bu müqəddəs məkana,
O qara xalını gördükdə giriftar olduq.
Bixəbərlik özü bir cənnət imiş, bilməmişik,
Heyf, səd heyf ki, biz sonra xəbərdar olduq.
Biz baxan ayinənin silməyə yox ehtiyacı,
Çünki o aynasifət dilbərə biz yar olduq.
Şah Qasım Ənvara biz bəndəlik etdik, Saib,
İnamım var, bu səbəbdəndi sənətkar olduq.

* * *

Düşmərəm qiymətdən, olmazsa xiridarım yenə,
Bir günəştək parlaram, ensəm də torpaq üstünə.
Sanki məstdir, nəğməmin ritmilə oynar asiman,
Qorxuram, nəğməm kəsilsə, dünyaya matəm enə.
Aşiqi-sadiq olub hər qeydidən oldum uzaq,
İstərəm, ömrüm boyu xidmət edəm, yarım, sənə.
Göy kimi yoxdur qərarım, mən özümdən bixəbər,
Harda endim, harda qalxdım, aşikar olmaz mənə.
Vaqifəm, ümmid bağımda bir çiçək açmaz mənim,
Arxa su gəlməz, dəyirmanım dönər bir kövşənə.
Ruzi üçün əl-ayaq çalsam da, olmaz hasili,
Bir çiçək də düşməyib göz dikdiyim o gülşənə.

* * *

Qaşının üstünə qonmuş qara xal qorxuludur,
Elə bil, ulduz axıbdır, bu xəyal qorxuludur.
O iki zülfü dönübdür iki əfi ilana,

Çalacaq, zənn edirəm, məndə bu hal qorxuludur.
Düşmən acizsə, onu yıxmaq igidlik ki, deyil,
Elə fikr etmə, mənə cəngü cidal qorxuludur.
Səbrsiz olsa biri, qarşısın almaq olmaz,
Dəryadan qorxmayıram, seldə zaval qorxuludur.
Mən cəhənnəm odunu almaram heç eynimə də,
Tək qiyamətdə mənə olsa macal, qorxuludur.
Zamanın selləri, Saib, səni qaldırmasa da,
Yarının gül yanağında o zülal qorxuludur.

* * *

Yarımın eşqi ilə sinəmi qan eyləmişəm,
Qoca vaxtı özümü təzə cavan eyləmişəm.
Mən kimi kimsə gözəllər dilini bilməyəcək,
Bu marallarla gəzib, qəddi kaman eyləmişəm.
Ehtiyat eyləyərək, yar yenə ayrı oturub,
Mənsə ömrüm boyu bu yolda ziyan eyləmişəm.
Şam kimi başımın üstündə yanan ruhumdur,
Eşqimi ayla günəşdən də nihan eyləmişəm.
Çatmadım kamıma, Saib, bunu aləm ki, bilir,
Xalq üçün eyləmişəm hər nə, inan, eyləmişəm.

* * *

Bu məhəbbət söhbətin mən bu cahana salmışam,
Səbkimin ülgüc dilin çünki əyana salmışam.
Eşq bir ülvi kəlam olmuşldu dillərdə fəqət,
Mən ona can vermişəm, doğma məkana salmışam.
Fikirlər cövlan edərdi, tapmaz idi bir hədəf,
Bu pərişan oxları mən bir nişana salmışam.
Çör-çöp altında itib batmışdı çün söz çeşməsi,
Mən ona yol açmışam, indi asana salmışam.
Böylə bir səs salmışdı Misrə Yusif hüsnüdə,
Saib, indi bu səsi mən İsfahana salmışam.



* * *

Bir qədəh gülgün şərab qəlbdən silir dərdi-qəmi,
Mey dolu kəştim ola, yelkən edəm səcaddəmi.
İstəməm mən nobaharın rəngbərəng paltarların,
Sərvtək azadəyəm, seyr eylərəm bu aləmi.
Yoxdu o dostlar ki, dırnaqla tutardı hər şeyi,
Kirpiyimlə deşmişəm mən daşları bir ox kimi.
Bəllənir öz zati ilə, şübhə yoxdur, hər adam,
Necə ki, zahir olur aynada şəxsin görkəmi.
Acizəm, Saib, açam qəlbə yığılmış sirləri,
Gərçi mən açdım fələklər açmamış çox mübhəmi.

* * *

Hanı bəxt, meyxanada bir mən olam, bir yar ola,
Dözərəm ağrısına sinədə gər dağlar ola.
Dönərəm mən hübaba, mey dolu camda üzərəm,
Sevdiyim nəğmə ola, bir də sədəfli tar ola.
Əql ilə etsəm əməl, dağ kimi qəm etməz əsər,
Kim ağır olsa, ona yüngül olar hər kar ola.
Gözü yollarda qalıb gül kimi o incə yarın,
Hümmətim yoxdu mənim, qismətim ancaq xar ola.
Üzünə baxmağa cürət eləməm, bəllidi bu,
Evdə də üzbəüzüm istəyirəm divar ola.
Saibi danlamayın, şerə belə aşiq olub,
Şeirdən yaxşı nə vardır, bir adam bikar ola?

* * *

Bircə qurtum da belə qabda şərabım yoxdur,
Başımın altda kuzəm yoxdusa, xabım yoxdur.
Öpməsəm mən qədəhin odlu dodağından əgər,
Sanki boş bir şişəyəm, sinədə tabım yoxdur.
Bilirəm özgələri badə çəkir gündüzlər,
O mənəm ki, gecə də meylə hesabım yoxdur.
Sel gəlir, qorxunu qoy qəsri olanlar çəksin,
Bir komam yoxdu, demək, eldən əzabım yoxdur.
Sən mənim gözlərimi fanusa döndərdin əcəb,

Şam kimi yanmadayam, varmı savabım? Yoxdur.
Səbəbi yoxsa da, bu dairədə məhv oluram,
Soruram, ancaq hələ doğru cavabım yoxdur.
Əyməyib kimsəyə Saib başını əvvəldən,
Hər nəyim vardı, budur, çünki niqabım yoxdur.

* * *

Bircə köynək olmuşam mən yenə də yardan uzaq,
İndi gör mən hardayam, eh, düşmüşəm hardan uzaq?
Necə də rahat yatırdım yarımın qoynunda mən,
Qalmışam çevrə çəkən dövrəmə pərgardan uzaq.
Uzağa getməkdən özgə, qalmamış bir tədbirim,
Kim yaxın olsa hara, sonra olur ordan uzaq.
Gülmədi tərk eyləyən vaxt cənnəti Adəm baba,
Mən də qəmgin olmaram, düşsəm o dildardan uzaq.
Sanki Fərhad tişəsiydi, hiss edirdi tüklərim,
Düşmüş idim mən Şirindən, yoxsa gülzardan uzaq?
Gah sevincdən gülmüşəm, gah ağladım öz dərdimə,
Həm nigarımdan uzaq qaldım, həm əğyardan uzaq.
Mümkün olmaz, bir daha qismət ola ömri-əbəd,
Vermişəm əldən əbəs, mən düşmüşəm vardan uzaq.
Heyrətimdən donmuşam, həsrət lal etmişdir məni,
Qalmışam xeyli zamandır gül dodaqlardan uzaq.
Yəqub öz göz yaşların qatmış mənim göz yaşıma,
O öz oğlundan uzaq, mən Yusifi-zardan uzaq.
Gözlərimdən quş kimi uçmuş yuxum, həsrətdəyəm,
Eylə ki, tale salıb o lalə-rüxsardan uzaq.
Mən yarı axtarmağa sərf eylədim öz ömrümü,
Bağban idim, qalmışam bağdan uzaq, bardan uzaq.
Varmı, Saib, bir nəfər ondan xəbər versin mənə?
Xeyli vaxtdır düşmüşəm qəlbdən, bu qəmxardan uzaq.

* * *

Dodağın ləlini mən dadmadım, həsrət getdim,
Yenə də şad olasan, etmədin ülfət, getdim.
Yusifin nəğməsi məndən ayırıb indi məni,



Qafilə zəngi məni eylədi dəvət, getdim.
Hüsnünün şövqü ilə sel kimi uçdum, uçdum,
Elədim kol-kosa yollar boyu hiddət, getdim.
Gövhərə bənzəri var hər ayağımda qabarın,
Onları qanlı tikan eylədi qarət, getdim.
Xamlığımdan ciyərim yandı yenə, döndü uda,
Hay salıb eyləmədim heç də şikayət, getdim.
Özgə cür nal vurulub başmağıma indi mənim,
Dünyanı tərk elədim, mən daha rahət getdim.
İki dünya mətahından mənə bəxş eylədilər,
Ömr əta eyləmədi bir mənə fürsət, getdim.
Mən də bir qönçə idim, dəydisə İsa nəfəsi,
Məndəki hümmətə bax, açmadım, əlbət, getdim.
Ciyərin yanğısına dözmədi çün Tur həvəsim,
Sinəmin dağı mənə bəsdi, nəhayət, getdim.
Saib, öz gövhərini çəkdisə hər kəs bazara,
Mən də qoydum bu cahan əhlinə sərvət, getdim.

* * *

Köksüm dağını taci-Firiduna vermərəm,
Üryan tənimi ətləsi-gərduna vermərəm.
Eşqin odunu qəlbdə pünhanda saxlaram,
Məcnunluğumu daməni-hamuna vermərəm.
Dərdin dağıyla səngi-məlamət yetər mənə,
Təsdiq üçün bu dağımı Məcnuna vermərəm.
Seydim[1] təcəlli nuru kimi ram olan deyil,
Mən bir daha bu qəlbimi gərduna vermərəm.
Meytək tökərsə dəryaları camıma fələk,
Bir gövhər öz sinəmdən o məftuna vermərəm.
Zərdən əzizdi zər kimi olmuş üzüm mənə,
Bu guşəni mən dövləti-Qaruna vermərəm.
Məstlikdən elə qorxu düşüb canıma, inan,
Mən ləblərimi, bil, ləbi-gülguna vermərəm.

[1] Seyd – ov, şikar.

Hər nə qoyulsa mey xumuna, zülmüdür ona,
Bir cam şərabı mən ki, Filatuna[1] verməərəm.
Saib qəba geyib, içə pünhanda qanını,
Nə rəngimi, nə sirrimi biruna vermərəm.

* * *

Xudapərəst edibsən, saqi, bu meypərəsti?
Nə bütpərəst idim mən, nə xudpərəst, bu bəsdi.
Hər yolda yolkəsən var, orda aman da olmaz,
Nə qədr tövbə etdim, şeytan yolumu kəsdi.
Təzə zünnara döndü indi mənə bu ehram,
Onun eşqi sinəmdən kəsilməyən nəfəsdi.
Saqi, mənim şərabım şişəmdə coşdu-daşdı,
O necə nəğmələrdi, mütribdə bu nə səsdi?
Külәkləri ovcumda tutardım məst olanda,
Xumaram, indi aləm mənimdi, bu həvəsdi?
Sən bu xarabat içrə mənə məni tanıtdır,
Dağla dərəyə bənzət ayıqla burda məsti.
Böyüklər məclisində sıxılmışam nədənsə,
Həmsöhbətim ürəkdir, özgə nə var əbəsdi.
O tellərin həsrətin, Saib, qovdun ürəkdən,
Sözə könül bağladın, yarın eşitdi küsdü.

* * *

Şadlığı biz bu cahanda biqəmə tapşırmışıq,
Gül yanağın öpməyi çün şəbnəmə tapşırmışıq.
Dünyanın dərdi-qəmin biz çəkməyə razı olub,
Ürəyin Kəbəsini, bil, zəmzəmə tapşırmışıq.
Çoxu dünyada əsər qoydu özündən yadigar,
Hər nə iş olsa, onu biz aləmə tapşırmışıq.
Biz ki bir daş qoymadıq dünyada bir daş üstünə,
Bilmirəm, bəs işləri axır kimə tapşırmışıq?
İki aləm tapşıranda ixtiyarın bizlərə,
Bixəbərlikdən onu biz mübhəmə tapşırmışıq.

[1] Filatun – Əflatun.



Köz tutar sinəmdəki dağlar, yaralar bəllidir,
Çünki məlhəm qoymağı biz mərhəmə tapşırmışıq.
Cənnətin hər nemətindən biz daha əl çəkmişik,
Buğdasın da, meyvəsin də Adəmə tapşırmışıq.
Gərdişin çərxi dolanmaz şadlığa, Saib, inan,
Lap nahaqdır, ömrü biz bu matəmə tapşırmışıq.

* * *

Kaş yenə İsfahana dönməyə imkanım ola,
Vəsfinə Zindərudun bir yeni dastanım ola.
O Çaharbağını bir də dolanım İsfahanın,
Haranı sevsə könül, orda aşiyanım ola.
Gözümə nur verə mişk ətri verən sürmələri,
Zindərud nəhrinə göz yaşlarım ehsanım ola.
Şirinin bazarına Xosrov aparmış Şəkəri,
İsfahan mülkünü Şəbdizilə cövlanım ola.
Abi-heyvan içənin yoxdu cavanmərdliyi, bil,
İstəməm, Xızr kimi ömri-cavidanım ola.
Qürbəti tərk edərək üz qoyuram mən vətənə,
Daşı qumtək əzərəm, bəlkə, o, mərcanım ola.
Döndü məxmər yatağa kirpik o yorğun gözümə,
İstəməm rahat ikən yer üzü zindanım ola.
Su ilə atəşi mən bir-birinə dost elədim,
Söylə, bəs sənlə necə əhdilə peymanım ola?
Saibin təbi-xudadı elə tüğyan edir,
İstərəm, Turda yanan atəşi heyranım ola!

* * *

Qələmimdən bu qədər incə fikirlər tökülər,
Nə üçün qəlbimə hökm etmədədir bəs bu kədər?
Məni bu çərxi-fələk torpağa salmış nə üçün?
Çün günəştək yayılan kəlmələrim tüğyan edər.
İncə söz üstə yanıb şam kimi hər gün əridim,
Bu halımdan, bilirəm, çəkməyəcək kimsə xətər.
Olmuşam gül budağı, sınmamaq üçün nə edim?
Rəngbərəng mənalara sinəmi etdim dəftər.

Üz qoyub üstümə gəlməkdə hamı dörd yandan,
Aynaya bənzəyirəm? Bəlkə də, var başqa xəbər?
Bu yaşıl günbəzin altında yerim yoxdu, qaçam,
Bir də bu oxlar əlindən qurtaran oldu məgər?
Gəl bu səhrada məni tapginan, ey müşgül açan,
Müşgülüm yüz min olar, mümkün edib saysan əgər.
İncə təb şairi saysan nə qədərdir, Saib?
Yoxdur onlarda fəqət məndə olan şerü hünər!

* * *

Nə zaman mey dolu camda görürəm çöhrəmi mən,
Sanıram, gördüm o gül üstə düşən şəbnəmi mən.
Yaxamı verməriəm əsla təbibin əllərinə,
Əlacım meydi, içim, ta unudum hər qəmi mən.
Kuzənin ağzı mənimçün qızaran dan yeridir,
Ayı da zənn edirəm dəryaya düşmüş gəmi mən.
Sənə şadlıq gətirən bağça mənə qəm gətirir,
Qəm ilə qarşıladım çünki gələn hər dəmi mən.
Ay səməndimdi mənim, göylər isə göy çəmənim,
Fələyin çərxi kimi dövr edirəm aləmi mən.
Bu cahanda nə ümidlə yaşasın Saibi, de,
Gözlərində görürəm sönmüş ümidlə şəmi mən.

* * *

Naz ilə yar yeriyəndə o çinar qaməti gör,
Yaxşı bax, sən bu təbiət yaradan neməti gör.
Gəl bu torpaqda sən o rəqs eləyən zərrəyə bax,
Günəşin cilvələnən şöləsini, tələti gör.
Yoxdusa səndə bəsirət gözü həqqi görəsən,
Haqq üçün ayna tutan çöhrədəki hikməti gör.
Parlayar dövləti-bəxtim, ola qəmxarın huma,
Bayquşun alnına haqdan tökülən şəfqəti gör.
O pərişan yuxunu bük bu ipəkdən yatağa,
Başını yastığa qoy sən, yuxuda cənnəti gör.
Pərdədə olsa belə, dost üzünü görmək olar,
Saib, ol əhli-bəsirət, o əziz surəti gör.



* * *

Alimin söylədiyi söz məgər əfsanə olar?
Mey nə vaxt hasil olar, azimi-meyxanə olar.
Adı sözlər qələmimdən kağız üstə tökülər,
Təzə paltar geyinər, sanma ki, biganə olar.
Qəlbimin arzusunu məhv elədin eşqin ilə,
Bil ki, xırman dolusu toxma səbəb danə olar.
Şam geyər fanusu öz əyninə paltar yerinə,
Yenə şəmə alışan eşqilə pərvanə olar.
Bircə söz çıxsa yarın qönçə dodağından əgər,
O sözün qiyməti sərrafına dürdanə olar.
Qələmim gəzsə kağız üstə, inan, nərə çəkər,
Mərd əlində qələmin nərəsi mərdanə olar.
Sinəmin dağı bütün aləmi salmışdır oda,
Hansı kaşanə yana, axırı viranə olar.
Nəfsini qoyma aşa həddini, çün körpə uşaq
Çıxsa evdən, itəcək, hər yer ona xanə olar.
Sanma asan çıxarar qəvvas o dür danəsini,
Saibin sinəsi hər gövhər üçün şanə olar.

* * *

Ey gül, bu həqiqət evinə bir nəzər eylə,
Bir cam mey içib, özgə cahana güzər eylə.
Bilsin göhərin qiymətini o sədəf hardan?
Sən zərlərini zərgərə göstər, hünər eylə.
Kök olsa iki şaxəli, tufan qıra bilməz,
Qəlbim üzülür, bağla telindən kəmər eylə.
Bir zərrəcə qan vardı fəqət qəlbin evində,
Sanki o, qabardır, deş onu, birtəhər eylə.
Ey çərx, günəşi, bəsdi, belə parlaq edibsən!
Bəsdir, bu cigər dağlamağından həzər eylə.
Arif olan insan dəyişər gövhəri dürlə,
Can nəqdin əvəz istəsə canan əgər, eylə.
Saib, qəzəli Valehə yazdım, o demişdir:
Dağı sinədə, qanı ürəkdə bəhər eylə.

* * *

Ey könül, qışlı, payızlı ruzigarı fikr elə,
Huşyar ol, tez solar ömrün baharı, fikr elə.
Bir nəsim əssə, həyatın dəftərin alt-üst edər,
Bu vərəqtək çevrilən leylü naharı[1] fikr elə.
Ay əgir öz başını, on dörd gecə olsun tamam,
Mey içib məst olmağın vardır, xumarı fikr elə.
Harda ki, şər iş olur, ordan çəkil tez bir yana,
Özgə fikrin olmasın, sən bu qərarı fikr elə.
Zəhrdir, bir də peşimanlıq cahanın işləri,
Xabi-rahət vaxtı boynunda o marı fikr elə.
Asimantək bu cahanın da yox əvvəl-axırı,
Bu həyat da böylədir, yox etibarı, fikr elə.
Gül əgər gülşəndə gülsə, axır o, gülab olar,
Gülmə hər yerdə, gülüm, gülsən də, barı fikr elə.
Dam kənarında məgər rahat yatarmı bir nəfər,
Etibarsızdan umar kim etibarı, fikr elə.
Xəncər ağır oldumu, ağır olar mütləq yaran,
Düşməni qüvvətlisə, məzlum şikarı fikr elə.
Mığmığa axşam uçar, insan qanıyla bəslənər,
İndi sən zahid kimi mərdümazarı fikr elə.
Nəbzdən duymaq olur hər insanın əhvalını,
Üzməyə yox cürətin, onda kənarı fikr elə.
Kainat tüstüylə tozdan yoğrulub, Saib, düşün,
Tüstünü fikr etmə tək, həm də qübarı[2] fikr elə.

* * *

Dost olub düşmənim ilə, onu şən şad eləmə,
Bu yanan qəlbimi, kim söylədi, abad eləmə?
Kafər olmuş gözünə umma ənamlar verələr,
İmanı qarət üçün zülfünü azad eləmə.
Baxginan Allaha, bağla yaxanın düyməsini,
Ucalar ulduzadək ah ilə fəryad, eləmə.

[1] Leylü nahar – gecə və gündüz.
[2] Qübar – toz.



İmtahan etmək üçün sadəcə duz səp yarama,
İnləsəm, asma qulaq, sən mənə imdad eləmə.
Saibin sinəsiariflər üçün məbəd olub,
Sən müsəlmansan əgər, Kəbəni bərbad eləmə.

* * *

Dünyanın qəlbi əsər, eylə ki, qəlbim döyünər,
Birləşər yerlə səma, sakit olub dursam əgər.
Torpağın bağrın iki böldü, göyərdi toxumum,
Min şikayət eləsə, göylərə heç etməz əsər.
Ömrümüz keçdi avamlıqla, ümid var, bəlkə,
O qiyamət günəşindən bizə də çatdı səmər.
Fələyin çərxinin altında hanı meydanımız,
Qaçaraq dərdin əlindən qutara bircə nəfər?!
Min dəfə zəng kimi çırpıla qəlbim gecələr,
De, nədir faydası, heç kimsəyə çatmazsa xəbər?!
Gül kimi üzlərə baxmaq mənə olmuşdu həyat,
Gözlərim gül bağına şeh kimi göz yaşı tökər.
Sübh çağı əllərini qaldıraraq eylə dua,
Nəfəsimlə açılır dünyada bu nurlu səhər.
Nə qədər fitnəsi var köhnə şərabın küpünün?
O da girmişdi mənim qoynuma, rahatlıq edər.
O qədər zəhr töküb sinəmə dövran, Saib,
*Gər ilan sancsa məni, tab eləməz zəhrə, ölər.*

* * *

Ya ürəklə ələ al camı, meyə hörmət elə,
Ya da heç meyxanaya basma qədəm, möhlət elə.
Mey iki həftə bu küpdə qalacaq məhbustək,
Sən də get dövran ilə baş-başa qoy, söhbət elə.
Aşiqin sözləri gül yarpağıtək nazik olar,
Qulaq asmaq nədi, dərk eyləməyə adət elə.
Sənə öz zərli camın versə səhər vaxtı Günəş,
Qanlı göz yaşıdı, iç sən o camı, cürət elə.
Dünyanın yoxdu qərarı, sənə çox bənzəri var,

Sakit ol, təmkin ilə sən onu da rahət elə.
Qəzəbin vaxtsız ölümdür, bunu bir yaxşı düşün,
Bu qəzəb zəhrini sən öz-özünə qismət elə.
Bülbül axşam oxuyanda yetişir vəsli-gülə,
Gecələr ötməyi bülbül kimi sən adət elə.
Mişkidən bilmək olar ki, bu Xütən ahusudur,
Yun libasda dolanan kəslər ilə ülfət elə.
Elə ki, dan sökülər, saqi alar camın ələ,
Tərk elə dünya qəmin, Saib ilə işrət elə.

* * *

Göz yaşım sinəmin üstündə dönübdür qabara,
Qəlbimin hər düyünü taleyimi etdi qara.
Mən ki, o meyli dodaqdan daha düşdüm uzağa,
Meyxana azlıq edir ölkədə məntək xumara.
Küləyin tuğyanı sanki qanada döndü, mənim
Yolumun üstə bitən neştərə bənzər o xara.
Ahımın dağı əsər qoymadı torpaqda mənim,
Bəlkə, təskinlik olardı o da mən biqərara.
Qurumuş dən də belə torpağın altda cücərər,
Mənəm, o sərv qədim kölgəsini salsa hara.
Sellərin həmləsi qorxutmayır əsla məni heç,
Düzlüyüm dörd yanımı səhrada almış hasara.
Saib, ömrün bulağı axmadı bir qayda ilə,
Fərqi yox, ya payıza döndü zaman, ya bahara.

* * *

Saçların qapqaradırsa, gərək hüşyar olasan,
Sübh işıqlandımı göy, onda da bidar olasan.
Ömrün sözlə keçib, bircə işin yoxdu hələ,
Nə qədər söz verəsən, axırı bikar olasan?
Gözlərin gül yanağında şehə tor oldu sənin,
O şəfəq üzlü yara valehi-qəmxar olasan.
Çıxma sən meyxanadan, cübbəni, əmmaməni at,
O zaman çıx ki, daha çıxmağa naçar olasan.



Yıxılar, qalxmaz o kəs ki, qala can qayğısına,
Belə bir haldan uzaq, bəlkə də, bizar olasan.
Açaraq ağzını gültək, həyata gülmə nahaq,
Qorx, zamanın toruna sən də giriftar olasan.
Sən də Saibtək uzun söhbətə meydan versən,
Qorxuram söz uzana, axırı zinhar olasan.

* * *

Dönəcək qəlbi qana, hər kəs ola yarın əgər,
İstəməz İsanı da, kim ola bimarın əgər.
Yarı canım var, onu verrəm o gül ləblərinə,
Bircə an gəlsə dilə tutiyi-köftarın əgər.
Taleyin üstə olubdur nə qədər söhbətimiz,
Taleyim yoxdu mənim, olmasa gülzarın əgər.
Qorxuram sərv qıra qumruların gül qanadın,
Sərvlər tir-tir əsər, səxt ola rəftarın əgər.
Bu təzə səbkini Saib necə icad eləyib?
Gül kimi ətr saçır, duysalar əşarın əgər.

* * *

Bir saf ürək qoyubmu qala ruzigar, hanı?
Aləm tamam qaranlıq olub, aynadır, hanı?
Hər yerdə təmiz insan ola, bil, şikəstdir o,
Dövran edibmi bir nəfəri bəxtiyar, hanı?
Səhra kimi hərisdi qana burda çoxları,
Varmı bu yerdə bir nəfərə etibar, hanı?
Sonsuz üfüqləri nəfəsi-ətrə qərq edən
Bu çöldə çoxlu ahu olardı şikar, hanı?
Bir mərdi-meydan istəyirəm, odlu xəncəri
Etsin bütün bu əyriləri tarimar, hanı?
Bitməz hərisliyi fələyin, insaf umma sən,
Bax, süfrəsində nemətі-əlvanı var, hanı?
Pərvanə çatdı vəslinə şəmin, aram olub,
Dərya kimi coşar ürəyim, bəs kənar hanı?
Ey eşqə rəhbərəm, – deyə hər yerdə dəm vuran,

Göstər, sinən olubmu sənin dağidar, hanı?
Şamtək var isə qəlbimdə sönməz atəşin,
Göz yaşı töküb ağlamadın aşikar, hanı?
Saib, bu şeri həzrəti-Əttara yaz cavab,
Atəşdə inləyən o dili-biqərar hanı?

* * *

Düşmə sən ardına o sərvi-rəvanın, getmə,
Oğrun-oğrun bax ona, vardı ziyanın, getmə.
Ürəyin yanmır əgər, onda çəkil küncə, otur,
Gər bu eşq məbədinə yoxsa gümanın, getmə.
Dalğanın zərbəsinə tab gətirə bilməz hübab,
Yoxdu bu dəryada bir darüləmanın, getmə.
Qönçətək yu üzünü gözlərinin yaşı ilə,
Sonra da əyləş, əgər varsa divanın, getmə.
Əğyarın mehrinə aldanma, həqiqət deyil o,
Fürsəti olsa, tökər xəlvəti qanın, getmə.
Yaxşı bil, gücsuz olan kəslərə haqq arxa durar,
Düşmə ardınca önündən o qaçanın, getmə.
Vəqf olan yerdə görübsənmi könüllər şad ola?
Xeyiri yoxdu sən üçün, bil, o məkanın, getmə.
Yeri var, Saib əgər batsa qana, çox demişəm,
Fitnəkardır o gözəl, heyfidi canın, getmə.

* * *

Sən ey könül, dövran ilə biganə ol, biganə ol,
Sev qəlbdən ol dilbəri, həmxanə ol, həmxanə ol.
Bəsdir daha yatdın, aman, göz aç, bu qəflətdən oyan,
Bir az da sən eşqinlə yan, əfsanə ol, əfsanə ol.
Şəmin ayağında göhər, pərvanə olmuş dərbədər,
Mümkün edə bilsən əgər, viranə ol, viranə ol.
İstəmisən, məstlər hər an əldən-ələ etsin rəvan,
Əl çək sən onda canından, peymanə ol, peymanə ol.
Nəfsin olarsa ixtiyar, İskəndərin səddi olar,
Sel olmağa versən qərar, məstanə ol, məstanə ol.



Sən məhrəm olsan zülfünə, yay ətrini can mülkünə,
Yüz dilli ol, dinmə yenə, sən şanə ol, sən şanə ol.
Uşağın atdığı o daş divanəlikdə oldu faş,
Baş alma heçliyə, yavaş, fərzanə ol, fərzanə ol.
Yan, ruhunu sən pak elə, nə qorx, nə də ki, bak elə,
Dəryada olmasan hələ, dürdanə ol, dürdanə ol.
Şəbnəm yox oldumu, inan, gülşənlə birləşən zaman,
Canana qurban eylə can, canane ol, cananə ol.
Sən Saibin şerin eşit, o Rumlu Arifi yad et,
Deyir ki, düz yol ilə get, divanə ol, divanə ol.

* * *

Qamaşar gözləri, hər kəs üzünə baxsa bir an,
Mən uzaqdan baxıram hüsnünə heyran-heyran.
Çıxasan gərdişə bu qamət ilə bağda əgər,
Sərvlər başın əyər cərgə ilə orda, inan.
O qədər incə, lətifsən, yerə düşməz kölgən,
Təzə gül yarpağıtək ətr yayırsan, canan.
Utanıb baxmamısan aynada öz surətinə,
Misr heyranın idi, indi də olmuş Kənan.
Gözələ baxmağa Saib utanırsa, o yenə
Qəlbdən razıdı, olsun sənə hər an qurban.

* * *

Şərabın şəbnəmi düşmüş mənə bir lalə gətir,
Doldurub mey qədəhin, könlümü sən halə gətir.
Müşgül olsa qədəhi doldurub hey paylamağın,
Yığ yağış damlaların, ya da yığıb jalə gətir.
Boş sözü söyləməyə, saqi, mənim yox həvəsim,
Dəryada dalğanı say, ol qədər piyalə gətir.
Dostları yad eləyib içsən, ürək şad olacaq,
Bu könül aləmini meylə qeylü qalə gətir.
Yaz gəlibdir, nə durubsan, a bulud, tök yağışı,
Yağış ilə şərabın şişəsin cidalə gətir.
Güllərin çöhrəsinə şeh qoyub öz nöqtəsini,

Get bağa, gör qutarıb ordakı risalə, gətir.
Qəlbinin dağı ilə naz eləyir lalə yenə,
Bir qədəh badə verib, sən onu kəmalə gətir.
Bədnəzər evyıxanın sən də görünmə gözünə,
Qəlb evin açmaq üçün yazdırıb qəbalə gətir.
Lalənin qanının üstə qan axıtma, səyyad,
Nalənin üstə tərrəhhüm elə, az nalə gətir.
Hüsnünün şöləsi düşmüş o qara tellərinə,
Fikrinə aylı gecə şölələnən halə gətir.
Susdu, Saib, o gülün xatirinə bülbüllər,
Doldur o mey qədəhin, qoyma daha qala, gətir.

* * *

Dilrübalıqla yenə naz eləyirsən mənə sən,
Qəlbi aldın, nə qalıbdır ki, gəlibsən yenə sən?
Zülfünün ətri damıb, dəryada gövhər yaranıb,
Nazu qəmzənlə hara getsən əgər, bir dənəsən.
Qoltuğunda kuzə, əldə qədəhin, bir də ki, çəng,
Ətrafa boylanaraq, gəldin əcəb gülşənə sən.
Əl çalıb oyna, gülüm, çünki xarabatdı bura,
Gəlmədin heç də dua etməyə bu məskənə sən.
O qədər qal, əzizim, mən unudum ta özümü,
Axı şadlıq gətiribsən bu yazıq bəndənə sən.
Qəlbi yanmışlara sən çatsan əgər, sübh yeli,
De, nə tapşırdı yarın zülfü əmanət sənə, sən.
Kim xəbərsizdi, həqiqət donu biçmiş sözünə,
Xoşdu, Saib, o məcaz aləminə sən dönəsən.

* * *

Məni salmışdı qana, vallah, o türkün gözəli,
Sinəm olmuş hədəfi kirpiyini mən görəli.
Vədə vermişdi, fəqət tutmadı öz vədəsini,
Qəzəbi dağ çayıdır? Bəlkə, yazın lilli seli?
Yanağından tökülən yaş baharın gurşadıdır,
Nə qədər ev dağıdıb, ümmana qərq etdi eli.



Bəzənib baxmadı diqqətlə hələ hüsnünə o,
Nə isə güzgüyə heç vaxt uzana bilmir əli.
Qəlbinin aldı qərarın nə qədər aşiqinin,
Hesaba gəlməz o dilbər gözəlin fitnə-feli.
İstəyir məftun edib yandıra pərvanəni o,
Şam kimi şölələnir, ta ki əsir sübh yeli.
İldırım tək çaxaraq düşsə, neyiistana düşür,
Ah kimi sinədən uçsa, qırar ən incə teli.
Günəşin şəbnəmini görməmiş heç kəs, Saib,
Tərinin damlası şəbnəm kimi örtmüş o gülü.

* * *

Ey gözəl, həm meypərəst, həm də qəzəlxan olmusan,
O yaman gözdən uzaq, məşhuri-dövran olmusan.
Hər nə keçsə fikrimizdən, sən bilirsən ilk dəfə,
Xoş əda, xoş xasiyyət, həm də məqamdan olmusan.
Sən ki bir vaxt evinin küçəsini bilməz idin,
İndi həm yol göstərən, həm yol kəsən can olmusan.
Bu ötən axşamadək yox idi şəkkər gülüşün,
Şəkkərstanda bitən gül kimi xəndan olmusan.
Sərvidin, sübh yelindən budağı tir-tir əsən,
İndisə hər şaxəsi meyvəylə əlvan olmusan.
Səndən ötrü öləridim, bu həyatımdı, deyə,
Surəti Xızr, ləbi İsayi-dövran olmusan.
Utanıb baxmaz idin aynada öz surətinə,
İndi bu hövsələ, bu fikrdə hardan olmusan?
Qəlbü can istədi aşiqdən o xəttinlə xalın,
Can alan ovçumusan, yoxsa ki canan olmusan?
Sən ki söz dinləmədin, söylədi söz əhli sənə,
Söz bilən, söz dərk edən, sözlü bir insan olmusan.
İndiyədək nəzərin bir ürəyə möhtac idi,
İndi qəlb ovlamağa sahibi-fərman olmusan.
Gül kimi pərdədə qalmışdı səsin xeyli zaman,
Kim verib dərsini, sən indi nəvaxan olmusan?
Hüsnünün qafiləsin Yusifi-Kənan soydu,

Fəxr elə, hüsnüdə sən sahibi-dastan olmusan.
Yeri var, sərv xəcalət çəkə öz qəddindən,
Su kimi, sən bu bağa yaz başı ehsan olmusan.
Canını, qəlbini Saib sənə etmişsə fəda,
Necə ki istəmisən, eylə də elan olmusan.

* * *

Mənə ram oldu ol sərvi-rəvan ahəstə-ahəstə,
Zora düşməz, çəkilsə çün kəman ahəstə-ahəstə.
O qədri başına döndüm, o qədri payinə düşdüm,
Mənə meyl etdi ol tazə cavan ahəstə-ahəstə.
O körpə qönçənin, ey dil, qonaət eylə ətrilə,
Nəzarət eyləsən bərkir fidan ahəstə-ahəstə.
Tükü yağdan çəkərlər, – bir məsl var, – inciməz ruhu,
Könüllər ovlamış nazik miyan ahəstə-ahəstə.
Zəif olsan, hamar yolla gedərsən mənzilə, şəksiz,
Gəzər dağlarda, çöllərdə çoban ahəstə-ahəstə.
Bu qəzvinli gözəllərlə bacarmazsan, inan, Saib,
Səni səslər uzaqdan İsfahan ahəstə-ahəstə.

* * *

Demə ki, söhbət elə, bir daha məclisdə yenə,
Hanı ilham verən o nərgizi gözlərlə mənə?
Sən kimi nurlu çıraq yoxdu bu məclisdə, inan,
Demirəm burda hələ, ölkədə tay yoxdu sənə.
Tutidən, söylə, nəyin əskik olub, ey bülbül?
Sən də öz balu pərinlə yaraşırsan çəmənə.
Sənin eşqinlə, bilirsən, necə mən dərbədərəm?
Söhbət etmək yad olub mən kimi dil-dil ötənə.
Vətəni salma yada, çün bu haman məskəndir,
Bizi Yusif kimi həsrət qoyub o pirəhənə.
Zəifin gözdən axan yaşlarına hörmət elə,
Qarının təndiri tufan salacaq Şərqə yenə.
Saibin söhbəti salmış şəkəri qiymətdən,
Veriniz indi xəbər tutiyə-şəkkər sevənə.



* * *

Ürəyin yoxdu əgər nazlı nigardan xəbəri,
Dildarın, bəlkə, ola bu dili-zardan xəbəri?
Xəstənin yox xəbəri, dərdinə laqeydsə əgər,
Təbib istər ki, ola gizli azardan xəbəri.
Nəzəri iynə gözündən keçə bilmirsə onun,
Bu işin incəliyindən olar hardan xəbəri?
Tikan üstündə gəzib ləzzətini görməyənin,
Söylə, hardan olacaq səhrada xardan xəbəri?
Söylə, kim axtara, sirrin, tapacaqdır, açarın,
İlanın vardı yer altında dinardan xəbəri.

* * *

Sən bu dərdin, kədərin hikmətin hardan biləsən?
Hələ sağlamdı canın, qiymətin hardan biləsən?
Canına baxmaq ilə ömrü yetirdin başa sən,
Yox çörəkdən savayı, möhnətin, hardan biləsən?
De, xəyal aləminə eyləmisən harda səfər?
Yoxluğun, istəməyin həsrətin hardan biləsən?
Özünü tərk edərək çıxmamısan sən kənara,
Göyü seyr eyləməyin cürətin hardan biləsən?
O kiçik şəbnəm əgər cəlb eləmir diqqətini,
Sellərin hay qoparan hiddətin hardan biləsən?
Oturub-durmusan ancaq bu gülüstanda yəqin,
Bu gülün, bu çiçəyin nemətin hardan biləsən?
Ürəyin xoşdu bu bağlarda sənin var səmərin,
Sərvidən ayrılığın zillətin hardan biləsən?
Nobaharlar səni aldatdı o şux görkəm ilə,
Sən xəzan çöhrələrin miknətin hardan biləsən?
Bu cahan ilə sənin yoxsa işin, Saib, əgər,
Onla həmsöhbət olub, ülfətin hardan biləsən?

* * *

Qəm yemə, qırmızı şərabın var,
Hay qoparma əgər kəbabın var.
Dünyanın dərdini ürəkdən at,

Kuzə var, onda bəs savabın var.
Çırağın yağı yoxsa, dərd eləmə,
Başın üstündə mahitabın var.
Sayginan atdığın qədəmlərini,
Qəlbidə hərgah iztirabın var.
Hər nəyin vardı, bil, bu aləmdə,
Çünki gövhər kimi xitabın var.
Yarada qoyma sən tikan çürüyə,
Yaranı kəs, əgər ki, tabın var.
Gözünə nur verər o gövhərlər,
Nə qədər dünyada əzabın var.
Xalqına söylə, hər sözün varsa,
Onda hər müşkülə cavabın var.
Kölgən ardınca durmadan dolanar,
Öndə hər vaxt ki, afitabın var.
Saib, o köhnə badəni sən unut,
Təzə eşqin, təzə rübabın var.

* * *

Yanmısan sən ki, həyanın tərinə, ey saqi,
Camı doldur, gələr halın yerinə, ey saqi.
Mey ilə noğlu dəyişdim yarımın busəsinə,
Cigərim yandı, elə rəhm mənə, ey saqi.
Şam necə fanusu etmişdi çəpər dövrəsinə,
Yaraşır indi bu paltar da sənə, ey saqi.
Pambığı sübh çağı aç kuzənin ağzından,
Bizə lütf eylə, baxaq bir də günə, ey saqi.
Xumaram, solmuş üzüm sanki xəzan yarpağıdır,
Bir də doldur o camı, bir də yenə, ey saqi!
Ağzım ol meyli dodaqdan necə də şirin olub,
Afərin ləbləri şəkkər edənə, ey saqi!
Qaydadır, atəşə yağ atsan əgər, şölələnər,
Mey gətir, qoyma bu ilhamı sönə, ey saqi.
Şərabın düşsə əgər qətrəsi şor torpağa da,
Al şərab orda dönər ağ süsənə, ey saqi.
Saibi-təşnəcigər, bil ki, sənə bəndə olub,
Bir nəzər eylə bu təşnə bədənə, ey saqi.



* * *

Qönçəyə gül yaxanı açmağa imkan vermə,
Hər uşağın əlinə təzə gülüstan vermə.
Bu şəhər əhli dəyər bir-birinə, sən bir gün
Məcnuna zəncirini qırmağa fərman vermə.
Əgər Əflatun ilə qoymayasan baş-başa sən,
Onda Yunanda kitabxanəyə divan vermə.
O tikanla dolu səhraya əgər düşsə yolun,
Tikana damənini tutmağa meydan vermə.
Yar gülən vaxtda sanırsan ki, qiyamət qopacaq,
Bir gülüşdən ötəri qəlbini qurban vermə.
Ey fələk, insaf elə, alma bizim ruzimizi,
Kim deyibdir ki, bizə neməti-əlvan vermə?
Tüstülər çıxsa başından, yenə də, Saib, döz,
Bir ovuc Hind qumuna dəyməz o İran, vermə.

* * *

Sən bivəfa olma, yar, amandır,
Gül bivəfadır, yanağı qandır.
Mey lalə kimi qızarmış, ancaq
Hicrin üzü sapsarı soğandır.
Lalə ürəyi dağ ilə dolmuş,
Köynəyi qızıl kimi əyandır.
Zər ilə qadında heç gözüm yox,
Tüstüylə dolub evim zamandır.
Biganələr ilə aşinalıq
Baş tutmaz, axırda, bil, yalandır.
Düşmən qəməsin alıb əlindən,
Gizlətmişəm hardasa, nihandır.
Hicrin əzabın yazımmı yara?
Yazmaq elə bilməyin asandır.
Rəftarıma bir eyib tutan yox,
Kəndə, şəhərə, nəyə ziyandır?
Çəkmə bazara çürük mətahı,
Göstərmə ki, müştəri qanandır.
Saib, xəzanın budurmu rəngi?
Bu rəng bizimlə mehribandır.

I

Səpibdir hər yana əxtər şükufə,
Edibdir yer üzün gövhər şükufə.
Qopubmu Yusifin ağ köynəyindən?
Müəttərdir, müəttər hər şükufə.
Elə bil, yüz-yüz ağ şamlar alışmış,
Qara qəlbə olub rəhbər şükufə,
Başında ağ çətir tutmuş gəlintək,
Dayanmış çöhrəsi əsmər şükufə.
Oyanmış röyadan cümlə ağaclar,
Deyir, sanki gəlib məhşər, şükufə.
Süleyman təxtinə çatmaq dilərmi,
Açıbdır göylərə şəhpər şükufə?
Budaqlar üstünə gövhər düzübmü?
Olubmu inciyə məhzər şükufə?
Necə ki, yolları qışda qar örtər,
Budaqda o qara bənzər şükufə.
Gümüşəndam nigara bənzəri var,
Bağa öz örpəyin örtər şükufə.
Bu ağ çalma gülü heyran edibdir,
Olubdur güllərə mehvər şükufə.
Gedib gül bağına sən şadlıq eylə,
Açıbdır, gör necə dəftər şükufə.
İpəkdən hüsnünə bir pərdə salmış,
Giribdir örtüyə dilbər şükufə.
Qoparıb çadırı bir yana atmış,
Axı boz çadırı neylər şükufə?
O ağ şamlar edər hər yanı aydın,
Gümüşdür, yoxsa ki mərmər şükufə?
Elə bil, süd axır mərmər sinədən,
Düşər torpağa hər dəm tər şükufə.



Buluddur gövdəsi sərvin, deyirsən,
Büllurdan da gözəldir hər şükufə.
Özündəndir qələm də, ağ kağız da,
Çəkər öz hüsnünü əzbər şükufə.
Necə Məryəm Məsihanı böyütdü,
Qucaqda meyvələr bəslər şükufə.
Uşaq öz barmağından süd əməntək,
Verər hər meyvəyə cövhər şükufə.
Nədəndir şirin olmuş, heç bilirsən?
İçibdir, bəlkə də, kövsər şükufə.
Civəni güzgüdə gördünmü, titrər?
Suda, bax, öylədə titrər şükufə.
Gecədən feyz alar qəlbin o günlər,
Saçar çün ətrafa ənbər şükufə.
Gümüştək aləmi ağ rəngə tutmuş,
De, mehtabdır, gümüşdür, zər şükufə?
Səhər də mehtabı görmək dilərsən,
Edibdir bağları zivər şükufə.
Xərabət piritək bu tazə üzlə
Olubdur qəlblərə sərvər şükufə.
Dönübdür bağ yolu ağ kəhkəşanə,
Tökülüb torpağa əxtər şükufə.
Ayağın altına qu tüklərindən,
Sanırsan ki, sərib bəstər şükufə.
Səhərlər ulduzu kim gördü göydə?
Dönübdür ulduza yeksər şükufə.
Şərabı şişədən süz cama sən də,
Budaqdan hey düşür tər-tər şükufə.
Sanırsan ki, beşikdə İsa dindi,
Şaha xoş mədhilər söylər şükufə.
Şah Abbas naminə zər sikkə vurmuş,
Olubdur gör necə zərgər şükufə.
Ədalət hökm edir dünya üzündə,
Küləklərdən tapıb qəhmər şükufə.
Müəttər eyləmiş güllər fəzanı,
Olub başdan-başa ənbər şükufə.

Sözün başın buraxma, bəsdi, Saib,
İpəkdir, ya da ki məxmər şükufə.
Sözün şəkkər kimi şirin də olsa,
Zorərdir çox ola şəkkər şükufə.
Dua eylə ona bu gül bağında,
Dua eylər ona çün hər şükufə.
Onun iqbalı daim aydın olsun,
Kama çatsın o pak gövhər şükufə.

## II

Hüsnünə ayna tutan da olubdur heyranı,
Ola bu gözlərim o tərli çöhrə qurbanı.
O qara saçlarının, bir də ki al ləblərinin
Tərifi gör necə tutmuşdu bütün dünyanı.
Sən susanda, elə bil, sakit olur göylər də,
Başlayır yer üzünün sən güləndə tufanı.
Günəş heyrətdə qalıb səndəki bu cazibəyə,
Səndən ayrılmağa yoxdur günəşin imkanı.
Sanki püstə içitək dünya düşübdür şəkərə,
Nə vaxt ki, püstə ləbin oldu şəkkərin kanı.
O ipək saçlarına valeh olub sünbüllər,
Güllərin çöhrənə baxcaq pozulur sahmanı.
Qədəhi almış ələ gül üzündə şəbnəmtək,
O tərli çöhrə olur sanki gövhər ümmanı.
O əyri qaşları yağmur dolu üfüq kimidir,
O pünhan etdi fəqət qibleyi-müsəlmanı.
Elə ki, hüsnünün əfsanəsi cahana düşüb,
Yusifin tərifinin bağlanıbdı dastanı.
O qara gözlərin zülmət gecənin bəxşişidir,
Odur ki, İsfahanın sürməsi olub fani.
Od üstə qalmaz üzərrik, onu nahaq gəzmə,
Od dəyər, tork eləyər şeh o güli-xəndanı.
Əgər o bircə dəfə hüsnüdən niqabı ata,
Çölləri tərk eləyər Leylinin də karvanı.
O odlu çöhrəyə baxsa, sönər gözün nuru,



Necə ki, atəş olan yerdə tər buxarlanı.
Həyadan ağ üzünə baxmağa üzüm gəlməz,
Kəbab edibdi məni ol cəmali-nuranı.
Gülə yaxınlıq edən qönçə tez güdaza gedər,
Çıxıb da seyr eləmə naz ilə gülüstanı.
Cəmalı Zöhrədi, nəqqaş ona baxa bilməz,
Gərəkdi fürsət edib, rəsm edə o pünhanı.
Piyalənin dibini töksə torpağın üstə,
Yəqin ki, rəqsə gələr onda torpağın qanı.
Kimə deyim sözümü, özgə bir kəsim yoxdur
Deyə o yara, məni məhv edibdir hicranı.
Ya naz edə, ya qəzəb, naümid olan deyiləm,
Onun məhəbbətidir çünki canımın canı.
Onunla bitdi daha dilruba gözəllik də,
Onunla tərk elədi təxti-eşq sultanı.
Cahana hakim olan ol vüqarlı Abbas şah
Həmişə münsif edib öz işində imanı.
Necə əyər başını dərs alanda tüllablar,
Ona əyərdi başın, kim olaydı mehmanı.
Günəş kimi, yeri var, fəxr edə fələk onla,
Tutardı hörmətini ölkənin hər insanı.
Ona itaət edər Zöhrə ilə Mürrix də,
İşarət etsə, durar göylərin də cövlanı.
Acıqla baxsa, sədəf qoynunu açar yarışa,
İnan ki, gövhər olar göylərin də leysanı.
Çəkibdi bəd əməlindən əlin bu çərxi-fələk,
Dəyişmiş idi o öz hökmü ilə dövranı.
Qılıncı Qaf dağına vursa idi hiddətlə,
İki bölərdi yəqin şəmşiri o qalxanı.
Apardı torpağa bayquş xəraba həsrətini,
Bütün bu ölkədə bir ev viranə olmuş hanı?
Dua gəlir əlimizdən, ona dua eləyək,
Olubdu Saibin hər dərdinin o, dərmanı.
Onun əlilə bu ölkə büründü al qumaşa,
Çaharbağ oldu gülüstan, o verdi fərmanı.

### III

Dərya təbim şeirdə çün gövhərəfşan eyləyər,
Ağzını açmaz sədəf, dürrü o pünhan eyləyər.
Xızrtək hər dəm qələm zülmət mürəkkəbdən çıxar,
Ağ vərəqlər üstünü bir sünbülüstan eyləyər.
Leylinin kərvanıtək səf-səf duranda beytlər
Hər sözün bülbül kimi ahənglə əfğan eyləyər.
İlhamım məşşatətək hər dəm sözə ziynət vurar,
Sanki solmuş qönçəni o bir də əlvan eyləyər.
Bu nəfəs ki, məndə var, hər bağçaya qoysam qədəm,
Şəbnəmi ahım odu ləli-dirəxşan eyləyər.
İlhamım səs salsa, bağban bağdakı bülbüllərə
Qönçənin qoynun ömürlük qanlı zindan eyləyər.
Qarğılar tuti qanadıyla bəzər öz hüsnünü,
Harda ki, odlu qələm bir nəğmə dastan eyləyər.
Şerimin misraların qövsi-quzeh eylər səma,
Gün mənim rəyimlə öz hüsnün nümayan eyləyər.
Duzlu sözlərdir düşən hər dəm qələmdən dəftərə,
Mənə süfrəm çün qələmdanı nəməkdan eyləyər.
Nil qədər mənə axıtdı misra müddətdir qələm,
Yüsifi-Kənan təbim hüsnüylə tüğyan eyləyər.
Yazdığım mənaların bir zərrəsin tapsa, inan,
Təşnələr ol zərrəni, bil, abi-heyvan eyləyər.
Nobaharda xatirinçün bircə gül açsa əgər,
Sübhtək o qönçə gül dünyanı xəndan eyləyər.
Qızların qəlbi kimi nazik xəyalım var mənim,
Bağçama İsa dəmin hər anda ehsan eyləyər.
Təbimə göylər belə darlıq edər, yoxmu əlac,
Nə edərsə, bil, mənə indi bu dövran eyləyər.
Gör bu dövranın əlindən nə çəkir göydə Günəş,
Yenə o öz nurunu dünyaya ehsan eyləyər.
Fitnəli göz, sanma ki, sakit olur göylər kimi,
Heç inanma, sussa da, batində tüğyan eyləyər.
Bülbülün şaqraq səsi getməz qulağımdan mənim,
Sanma ki, qönçə mənimlə bəhsə imkan eyləyər.



Kim Zəfər xandan mənimtək sonsuz hörmət gördüsə,
Bir inamla şeirdə bu fikri elan eyləyər.
Yandırıb könlümdə o, mehri-məhəbbət şəmini,
Bu məhəbbətlə, inan, hər dərdə dərman eyləyər.
Gül kimi, ilhamı açsa pərdəni ruxsardan,
Şübhə yox, Xaqanini şerilə heyran eyləyər.
Çün səxavətdə bütün düyada məşhur olmuş o,
Bir qərib insan görər, hörmətlə mehman eyləyər.
Al şəfəqlərdən qılınc vermiş ona dövran özü,
Bircə hökmüylə şehi bağda o, bağban eyləyər.
Hökmü gəzdikcə nəsimtək yer üzün başdan-başa,
Kimdə bu cürət olar, zülfü pərişan eyləyər.
Sübh onun hökmüylə ağ geydirdi bir-bir şamlara,
Bu səbəbdən göy üzün şamlar çıraqban eyləyər.
Ey ağam, gör ki, nə vaxtdır düşmüşəm səndən uzaq,
Bu uzaqlıq Saibin qəlbin, inan, qan eyləyər.
Cəm olub cümlə müqəddəslər, tez ol, dil aç, qələm,
Biriya insana insan can da qurban eyləyər.
Sən uzat hümmət əlin, şahim, nəvasız bülbülə,
Gör necə söz mülkünü şerim gülüstan eyləyər.
Sən könüllərdə nə vaxtdır ki, nigəhban olmusan,
Harda olsan, haq səni xalqa nigəhban eyləyər.

### IV

Bəzəyib çalmasını öndə hökmdar gedər,
Düşüb ardınca onun xalq da ki naçar gedər.
Çox təəccüb, küçələrdə niyə qan axmır axı?
Xalq əvamdır, qabağın kəssə də divar, gedər.
Dövranın gərdişi məzlum eləyib xalqı tamam,
Yox geri dönməsinə əldə ixtiyar, gedər.
Daşda qalmış ləpiri bəzi ağır gövdələrin,
Qəzəb ilə doludur, sanki bir anbar gedər.
İy çəkiblər bu gönüqalın adamlar, elə bil,
Mişk üçün çəksə əgər min cürə azar, gedər.
O, qarışqa boğazından çıxarar qılçığı da,

Muncuq üçün ilanın ağzına aşkar gedər.
Hər zaman yoxlamağa getməyir o, xəstələri,
Sağalıb durmasına bilsə ümid var, gedər.
Ayağı altına baxmaz o, təkəbbürdən, inan,
Güldən ötrü, dalasa əllərini xar, gedər.
Bir nəhəngtək sinədə hiddəti tüğyan eləsə,
Yüz gəmi udmağa ümmanda o qəddar gedər.
Desələr ki, şirin ağzında qızıl vardır əgər,
Tamahından o, şirin ağzına oynar, gedər.
Sındırar başını öz məqsədinə çatmaq üçün,
Əyri yolla desələr, gizli, ya aşkar gedər.
Onun addım səsini kim eşidə, kar olacaq,
Sanki daşlıqdadı o, yolda nahəmvar gedər.
Deyəsən, məsti-xumardır, elə ləngər vurar hey,
Mığmığa sancsa onu, onda çəkər car, gedər.
Bir ayağı yəhərə yetsə, gedər qəbrə biri,
Mərkəzin dövrəsinə sanki o, pərgar gedər.
O adamlar ki, canın qoydu fəqət ziynət üçün,
Bilmədi qəlp çıxana yoxdu xiridar, gedər.
Saib, onlar ki, şikəst olmuş əgər bəxtindən,
Görə bilmir, ucalıb qarşıda divar, gedər.






* * *

Nə qədər naz edəcəksən, a kaman qaşlı yarım,
O kamanın oxuna dözməyə yoxdur qərarım.

* * *

Elə möhkəm qurulub qaşlarının hər kamanı,
Onları çəkməyə mən xəstədə o qüvvət hanı?

* * *

Nərgiz kimi ol gözlərə aldanma, amandır,
Məzlum görünən zalimin hər zülmü yamandır.

* * *

Abrunu tökmə hədər, böylə misal var, deyə sən:
Qurumuş arxa, ümid var ki, gələr su təzədən.

* * *

Xəncərin bircə baxışda kəsərin billəm o dəm,
Qaşının ovxarını bilməyirəm, bilməyirəm!

* * *

Ehtiyatla bax o yatmış gözəlin gözlərinə,
Vay o dəmdən, oyanıb baxsın o gözlər də sənə.

* * *

Yoxsulluğun əlindən təzə xilas olan kəs,
Təəccübdür, yoxsula necə laqeyd baxır bəs?

* * *

İki şey istərəm dünyada dövrandan, inan,
Sən yanımda olasan, hicr də qalxa aradan.

* * *

Ahımın atəşi o qaşlarına etməz əsər,
Bəs nə sözdür ki, deyilər, kaman otda əyilər.

* * *

Təzə açmış çiçəyim, çox uzağa getmə ki, sən,
Yol kənarında gülü tez qoparar yoldan ötən.

* * *

Küçədə torpaq ilə oynayan o oğlana bax,
Kim ki, nadandı, bu dünya onu, bil, oynadacaq.

* * *

Elə ağır keçir illər, əyilibdir belimiz,
Yola saldıqda ili bayram edir ellərimiz.

* * *

Gülmə, ey gənc, bu ağarmış saçımın mənası var,
Bil ki, bu dünyada hər dağ başına yağmır o qar.

* * *

Nə qədər zülm eləyirsə, düzü, bu dünya bizə,
Onu tərk et, deyə hökm etməyirik qəlbimizə.

* * *

Qəlbimin atəşi qalxmazsa çinar qəddə əgər,
İnanan olmayacaq dərdlərimə bircə nəfər.



* * *

Kim meyə meyl eləsə, bil ki, pərişan olmaz,
Kim görüb, tövbə edən sonra peşiman olmaz?

* * *

Zülfü afət, teli fitnə, o qara xalı bəla.
Vay o gündən ki, bu kafirlər hələ əlbir ola.

* * *

Sübhədək qalsam əgər bir də xəyalıyla onun,
Açmaram gözlərimi, başıma açsa min oyun.

* * *

Neçə qəlbi şişətək vurdu daşa, eylədi zar,
Bu ki əfsanə imiş, "yar ürəyi nazik olar".

* * *

Yoxsulun eyninə gəlməz qocalıq dərdi, inan,
Dərd odur ki, diş ola, amma çörək tapmayasan.

* * *

Zülfünün dərdi ki, hansı ürəyi aram edər,
Bu ümidlə yaşayıb, hər gününü axşam edər.

* * *

Zahidi qoyma qədəm basmağa meyxanəyə sən,
Meyi, meyxanəni təhqir eləyirsən niyə sən?

* * *

Nə səbəb oldu yarın zülfü bizə olmadı ram,
Niyə bilmir ki, onun atəşinə odlanıram?

* * *

Gah ürək ovlayır o, gah da olur çox mehriban,
Əlaman ol fitnəkar saçlar əlindən, əlaman!

* * *

Kəsilə əlləri kim ki, bizi al qanə çəkib,
O pərişan saçına sübh çağı şanə çəkib.

* * *

Sinəm yaradır, bir daha dağ çəkmə, amandır,
Rəhm eylə mənə, zülfə daraq çəkmə, amandır.

* * *

Saqi, çəkmə gözünü məndən, elə bir də kərəm,
Al əlimdən bu camı, yoxsa özümdən gedərəm.

* * *

Sevgidən xali olan baş bədənə yükdür, inan,
Kuzə boş oldu, onu almaz elə arif olan.

* * *

Mey satanlar küçəsində paxılın yoxdu yeri,
Paslı qabda mey əgər qalsa, heç olmaz əsəri.

* * *

Doğru söz ox kimidir, düz dəyəcəkdir nişana,
Oğlu istər kişitək tab gətirə bilsin ona.

* * *

Söz uzandıqca azaldar özünün qiymətini,
Hər kəsi mədh eləyən tez salar öz hörmətini.



* * *

Dinləyən arif olarsa, natiqə ilham verər,
Qönçə sakit durmasa, bülbül fəğan eylər məgər?

* * *

Sözün mənasındadır söz deyənin qüdrəti,
Çün ətrindən bəllənər hər gülün lətafəti.

* * *

Söz çıxıb dağ başına, qələmin dili haça,
Qəlbim qələmə döndü mən bir söz ovlayınca.

* * *

Kağız üstə hər kəsin inildəsə qələmi,
Bil ki, qələm tutanın başından aşıb qəmi.

* * *

Hövsələsiz adamla səfər etmə heç zaman,
Şar kimi partlayacaq adicə bir təmasdan.

* * *

Gəlişinlə gedişin öz əlində olmayıb,
Bu dünyada günlərin bəs necə keçdi, Saib?

* * *

Sinəmin yarasını kim gözəsə iynə ilə,
Yenə çatmaz bu tikanlar da ola iynə belə.

* * *

Ey güldərən, bu bağda ehtiyatla dolan sən,
Nigaran gözlərini şəbnəm çəkmir əlindən.

* * *

Fələk aman verмədi arzuya çatsın ürək,
Arzuma çatmaq üçün nadan olaydım gərək.

* * *

Kimə qayğı edirəm, qayğım dönür dərd olur,
Müşkülünü açdığım boynuma kəmənd olur.

* * *

Qəlbimin şişəsini sındıran ol yara deyin
Ki, sınıq qəlbdə sağalmaz daha bu yara, deyin.

* * *

Sübh açılmışdı daha, sakit oturmaq nə üçün?
Ahını qasid elə, yanına göndər o gülün.

* * *

Bircə gün ömründə kim aşiq olubsa dünyada,
Olsa da kafər, qiyamət günü azaddı o da.

* * *

Gözlərim yaşlı, ürək qəmli, dilim ahla dolu,
Nə biləydim ki, çətinmiş bu qədər eşq yolu.

* * *

Aşiqindən sonra məşuqə onun qədrin bilir,
Fərhad öldükdə nə çəkmişdi Şirin, Şirin bilir.

* * *

Güllərin rəngini sormaqla əzab vermə ona,
Hansı bülbül ki, qəfəsdə göz açıbdır cahana.



* * *

Bu qələmdan kimi təng oldu mənə çün aləm,
Dərdimi dillərə salsa, salacaq indi qələm.

* * *

Qədəmim dəysə, çəmənlik bozarıb torpaq olar,
Lalənin bir dağı qəlbimdə dönüb min dağ olar.

* * *

Bir qarə buğdayi dilbər nəsibim olsa, nə qəm,
Mən məgər həzrəti-Adəm nəvəsindən deyiləm?!

* * *

Kim paxıllıq tozunu silsə üreyindən əgər,
Gözlərində yer üzü tazə gülüstana dönər.

* * *

Kim ağlının gözüylə bu dünyanı seyr edər,
Torpağın altında da rahat yatıb dincələr.

* * *

Nə məsciddən xeyir gördüm, nə meyxanə çatır dadə,
Daha başqa yerim yoxdur, gedim indi bu dünyadə.

* * *

Qürbətə bağlama bel, tərk eləmə tez vətəni,
Hər quşun öz yuvası, hər kişinin öz vətəni.

*- Elə yüngüldü yüküm, Nuh məni almış gəmiyə,*
*Çör-çöpəm sanki, tufandan xəbərim yoxdu mənim.*

**Nuh** – əfsanəvi peyğəmbərlərdən biridir. Dini rəvayətə görə, onun zamanında tufan olmuş, bütün yer üzünü su basmışdır. Nuh peyğəmbər dülgər olduğu üçün bir gəmi qayırmış və bütün canlılardan bir cüt öz gəmisinə götürüb onları ölümdən xilas etmişdir

Saib beytdə həman hadisəyə işarə edir.

"Yüküm yüngüldür", yəni dünyada heç bir günah etməmişəm, ona görə də heç bir tufandan qorxum yoxdur, deyir.

*- Müşkil işdir keçdiyin səhranı bir də keçməyin,*
*Qorxuram eşqim Züleyxatək cavan eylər məni.*

**Züleyxa** – Misir hökmdarının arvadı. Yusif Kənanlı Yəqub peyğəmbərin kiçik oğlu idi. Guya atası onu hamıdan çox istədiyindən qardaşları onu qısqanır və bir gün ova çıxmaq adı ilə Yusifi də özləri ilə aparıb bir quyuya salırlar. Kənandan Misirə gedən bir tacir Yusifi quyudan çıxarıb Misirə aparır və qul kimi satır. Bir qul kimi Misir hökmdarının evinə gətirilən Yusif, Züleyxanın nökəri olur. Rəvayətə görə, Züleyxa özündən cavan və həddindən artıq gözəl olan nökəri Yusifə aşiq olur. Yusif Züleyxanın məhəbbətini cavabsız qoyduqda Züleyxa ona böhtan atıb zindana saldırır.

Saib bu beytində demək isteyir ki, insan ömrün yolunu geri qayıdıb bir daha yenidən yaşaya bilməz. Qorxuram, cavanlıq eşqinə düşmüş Züleyxa kimi məni də eşqim rüsvay etsin.

*- Qan vermişəm hər kəlməyə mən öz bədənimdən,*
*Sönmüş o Süheyl ulduzu dönmüş Yəmənimdən.*

**Süheyl ulduzu** – Cənubda çıxan çox parlaq bir ulduzdur.
**Yəmən** – Ərəbistanda öz yaqut daşları ilə məşhur olan bir ölkədir.

Saib bu misralarda qəlbinin qanını Yəmənin qırmızı yaqutuna, sözlərini Süheyl ulduzuna təşbeh etmişdir.

*- Saldı dərdə bu cəmiyyət incidilmiş qəlbimi,*
*O gümüş pullu balıqtək pullar oldu daşımız.*

Bu beytdə şairin zəmanəsindən və cəmiyyətdən şikayəti verilmişdir. Saib deyir ki, dəryada balığın üstü pulla örtüldüyü kimi, bu cəmiyyətdə də pul



bütün çirkinliklərin üstünə çəkilmiş bir pərdə, hər şeyi ovlamağa qadir olan bir tələdir.

*- Qara torpaq o Xütən ahusunun mişkin əmib,*
*Bir şir ağzında ikən fikrimiz uçmuş Xütənə.*

**Xütən** – qədim Çində yer adıdır. Klassik poeziyada Xütən ceyranlarının göbəyindən mişk ətri hazırlandığı qeyd olunur. Mişk həm də qara rəng mənasında işləndiyindən Saib torpağın qaralığını Xütən ahusunun göbəyindən alınan mişk ilə əlaqələndirir. Şair eyni zamanda torpağı, orta əsr poeziyasının ifadə tərzi olaraq, ağzını açıb insanları udan şirə bənzədir.

*- Səyimin qarşısını almağa gər göstərə cəhd,*
*Bir çuxa tikdirərəm bu qaba ip köynəkdən.*

Saib bu beytdə sufilərin özlərinə fiziki cəza vermək üçün bədənlərinə yundan toxunmuş qaba ip köynək geydiklərinə işarə edir. Beytin fəlsəfi mənası budur ki, əgər bu təriqət məni öz arzularıma çatdırmazsa, mən ondan üz döndərərəm.

*- Torpaqdan qüvvət alıb keçir hər anı eşqin,*
*Laməkana, az aqlır, çatsın məkanı eşqin.*

**Laməkan** – məkansız. Bu, Allaha verilən adlardan biridir. Dinə görə, Allahın məkanı yoxdur. Saib də bu beytdə Platonik eşqin Allah məqamına yüksəldiyini göstərmək istəmişdir.

*- Gecə qaysaq bağlamış, gündüz təzə yaradır,*
*Aysız, günsüz dolanır bil asimanı eşqin.*

Saibə görə, kainat hər şeyə qadir olan eşqin iradəsi ilə hərəkətə gəlir. Eşqin asimanına nə ay, nə də günəş lazımdır. Şair bu beytdə gecəni eşq dərdindən dünyanın qaralmış köhnə, gündüzü isə hələ də közərən təzə yarasına bənzətmişdir.

*- Əgər Mahmudun əmri Hində qədər çatıbsa,*
*Ancaq o, baş əyərdi fərmanına Ayazın.*

Soltan Mahmud Qəznəvi İran şahlarından olmuşdur. Tarixdən onun qoşun çəkərək Hindistanı işğal etdiyi məlumdur. Ayaz, rəvayətə görə, şahın ən sevimli nökəri olmuşdur. Guya Soltan Mahmud Ayazın bir sözünü belə yerə

salmazmış. Klassik ədəbiyyatda bu haqda çoxlu yazılar var. Saib özü də "Mahmud və Ayaz" adlı bir dastan yazmışdır. Bu beytdə də o, Ayazın şah yanında böyük hörmət sahibi olmasına işarət etmişdir.

*- Bir yol gedər həyatdan sadiq olan aşiqlər,*
*İldə bir yol köç eylər qafiləsi Hicazın.*

Məlum olduğu kimi, müsəlmanlar ildə bir dəfə Məkkəyə ziyarətə gedirlər. Bu o zaman olur ki, ziyarətə gedənlər qurban bayramında Məkkə şəhərində olurlar və orada qurban kəsib dini mərasimi yerinə yetirirlər. Saib də lirik qəhrəmanına öz sevgilisi yolunda bir dəfə qurban getməyi məsləhət görür.

*- Ye şəkərdən də şirin sən Əbu Cəhl qarpızını,*
*Qaş-qabaq sallama ki, heç şəkərim yoxdu mənim.*

**Əbu Cəhl** Qüreyş tayfasının başçılarından olub, Məhəmməd peyğəmbərin zamanında yaşamışdır. Yersiz mübahisə edən, cahil adam olduğuna görə, əsl adı Əbu Həkəm olmasına baxmayaraq, xalq arasında və din tarixində Əbu Cəhl kimi məşhurdur.

Rəvayətə görə, o, cəhl edərək xiyarı qarpız adlandırmışdır. Bu beytdə Saib haman məsələyə işarə etmişdir.

*- Hamı bilmir, gecələr yatmayanın həsrətini,*
*Xosrov istər ki, bilə Şəbdizinin qiymətini.*

Xosrov Pərviz İran şahlarından olmuşdur. Şəbdiz onun atının adıdır.

*- İsanın iynəsini sən yaxana taxma nahaq,*
*Bir tükün siqlətinə tab eləməz, bil, o bədən.*

Dini rəvayətə görə, İsa göyə, Allahın yanına gedərkən əynindəki yun köynəkdə dünya malından ancaq bir iynə olmuşdur. Saib burada haman rəvayətə işarə edir və mübaliğə tərzilə öz lirik qəhrəmanının nə qədər zəif, incə olduğunu, hətta yaxasında bir iynəni daşımağa belə qadir olmadığını söyləyir.

*- Çıxarıb Bijəni Rüstəm quyudan verdi nacat,*
*Səni eşq azad edər bu fələyin qeydindən.*

Rəvayətə görə, Bijən Keykavusun oğlu Siyavuşun oğludur. O, Turanın əfsanəvi padşahlarından Əfrasiyabın qızı Menijəyə aşiq olmuşdur. Menijənin Bijəni öz sarayında gizlədib saxlamasından atası Əfrasiyab xəbər tutmuş və onu 7 il quyuda həbs etmişdi. Bu əhvalatdan xəbər tutan Rüstəm tacir paltarında Turana gəlmiş, Menijənin köməyilə Bijəni həbsdən azad etmişdir.



Saib bu beytdə haman hadisəyə işarə edir.

*- Yunisi uddu balıq, dəryada da qaldı oyaq,*
*Dövrənə mavi sular çəksə hasar, yatmaginan.*

**Yunis** – əfsanəvi peyğəmbərlərdən biridir. Rəvayətə görə, dəryada onu balıq udmuş, neçə vaxt balığın qarnında qalandan sonra azad olmuşdur.

*- Hər adam hər nəyə kim, layiq idi, aldı onu,*
*Camı Cəm aldı, Xızr çeşmeyi-heyvan tapdı.*

**Cəmşid** – Qədim İran şahlarından biridir. Cəmşidin (ona çox zaman Cəm deyilir) haqqında yaranmış rəvayətlərdən birində deyilir ki, bu böyük hökmdara divlər xidmət edirmiş; guya şərabı o icad etmişdir və s. Rəvayətə görə, Cəmin qiymətli daşlarla və şərabı tərif edən yazılarla bəzənmiş gözəl bir camı var imiş. Cəmşidin şərab içdiyi bu qədəh klassik ədəbiyyatda Cami-Cəm adı ilə məşhurdur.

**Xızr** – əfsanəvi peyğəmbərdir. Rəvayətə görə, o, qaranlıq dünyada olan dirilik suyunu tapmışdır.

*- Bu fikirlərlə daha söyləmə, Saib nə tapıb?*
*Onu tapmış ki, nə Hatəm, nə Süleyman tapdı.*

**Hatəm** – rəvayətə görə, çox dövlətli və hədsiz dərəcədə səxavətli olan bir şəxs olmuşdur. Xalq arasında və ədəbiyyatda səxavət rəmzi kimi məşhurdur.

**Süleyman** – əfsanəvi bir peyğəmbər və hökmdar olmuşdur. Rəvayətə görə, dünyada olan bütün canlıların ixtiyarı onun əlində imiş.

Saib bu beytində özünün sənətini, fikir aləmini həm Süleymandan, həm də Hatəmdən yüksək tutur.

*- Ürfi ilə Talibin tərifin eylə hər zaman,*
*Eybidir, Saib, sənə, dosta kitabın yoxdusa.*

Ürfi və Talib Saibin müasirləri olub, onun üslubunda şeirlər yazmışlar. Beytdən məlum olur ki, Saib onların haqqında ayrıca əsər yazmadığına təəssüf edir.

*- Şadam, hər surət ilə çapsa atın indi fələk,*
*Fələyin əbləğ atı yorğa çapanımdır mənim.*

**Əbləğ at** – tükü iki rəngdə olan ata deyilir. Klassik Şərq ədəbiyyatında bu ifadə gecə-gündüz mənasında işlənir. Saib də bu beytdə "fələyin yorğa çapan əbləğ atı" dedikdə günlərin sürətlə ötüb keçməsinə işarə edir.

*– Mövləvi yazdığı ol şerə cavabdır bu qəzəl,*
*Sən nə gövhərsən axı Kəsrada tayın olmamış.*

Şeirdə adı çəkilən Kəsra İran şahlarının Keylər sülaləsindəndir. Saib bu qəzəli böyük filosof-şair Cəlaləddin Rumidən (Mövləvidən), Mövləvi isə Nizami Gəncəvidən təxmis etmişdir.

*– Mənsurun mövqeyinə çatdı yüzündən birisi,*
*Lalələr, söylə, bərabərmi şəhidlər sayına?!*

**Mənsur** – bütöv adı Hüseyn Həllac ibn-Mənsurdur. Ərəblərin orta əsrlərdə yaşamış filosof şairlərindən olub, Şərqdə panteizmin yaradıcılarındandır. İlk dəfə insanı Allah mənzələsində görüb, "mən allaham" dediyi üçün din xadimlərinin fitvası ilə dara çəkilmişdir.

Saib bu beytində sufi təriqəti yolunda ölənlərin yüzündən birisinin Mənsur mövqeyinə çatmadığını söyləməklə onu şəhidlər içərisində xüsusi qiymətləndirir. İkinci misrada çöllərdə bitən lalələrin sayının şəhidlərin sayından az olduğunu deməklə öz əqidəsi yolunda ölənlərin nə qədər çox olduğunu xatırladır.

*– Davudun nəğmələri pərdədə qalmışdı daha,*
*Orda ki, Saib oxur şeri, qəzəlxanlıq edir.*

**Davud** – Süleyman peyğəmbərin atasıdır. Rəvayətə görə, Davudun o qədər gözəl səsi var imiş ki, o oxuyanda bütün canlılar heyran qalıb onu dinləyərmişlər. Şərq ədəbiyyatında Davudun səsinin tərifinə həsr olunmuş çoxlu beytlər və qəzəllər vardır.

Saib bu beytdə poeziyasının gözəlliyini söyləmək üçün Davudun nəğmələrini yada salmışdır.

*– Səddi-İskəndər olubdu bu dönük taleyimiz,*
*Qurumuş çay kimi südsüz belə püstan olmaz.*

Şeirdə adı çəkilən İskəndər dünyanı fəth etmək istəyən məşhur Makedoniyalı İskəndərdir. Rəvayətə görə, Uzaq Şərqdə Yəcuğ və Məcuc adlı çox davakar bir tayfa olmuşdur. İskəndər onların ölkəsinə gedib çıxarkən, bu tayfanın qonşu xalqların üzərinə etdiyi hücumlara manc olmaq üçün böyük bir sədd tikdirmişdir.



*– Dünyaya od yayan o eşq də bir gün soyuyar,*
*Onda İbrahim üçün od da dönüb reyhan olar.*

Dini rəvayətə görə, İbrahimxəlil peyğəmbər də, atası Azər də dülgər olmuşlar. İbrahim əvvəllər taxtadan bütlər düzəldərmiş, sonra özünün düzəltdiyi bütlərə sitayiş etmək istəməmiş, onları sındırıb və təkallahlılıq ideyasına düşmüşdür. Hətta oğlu İsmayılı Allah yolunda qurban kəsmək istəmişdir.

Belə bir rəvayət də vardır ki, İbrahimxəlil peyğəmbərə qəzəblənmiş Babil hökmdarı Nəmrud böyük bir tonqal qalatdırır və İbrahimi ora atdırır. Guya Allahın əmrilə həman od güllü-çiçəkli bir çəmənə dönür, İbrahimxəlil peyğəmbəri yandırmır. Saib həman hadisəyə işarə etmişdir.

*– Gördüyün aləm onun hüsnünə bir pərdə olub,*
*Turda o yanmış odu kim salacaq pirəhənə?*

**Tur** – Qırmızı dənizin şimalında Sina yarımadasındakı dağın adıdır. Dini rəvayətə görə, Musa peyğəmbər Misir fironlarının təqibindən qaçıb səkkiz il qürbətdə qalandan sonra qadını və iki uşağı ilə yenidən Misrə qayıdarkən Turi-Sinada borana düşür. Ocaq qalamaq üçün ətrafı gəzərkən bir az aralıda bir ağacdan parlaq nur ucaldığını görür və ona tərəf gedir. Bu zaman ağacdan səs gəlir: "Musa, mən dünyaları yaradan tanrıyam". Dəhşətə gələn Musa huşunu itirir.

Saib də bu beytdə həman hadisəyə işarə edərək demək istəyir ki, bu aləm Allahın hüsnünün pərdəsidir, kim o pərdəni qaldıra bilsə, Allahı hər yerdə görə bilər.

*– Köksüm dağını gənci-Firiduna verməərəm,*
*Üryan tənimi ətləsi-gərduna verməərəm.*

**Firidun** – İranın əfsanəvi şahlarından Cəmşidin nəvəsidir. O, zülmkar padşah Zöhhakı dəmirçi Gavənin köməyi ilə öldürüb hakimiyyəti öz əlinə almışdır.

Saibin bu beytinin mənası belədir:

Sinəmdəki eşqin yaraları mənim üçün Firidun şahın xəzinəsindən qiymətli, üryan gəzməyim zəmanənin ətləs libasını geyməkdən yaxşıdır.

*– Zərdən əzizdi zər kimi olmuş üzüm mənə,*
*Bu künci mən ki, dövləti-Qaruna verməərəm.*

**Qarun** Musa peyğəmbərin zamanında yaşamış çox dövlətli bir adam olmuşdur. Qarun Musa peyğəmbərin ondan tələb etdiyi dini vergini ödəmə-

diyi üçün peyğəmbər onu qarğımışdır. Rəvayətə görə, guya ondan sonra Qarunun bütün dövləti yerə batmışdır.

Saib bu beytində bir küncə çəkilib tənha qalmasını Qarunun dövlətindən, həsrətdən saralmış üzünü qızıldan qiymətli hesab edir.

*- Mişkidən bilmək olar ki, bu Xütən ahusudur,*
*Yun libasda dolanan kəslər ilə ülfət elə.*

Sufilər bu dünyada özlərinə fiziki əziyyət vermək üçün yalxı bədənlərinə qaba yundan toxunmuş köynək geyərdilər. Saib deyir ki, Xütən ceyranını onun göbəyindən hazırlanan ətirdən tanımaq olar. Bu yun paltar geyənlərin kimliyi onların libasından bəllidir, onlarla dostluq etmək lazımdır.

*- Vəqf olan yerdə görübsənmi könüllər şad ola?*
*Xeyri yoxdu sən üçün, bil, o məkanın, getmə.*

**Vəqf torpaqları** – sahibi olmayan yerlər. Müsəlman ölkələrində belə yerlər məscidin, dini dairələrin, bəzən də dövlətin və ya sarayın ixtiyarında olur. Bu torpaqlardan gələn gəlirlər haman idarələrin xeyrinə toplanır. Ona görə də vəqf yerlərində işləyənlər başqalarından daha çox istismar olunurlar. Saib də bu məsələyə toxunur və oxucusuna belə yerlərə getməməyi məsləhət görür.

*- Zəifin gözdən axan yaşlarına hörmət elə,*
*Qarının təndiri tufan salacaq Şərqə yenə.*

**Kufə qarısı** - Nuh peyğəmbərin dövründə yaşamış bir qadındır. Rəvayətə görə, Nuh dövründə baş vermiş tufan onun təndirindən başlamışdır. Saib deyir ki, zəiflərin göz yaşları qarının təndiri kimidir, ona hörmətlə yanaşmaq lazımdır. Yoxsa bu göz yaşları bir gün tufan qopara bilər.

*- Onun əliylə bu ölkə büründü al qumaşa,*
*Çaharbağ oldu gülüstan, o verdi fərmanı.*

Birinci Şah Abbas İranın paytaxtını İsfahan şəhərinə köçürəndən sonra burada böyük abadlıq işləri aparır. Ölkənin müxtəlif yerlərindən, xüsusən Təbrizdən gətirilən sənətkarlar İsfahanda gözəl sənət nümunəsi olan binalar, saraylar, məscidlər, karvansaralar və s. tikirlər. Onlardan biri də incə zövq ilə salınmış Çaharbağdır ki, Saib Şah Abbasa həsr etdiyi qəsidəsində onu tərif edir.



# MÜNDƏRİCAT

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səhifələyicisi: *Rəvan Mürsəlov*

Korrektor: *Elmira Teymurova*

Yığılmağa verilmişdir 01.08.2004. Çapa imzalanmışdır 15.11.2004.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 16. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 171.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.

**000009**